# AZƏRBAYCAN MƏKTƏBİ

Elmi-nəzəri, pedaqoji jurnal
1924-cü ildən nəşr olunur.

Azərbaycan Respublikası
Təhsil Nazirliyinin
5 may 1996-cı il tarixli əmri ilə
Nizamnaməsi təsdiq edilmiş,
Ədliyyə Nazirliyində dövlət
qeydiyyatına alınmışdır.
Qeydiyyat № 11/3165


"Azərbaycan məktəbi" Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin təsis etdiyi akademik jurnaldır. Jurnal aşağıdakı tədqiqat sahələri üzrə orijinal məqalələr dərc edir: təhsil idarəçiliyi; təhsil fəlsəfəsi və təhsil nəzəriyyəsi; təhsil siyasəti; kurikulum; təhsil texnologiyaları; pedaqogika; təhsilin sosiologiyası; təhsil tarixi; xüsusi təhsil; müəllim hazırlığı; qiymətləndirmə və s. Jurnalda, həmçinin təhsillə bağlı yerli və xarici nəşriyyatlarda çap olunan kitablar haqqında icmallara yer verilir.
"Azərbaycan məktəbi" ildə dörd dəfə (rüblük) nəşr olunur.
Jurnal Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının tövsiyə etdiyi dövri elmi nəşrlər sırasındadır.


Redaksiyanın ünvanı: Bakı şəhəri, Afiyəddin Cəlilov küçəsi, 86
Azərbaycan Respublikasının Təhsil İnstitutunun binası.
Tel.: + 994 12 490 4056; 490 4057; 490 4058



ISSN 0134-3289 (Print)
ISSN 2617-8060 (Online)



http://www.as-journal.edu.az
E-mail: editor@as-journal.edu.az; info@as-journal.edu.az



# Azerbaijan Journal of Educational Studies

Established in 1924,
is an academic journal
published quarterly by the
Ministry of Science and
Education of the Republic of
Azerbaijan.


Azerbaijan Journal of Educational Studies is an academic journal founded by the Ministry of Science and Education of the Republic of Azerbaijan. The journal publishes original articles in the following areas of research: education management; educational philosophy and educational theory; education policy; curriculum; educational technologies; pedagogy; sociology of education; history of education; special education; teacher training; assessment, etc. The journal also includes reviews of books on education published in local and foreign publications. Azerbaijan Journal of Educational Studies is published four times per year. The journal is among the publications recommended by the Supreme Attestation Commission under the President of the Republic of Azerbaijan.


Adress: 86, Afiyaddin Jalilov st., Baku, Azerbaijan
Tel: + 994 12 490 4056; 490 4057; 490 4058

**Təsisçi** AZƏRBAYCAN RESPUBLİKASI ELM VƏ TƏHSİL NAZİRLİYİ

**Baş redaktor** Arzu Soltan
**Baş redaktorun müavini** Nəsrəddin Musayev
**Məsul katib** Tariyel Süleymanov

**Redaksiya heyəti**
Könül Abaslı (Azərbaycan Respublikasının Təhsil İnstitutu)
Ülkər Babayeva (Azərbaycan Respublikasının Təhsil İnstitutu)
İlham Cavadov (Azərbaycan Respublikasının Təhsil İnstitutu)
İntiqam Cəbrayılov (Azərbaycan Respublikasının Təhsil İnstitutu)
Yalçın İslamzadə (Oxbridge Academy, Azərbaycan)
Müseyib İlyasov (Azərbaycan Dövlət Pedaqoji Universiteti)
Rza Məmmədov (Naxçıvan Dövlət Universiteti, Azərbaycan)
Ülviyyə Mikayılova (ADA Universiteti, Azərbaycan)
Anar Mustafazadə (Bakı Dövlət Universiteti, Azərbaycan)
Elza Səmədli (Xəzər Universiteti, Azərbaycan)
Qalib Şərifov (Azərbaycan Dövlət Pedaqoji Universiteti)

**Redaksiya şurası**
Aziz Sancar (Çapel-Hill Şimali Karolina Universiteti, ABŞ)
Ahmet Aytaç (Aydın Adnan Menderes Universiteti, Türkiyə)
Alla Sidenko (Təbiət Elmləri Akademiyası, RF)
Amanda Taylor (Təhsil Tədqiqatları Milli Fondu, Böyük Britaniya)
Ana Kirvalidze (İlia Dövlət Universiteti, Gürcüstan)
Cəfər Cəfərov (Azərbaycan Dövlət Pedaqoji Universiteti)
Cihangir Doğan (Mərmərə Universiteti, Türkiyə)
Etibar Əliyev (Azərbaycan Milli Elmlər Akademiyası)
Əbülfəz Süleymanlı (Üsküdar Universiteti, Türkiyə)
Ənvər Abbasov (Bakı Slavyan Universiteti, Azərbaycan)
Fərrux Rüstəmov (Azərbaycan Dövlət Pedaqoji Universiteti)
Hikmət Əlizadə (Bakı Dövlət Universiteti, Azərbaycan)
Hümeyir Əhmədov (Azərbaycan Respublikasının Təhsil İnstitutu)
İlham Əhmədov (Azərbaycan Dövlət Pedaqoji Universiteti)
İrfan Erdoğan (İstanbul Universiteti, Türkiyə)
İrina Xarçenko ("Elmi Perspektivlər" Nəşriyyat Qrupu, Ukrayna)
İsa Həbibbəyli (Azərbaycan Milli Elmlər Akademiyası)
Leyla İsmayılova (Çikaqo Universiteti, ABŞ)
Mahmut Çitil (Qazi Universiteti, Türkiyə)
Mauro Mocerino (Kurtin Universiteti, Avstraliya)
Məsud Əfəndiyev («Helmholtz» Elmi-Tədqiqat Mərkəzi, Almaniya)
Natalya Şevçenko (Volqoqrad Dövlət Universiteti, RF)
Nodari Eriaşvili (Dövlət İdarəetmə Universiteti, RF)
Sevinc Məmmədova (Corc Vaşinqton Universiteti, ABŞ)
Səlahəddin Xəlilov (Türkiyə Fəlsəfə Dərnəyi)
Tatyana Ryabova (Rusiya Dövlət Sosial Universiteti, RF)
Tatyana Vasilenko (Moskva Dövlət Pedaqoji Universiteti, RF)
Vaqif Bayramov (Moskva Dövlət Humanitar-İqtisad Universiteti, RF)
Valeriy Kiriçuk (Ukrayna Milli Pedaqoji Elmlər Akademiyası)
Vəfa Kazdal (ADA Universiteti, Azərbaycan)
Yuriy Zinçenko (M.V.Lomonosov adına Moskva Dövlət Universiteti, RF)

**Redaksiya** Ağca Talıbova, Gülşən Hüseynova, Günel Rüstəmova, Sevinc Qarazadə, Zenfira Əlibəyova.

Üzqabığı tərtibatı: Anar Nəsirov

# İÇİNDƏKİLƏR

# CONTENTS




# BAŞ REDAKTORDAN

*Əziz oxucu!*

*“Heydər Əliyev İli”ndəyik.*

*Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 2023-cü ilin “Heydər Əliyev İli” elan edilməsi haqqında Sərəncamında deyilir ki, “2023-cü il mayın 10-da Azərbaycan xalqının Ümummilli Lideri, müstəqil Azərbaycan dövlətinin qurucusu, görkəmli siyasi və dövlət xadimi Heydər Əliyevin anadan olmasının 100 ili tamam olur.*

*Heydər Əliyev öz xalqını zamanın mürəkkəb tarixi-siyasi sınaqlarından uğurla çıxarmış və ardıcıl mübarizə apararaq onu müstəqilliyə qovuşdurmuş qüdrətli şəxsiyyətdir. Azərbaycan xalqı yeni əsrə və yeni minilliyə məhz Heydər Əliyev zəkasının işığında qədəm qoymuşdur. Davamlı yüksəliş yolunda inamla irəliləyən müasir Azərbaycan Heydər Əliyevin həyat amalının təntənəsidir”.*

*Ulu Öndər də gələcəyimizin təhsillə bağlı olduğunu deyirdi: “Azərbaycan xalqının gələcəyi, müstəqil Azərbaycanın gələcəyi gənclərin bu gün aldıqları bilik, təhsil və tərbiyədən asılıdır”.*

*Azərbaycan məktəbi ilə gələcəyə Heydər Əliyev zəkasının işığında qədəm qoyanlardan olun!*

# AZƏRBAYCAN TARİXİNİN HEYDƏR ƏLİYEV MƏRHƏLƏSİ: TARİXİ İRSƏ KONSEPTUAL BAXIŞ

**İNTİQAM CƏBRAYILOV**
Pedaqogika elmləri doktoru, professor, ARTİ-nin Təhsilin nəzəriyyəsi və tarixi şöbəsinin müdiri. E-mail: intiqamcebrayilov@gmail.com
https://orcid.org/0000-0003-2437-5926

**Məqaləyə istinad:**
Cəbrayılov İ. (2023). Azərbaycan tarixinin Heydər Əliyev mərhələsi: tarixi irsə konseptual baxış. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 9–17

**Məqalə tarixçəsi**
Göndərilib: 10.01.2023
Qəbul edilib: 31.01.2023

**ANNOTASİYA**

Məqalədə Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin siyasi və dövlət xadimi kimi fəaliyyətindən bəhs edilir. Heydər Əliyevin həyatı və fəaliyyəti Azərbaycan tarixinin xüsusi bir mərhələsi kimi təhlil edilir. Araşdırmalar göstərir ki, Heydər Əliyev, həqiqətən, müstəqil Azərbaycan Respublikasının qurucusu, memarı olub. Azərbaycan Respublikasında hüquqi dövlət quruculuğu, azərbaycançılıq ideologiyasının formalaşdırılması Heydər Əliyevin adı ilə bağlıdır. Məqalədə Heydər Əliyev şəxsiyyəti haqqında dünyanın tanınmış simalarının fikirləri də verilir. Gənclərin vətənpərvərlik tərbiyəsinin mühüm mənbəyi olan Heydər Əliyev irsinin davamlı olaraq öyrənilməsi, tədqiqi tövsiyə olunur.

**Açar sözlər:** Xalq, dövlət, Azərbaycan, tarix, müstəqillik, şəxsiyyət, təhsil, neft strategiyası, iqtisadiyyat, vətəndaş, insan kapitalı.

# HEYDAR ALIYEV STAGE OF THE HISTORY OF AZERBAIJAN: A CONCEPTUAL VIEW OF THE HISTORICAL HERITAGE

**INTIGAM JABRAYILOV**
Doctor of pedagogical sciences, professor, Head of the Department of Theory and History of Education of the Institute of Education of the Republic of Azerbaijan. E-mail: intiqamcebrayilov@gmail.com
https://orcid.org/0000-0003-2437-5926

**To cite this article:**
Jabrayilov I. (2023). Heydar Aliyev stage of the history of Azerbaijan: a conceptual view of the historical heritage. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 9–17

**ABSTRACT**

The article talks about the activities of the National Leader of the Azerbaijani people, Heydar Aliyev, as a politican and statesman. The life and activities of Heydar Aliyev are analyzed as a special stage of the history of Azerbaijan. Research shows that Heydar Aliyev was the founder and architect of the independent Republic of Azerbaijan. Legal state building in the Republic of Azerbaijan, the formation of the ideology of Azerbaijaniism is connected with the name of Heydar Aliyev. The article also gives the opinions of well-known figures of the world about the personality of Heydar Aliyev. Continuous study and research of Heydar Aliyev's legacy, which is an important source for patriotic education of young people, is recommended.

**Keywords:** People, state, Azerbaijan, history, independence, identity, education, oil strategy, economy, citizen, human capital.

**Article history**
Received: 10.01.2023
Accepted: 31.01.2023

Hər bir xalqın böyüklüyü, tarixinin möhtəşəmliyi onun yetişdirdiyi görkəmli şəxsiyyətlərin həyatı, fəaliyyəti ilə bilavasitə bağlıdır. Elə böyük şəxsiyyətlər var ki, xalq onları özünün idealı, əbədiyaşar qəhrəmanı, əbədi lideri hesab edir. Belə böyük şəxsiyyətlərdən biri də Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevdir.

Təqdirəlayiq haldır ki, ölkə Prezidenti cənab İlham Əliyev Azərbaycan Respublikasında 2023-cü ilin "Heydər Əliyev ili" elan edilməsi haqqında sərəncam imzalayıb[1]. Sərəncamda doğru olaraq Ulu Öndərin həyat və fəaliyyəti, Azərbaycan dövlətçiliyinin inkişaf etdirilməsi sahəsində xidmətləri göstərilib. Heydər Əliyev, həqiqətən, dövlətçilik tariximizdə dərin, silinməz izlər qoyub.

Naxçıvanda əvvəlcə orta məktəbdə, pedaqoji texnikumda təhsil alan Heydər Əliyev sonralar Azərbaycan Sənaye İnstitutunda (indiki Azərbaycan Neft və Sənaye Universiteti), Azərbaycan Dövlət Universitetində (indiki Bakı Dövlət Universiteti), SRRİ Dövlət Təhlükəsizlik Komitəsinin Leninqraddakı (indiki Sankt-Peterburq) Rəhbər Kadrların Hazırlığı Məktəbində təhsil alıb.

Araşdırmalar göstərir ki, Ulu Öndərin fenomen şəxsiyyət kimi formalaşması aldığı mükəmməl təhsillə, eyni zamanda ailə mühiti, özünün daim çalışqan, zəhmətkeş, dərin zəka sahibi kimi həmişə axtarışda olması, vətənpərvərlik, vətəndaşlıq keyfiyyətləri ilə sıx bağlı olub. Onun həyatı bütövlükdə məktəbdir. Bu həyat məktəbi hər bir Azərbaycan vətəndaşı üçün həmişə örnək və böyüyən nəsillərə nümunə olaraq qalacaqdır. Hələ uşaqlıq və gənclik illərindən Heydər Əliyevin intellekti, mənəvi-əxlaqi keyfiyyətləri, liderlik xüsusiyyətləri ona böyük rəğbət yaradıb.

Onun köməyi ilə neçə-neçə azərbaycanlı Sovet dövründə mərkəzi hökumətin rəhbərlərinin qəzəbindən xilas olub, azərbaycanlıların əleyhinə hazırlanan qərar layihələri, yaxud qərarlar ləğv edilib. Məsələn, İkinci Dünya müharibəsində Mehdi Hüseynzadənin qəhrəmanlığını, onun partizan dəstələrində düşmənə qarşı igidliklə döyüşdüyünü məhz Heydər Əliyev üzə çıxarıb, əldə etdiyi hərbi arxiv sənədlərini diqqətlə araşdıraraq onun döyüş yolunun əsl qəhrəmanlara xas olduğunu sübut edib. Mehdi Hüseynzadənin SSRİ-də ən yüksək ada – Sovet İttifaqı Qəhrəmanı adına layiq görülməsi, ona həsr olunan "Uzaq sahillərdə" əsərinin tarixi materiallar əsasında yazılması və eyniadlı filmin çəkilməsi də Ulu Öndərin təşəbbüsü ilə olub. Sonrakı illərdə Azərbaycanın milli düşüncəli tanınmış ziyalılarının, o cümlədən Bəxtiyar Vahabzadə, Xəlil Rza Ulutürk və başqalarının qorunmasında, onlar üçün daha geniş yaradıcı mühitin formalaşdırılmasında böyük xidmətləri olub.

Heydər Əliyev yaşadığı dövrün, zəmanəsinin görkəmli siyasi, dövlət xadimi olmaqla yanaşı, həm də bu günün və gələcəyin böyük şəxsiyyətidir. Onun ideyaları hər zaman aktualdır. Bu ideyalar həm də Azərbaycanın müstəqilliyinin, müstəqil dövlət kimi inkişafının təməl prinsipləridir. Həmin prinsiplər mahiyyətcə Azərbaycançılıq məfkurəsində ehtiva olunmuşdur. O bütün həyatı boyu azərbaycançılıq amalı ilə yaşayıb və bütün fəaliyyəti bu məfkurə üzərində köklənib. Ulu Öndər azərbaycançılığı milli ideologiyamız, milli düşüncə sistemimiz kimi yüksək qiymətləndirir və onun birləşdirici, inkişafetdirici gücünün nə qədər böyük olduğunu əsaslandırırdı. Azərbaycanın milli-mənəvi dəyərləri, dövlətçiliyi, adət-ənənələri, dilimizə, tariximizə, mədəniyyətimizə olan münasibət məhz azərbaycançılıq ideologiyasının məzmun komponentləri kimi birləşir və vəhdət yaradır. Bu birləşdirici funksiya eyni zamanda xalqın birliyinin daha möhkəm təminatına, onun inkişafının davamlı, sistemli olmasına zəmin yaradır.

Heydər Əliyev 1969-cu ildə Azərbaycana rəhbər təyin olunarkən milli kadrların yetişdirilməsini planlı şəkildə həyata keçirməyə başlayıb. 1971-ci ildə Cəmşid Naxçıvanski adına hərbi məktəb (hərbi lisey) açıb və gənc azərbaycanlı zabitlərin hazırlanması üçün geniş imkanlar yaradıb. O zaman SSRİ-nin mövcudluğu şəraitində Azərbaycanda – Sovet İttifaqının tərkibində olan milli respublikada belə bir

[1] https://president.az/az/articles/view/57413

məktəbin açılması çətin olsa da Ulu Öndərimiz SSRİ rəhbərliyini razı salıb. Bu o zaman Azərbaycanın gələcəyi üçün atılan qətiyyətli bir addım idi. Belə ki, 1991-ci ildə Azərbaycan öz dövlət müstəqilliyini bərpa edəndən sonra milli ordu quruculuğunda bu kadrlar böyük rol oynadılar. Əks halda, milli ordu quruculuğunda və müstəqilliyimizin qorunmasında daha böyük çətinliklər yarana bilərdi.

Heydər Əliyevin 1970-ci illərdə istedadlı azərbaycanlı gənclərin Azərbaycandan kənarda, başqa respublikalarda, xüsusilə Rusiyanın tanınmış ali məktəblərində təhsil almağa göndərmək ənənələrinin əsasını qoyması Azərbaycançılığa, Vətənə, millətə xidmətinin yeni bir nümunəsi idi. Heydər Əliyevin azərbaycanlıların xaricdə təhsil alması siyasətini dəstəkləməsi ölkəmiz üçün çox əhəmiyyətli idi. Xaricdə ali təhsil alanlar beynəlxalq təcrübə ilə daha yaxından tanış olur və ölkəmizə qayıdarkən xarici təcrübəni, yeni texnologiyaları yerli şəraitə daha rahat şəkildə uyğunlaşdırıb tətbiq edirdilər. İstehsalın yeni texnologiya əsasında təşkili isə istehsal sahəsində daha işlək, çevik mexanizmlərin formalaşdırılmasına şərait yaradırdı. Təsadüfi deyil ki, Ulu Öndərin Azərbaycana rəhbərliyinin birinci dövründə (1969-1982) ölkəmizin iqtisadi artımı, istehsal səviyyəsi və gücündə köklü irəliləyişlər olub. Həmin illərdə Azərbaycan Sovet İttifaqına daxil olan respublikalar arasında həmişə birinci yerdə olub və nümunəvi respublika kimi tanınıb.

1970-ci illərdə Azərbaycanda şəhərsalma, sənaye müəssisələrinin genişləndirilməsi, tikinti, yolların çəkilməsi və digər sahələrdə yeni infrastrukturun yaradılması ölkə həyatında böyük canlanma yaratdı. Respublikamız təkcə kənd təsərrüfatı ilə deyil, həm də sənayenin inkişafı ilə diqqəti cəlb edirdi.

Ulu Öndərin iqtisadi siyasətində çeviklik, uzaqgörənlik respublikamızın davamlı iqtisadi inkişafında mühüm rol oynayıb. O, müstəqillik illərində də böyük əzmkarlıqla çalışıb, Azərbaycan iqtisadiyyatının yeni tarixi şəraitə – iqtisadi münasibətlər sisteminin kökündən dəyişdiyi bir dövrə uyğun modelini hazırlayıb və tətbiqi üçün geniş imkanlar yaradıb. Ulu Öndərimizin 1994-cü il 20 sentyabrda neft hasilatı üzrə ixtisaslaşan, böyük nüfuza malik dünya dövlətlərini təmsil edən 12 iri neft şirkəti arasında beynəlxalq müqaviləni imzalaması Azərbaycan tarixində mühüm hadisəyə çevrildi. "Əsrin müqaviləsi" adlandırılan bu sənəd əsasında Azərbaycan yeni neft strategiyasını həyata keçirməyə başladı. Xəzər dənizinin Azərbaycan sektorunda yerləşən "Azəri", "Çıraq" və "Günəşli" yataqlarının birgə istismarını nəzərdə tutan bu müqavilənin reallaşdırılması Heydər Əliyevin, həqiqətən, böyük zəka sahibi, görkəmli siyasi və dövlət xadimi olduğunu deməyə əsas verir. Bu müqavilənin həyata keçirilməsi prosesində Azərbaycanın təkcə regionda deyil, bütövlükdə beynəlxalq aləmdə nüfuzu daha da yüksəldi. Xüsusilə, "Əsrin müqaviləsi" üzrə hasil edilən Azərbaycan neftinin Bakı-Tbilisi-Ceyhan əsas ixrac boru kəməri vasitəsi ilə dünya bazarlarına ixrac edilməsi Azərbaycanın beynəlxalq əlaqələrini xeyli möhkəmləndirdi.

Heydər Əliyev iki müxtəlif iqtisadi sistemin mövcud olduğu dövrdə ölkəyə rəhbərlik edib və hər iki dövrdə iqtisadi münasibətlərin real xarakterinə uyğun siyasət yeridib, beləliklə, xalqımızın maddi rifahı təmin olunub, ədalətlilik, bərabərlik prinsipi nəzərə alınıb. Müxtəlif tarixi-iqtisadi şəraitdə, həmçinin siyasi quruluşların fərqli olduğu bir zamanda ölkəyə rəhbərliyi, cəmiyyətin inkişaf mexanizmlərini görməsi, onu hərəkətə gətirməsi və sürətləndirməsi, davamlılığı, dayanıqlığı təmin etməsi Heydər Əliyev fenomeninin xarakterik cizgiləri kimi qeyd edilə bilər.

Heydər Əliyev azadlığı, müstəqilliyi bir dəyər kimi həmişə yüksək qiymətləndirərək xalqımızın milli varlığının qorunması, inkişafı, ərazi bütövlüyünün bərpası üçün daim mübarizə aparmışdır. O, azad, müstəqil respublikanı xalqımızın ən böyük tarixi nailiyyəti sayır və onu qorumağın yollarını göstərirdi. Ulu Öndər deyirdi: "İndi Azərbaycan müstəqil dövlətdir. Müstəqillik Azərbaycan üçün böyük tarixi bir hadisədir, taleyin xalqımıza verdiyi böyük bir fürsətdir. Şübhəsiz ki, biz bununla fəxr etməliyik. Eyni

zamanda bu tarixi nailiyyəti qiymətləndirməliyik, əlimizdə möhkəm saxlamalıyıq”[2]. Heydər Əliyev, ilk növbədə, cəmiyyətdə qayda-qanuna əməl etməyin vacibliyini əsaslandırır, ölkədə hüquqi dövlət quruculuğunu əsas vəzifələrdən hesab edirdi. Hüquqi dövlət quruculuğu isə cəmiyyətdə hüquq münasibətlərindən, hər kəsin hüquq və vəzifələrindən, öz borcunu, öhdəliklərini dərk etməsindən, daşıdığı məsuliyyət hissindən xeyli dərəcədə asılıdır. O, 1995-ci ildə qəbul edilən Konstitusiyadan danışarkən demişdir: “İnsan, vətəndaş hüquqlarının, azadlıqlarının qorunmasına konstitusiyanın çox hissəsi, demək olar ki, üçdə bir hissəsi həsr olunubdur. Bu da təbiidir. Biz keçmişdən, totalitar sistemdən yeni bir sistemə keçirik. Biz demokratiyanı inkişaf etdirməliyik, xalqımızı demokratiya yolu ilə aparmalıyıq, insanların hüquqlarının qorunmasına hər yerdə, hər sahədə təmin olunması üçün əsaslar yaratmalıyıq. Bütün bu əsasları da yeni qəbul olunmuş konstitusiya verir və bütün təminatları biz konstitusiyanın maddələrindən almışıq”[3].

Konstitusiya ölkədə hakimiyyət bölgüsünü demokratik prinsiplərlə əsaslandırdı və təsbit etdi. Cəmiyyətdə demokratik dəyərlərin qorunması, inkişafı, o cümlədən vətəndaş cəmiyyəti institutlarının genişləndirilməsi üçün əlverişli imkanlar yaradıldı. Azərbaycanda ölüm hökmünün, mətbuatda senzuranın ləğv edilməsi söz və fikir azadlığının genişləndirilməsi üçün imkanları artırdı. Bütün bunlar Heydər Əliyevin təşəbbüsü, iştirakı və rəhbərliyi altında həyata keçirilirdi.

Ümummilli lider Heydər Əliyevin siyasi və dövlət xadimi kimi fəaliyyətinin məzmunu, həqiqətən, gələcəyin bir yol xəritəsi, strategiyası kimi əhəmiyyətlidir. O, Azərbaycana rəhbərliyinin birinci dövründə xalqın milli dirçəlişinə, oyanışına çalışırdısa, sonrakı dövrdə müstəqilliyi qorumağı, inkişaf etdirməyi, möhkəmləndirməyi strateji hədəf kimi qiymətləndirir və tam əminliklə deyirdi ki, Azərbaycanın müstəqilliyi əbədidir, dönməzdir, sarsılmazdır. Azərbaycanın müstəqilliyinin qorunmasında gənclərin üzərinə düşən böyük məsuliyyətdən bəhs edərkən onları daim çalışmağa, təhsil almağa, vətənpərvər bir insan kimi yetişməyə səsləyirdi. Ulu Öndər “Vətəndaş” sözünə adi söz kimi baxmamağı, onun mahiyyətini dərk edərək məsuliyyətini daşımağı tövsiyə edərək deyirdi: “Vətəndaş” sözü böyük sözdür, müqəddəs sözdür. “Vətəndaş” sözü o deməkdir ki, hər bir vətəndaş öz vətəninə sadiq olmalıdır, onu göz bəbəyi kimi qorumalıdır və vətəninin uğrunda, torpağının uğrunda, anasının, atasının müdafiəsi yolunda şəhid olmağa hazır olmalıdır. “Vətəndaş” sözünün mənası, bax budur!”[4].

Məlumdur ki, hələ 1987-1988-ci illərdən ermənilərin təxribatları regionda münaqişə vəziyyəti yaradır, onların Azərbaycan torpaqlarına ərazi iddiaları açıq şəkildə səsləndirilirdi. 1991-ci ildə müstəqilliyini elan etmiş Azərbaycanda iqtisadi-siyasi vəziyyət olduqca mürəkkəb idi. Qərbi Azərbaycan ərazisindən ermənilərin etnik təmizləmə siyasəti nəticəsində soydaşlarımızın deportasiyası, eyni zamanda, azərbaycanlıların Qarabağdan didərgin salınması ölkəmizdə 1 milyondan çox qaçqın və məcburi köçkünün yaranmasına səbəb oldu. Ölkədəki daxili gərginlik vəziyyəti daha da ağırlaşdırırdı.

1993-cü ilin yayında xalqın təkidli tələbi ilə hakimiyyətə gələn Heydər Əliyev Azərbaycanı parçalanma, dağılma təhlükəsindən xilas etdi. Ölkədə tədricən iqtisadi, siyasi sabitlik yarandı. Heydər Əliyev Ermənistanın Azərbaycana qarşı təcavüzünü aradan qaldırmaq, itirilən ərazilərin geri qaytarılması üçün həm Ermənistanla, həm də münaqişənin nizamlanmasında məsuliyyət daşıyan böyük dövlətlərin, beynəlxalq təşkilatların rəhbərləri ilə birbaşa danışıqlar aparır, siyasi iradə nümayiş etdirirdi. Dövlət başçılarının

[2] Azərbaycan Respublikası Elmlər Akademiyasında ziyalılarla görüşdə çıxış. 21 sentyabr 1993-cü il.

[3] Azərbaycan Respublikası Milli Məclisinin ilk iclasında nitq. 24 noyabr 1995.

[4] Azərbaycanın Milli Qəhrəmanları və Vətənimizin azadlığı uğrunda şəhidlərin ailə üzvləri ilə görüşdə çıxış. 27 dekabr 1993.

zirvə görüşlərində (sammitlərdə), beynəlxalq təşkilatların keçirdiyi tədbirlərdə Heydər Əliyev beynəlxalq hüquqa əsaslanan qətiyyətli, cəsarətli, inamlı çıxışları ilə hər dəfə qarşı tərəfi onunla hesablaşmağa məcbur edir və beləliklə, Azərbaycanın haqq səsini dünyaya bəyan edən sənədlərin təsdiq edilməsinə nail olurdu.

Haqq işi uğrunda ardıcıl, məqsədyönlü mübarizə təbii ki, öz bəhrəsini verməli idi. Ulu Öndər müxtəlif tədbirlərdə çıxışlarında, məcburi köçkünlərlə görüşlərində itirilən torpaqlarımıza geri dönəcəyimizi həmişə əminliklə vurğulayır, beləliklə, xalqımızın mübarizə əzmi daha da güclənirdi. Ümummilli liderimiz qətiyyətlə deyirdi: "İnanıram ki, Ermənistan silahlı qüvvələri tərəfindən işğal olunmuş Azərbaycan torpaqları azad ediləcəkdir və yerindən-yurdundan didərgin düşmüş soydaşlarımız öz doğma torpaqlarına qayıdacaqlar, Azərbaycanın ərazi bütövlüyü bərpa ediləcəkdir, Azərbaycanın dövlət sərhədlərinin toxunulmazlığı təmin olunacaqdır"[5]. 2020-ci il 27 sentyabrdan 10 noyabradək davam edən Vətən müharibəsində (II Qarabağ müharibəsi) Azərbaycanın Böyük Zəfərini bu qətiyyətin məntiqi nəticəsi adlandırmaq olar. Bu zəfər həm də Heydər Əliyev ideyalarının təntənəsi, onun haqq, ədalət uğrunda savaşının qələbəsi idi. Məhz Heydər Əliyevin dövlətçilik siyasətinin davam etdirilməsi düşmən üzərində parlaq qələbənin təmin olunmasında mühüm rol oynadı. Azərbaycanın zəfəri həm də gəncliyin qələbəsi idi. Son 30 ildə Heydər Əliyev ideyaları əsasında böyüyən, təhsil və tərbiyə alan gənclərin sayəsində qələbə bayrağı azad olunan torpaqlarda dalğalandı.

Heydər Əliyev Azərbaycan elminin və təhsilinin, ədəbiyyatının və mədəniyyətinin inkişafına xüsusi diqqət yetirirdi. Bilavasitə onun rəhbərliyi ilə elm və təhsil sahəsində məqsədyönlü islahatlar keçirilir, dünyanın qabaqcıl təcrübəsinə uyğun yeni texnologiyaların tətbiqi dəstəklənir, cəmiyyətin siyasi, iqtisadi, sosial və mədəni həyatının əsası kimi elm və təhsilin üstün rolu əsaslandırılırdı. Ulu Öndərin bu baxımdan aşağıdakı fikirləri çox əhəmiyyətlidir: "Təhsil sistemi Azərbaycanın gələcəyini təmin edən bir sistemdir. Hər bir millətin, hər bir ölkənin gələcəyi gənclərdir. Biz gənclərimizi nə qədər yüksək təhsilli etsək, həqiqi yüksək təhsilli etsək, onların müəyyən ixtisaslara mükəmməl yiyələnməsinə şərait yarada bilsək, müstəqil Azərbaycanın gələcəyi və demək, müstəqil Azərbaycanın iqtisadiyyatının inkişafı, elminin inkişafı, təhsilinin inkişafı, insanların rifah halı o qədər də yaxşı olacaqdır"[6].

Ümummilli lider cəmiyyətin inkişafında insan kapitalının rolunun böyük olduğunu qeyd edirdi. İnsan kapitalı isə elmi biliklərə dərindən yiyələnən, dünyanın müasir çağırışlarına cavab verən, mükəmməl təhsil alan, səriştəli mütəxəssislər kimi yetişən kadrlar formalaşdıra bilərlər. İnsan kapitalı ilə bağlı digər bir cəhət ondan ibarətdir ki, bu işdə kadrların mənəvi keyfiyyətlərinə xüsusi diqqət yetirilməsi tələb olunur. Ona görə də Ulu Öndər insan şəxsiyyətinin mənəvi xüsusiyyətlərinə də böyük önəm verirdi. Çünki mənəviyyat olmayan yerdə heç bir uğur əldə etmək olmaz. Mənəviyyatın əsasında dəyərlər dayanır. Qeyd etdiyimiz bu məsələlərin hər biri ilə bağlı onun irsində zəngin fikirlər, konseptual ideyalar vardır. Ona görə də Heydər Əliyevin irsi ideyalar qaynağı, mükəmməl konsepsiya kimi çox dəyərlidir. Burada həyatın bütün sahələrinə aid qiymətli məlumatlar vardır. Onun irsi müxtəlif elm sahələri üzrə araşdırma aparan tədqiqatçıların tədqiqat obyekti, predmeti ola bilər.

Heydər Əliyev şəxsiyyəti hər zaman dünyanın tanınan simalarının, dövlət başçılarının diqqətini cəlb edib. Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğan Ulu Öndər haqqında belə deyib: "Mərhum Heydər Əliyev Azərbaycanın xoşbəxtliyi

[5] Azərbaycan Respublikasının Milli bayramı – Respublika günü münasibəti ilə təntənəli mərasimdə nitq. Gülüstan sarayı. 27 may 2002-ci il.

[6] Bakının Nəsimi rayonu ərazisində (Səməd Vurğun küçəsində) – paytaxtda ilk özəl ümumtəhsil məktəb kompleksinin istifadəyə verilməsi mərasimində nitq. 1 sentyabr 2001-ci il.

və firavanlığı, bölgədə və dünyada sülh naminə göstərdiyi fövqəladə xidmətlərlə türk və dünya tarixində şərəfli yer tutub”.

Türkiyə-Azərbaycan dostluğunu çox gözəl ifadə edən “Bir millət, iki dövlət” ifadəsi də ona məxsusdur. Biz çalışmalıyıq ki, bu hikmətli deyimin ifadə etdiyi amal bundan sonra da davam etsin. Böyük Heydər Əliyevin ruhu şad olsun deyə, biz türk dünyasının qardaşlıq münasibətlərini və birliyini qoruyub möhkəmləndirməyə çalışmalıyıq”[7]. R.T.Ərdoğanın bu fikirləri türk dünyasının böyük oğlu Heydər Əliyev şəxsiyyətinə, onun gördüyü işlərə, tarixi xidmətlərinə verilən yüksək dəyər kimi çox əhəmiyyətlidir.

BMT-nin sabiq Baş katibi Butros Qalinin fikirlərinə diqqət edək: “Mən Heydər Əliyevə böyük hörmət və ehtiram bəsləyirəm, onun siyasi fəaliyyətini və məharətini, uzaqgörənliyini yüksək qiymətləndirirəm”[8]. Bu fikirdə də tarixi şəxsiyyəti səciyyələndirən böyük məna yükü aydın görünür. Görkəmli qazax yazıçısı, Qazaxıstanın YUNESKO-dakı nümayəndəsi olmuş (2002) Oljas Süleymenovun da Ulu Öndərimiz haqqında fikirləri ibrətamizdir: “Vaxt gələcək, Şumer dövründən tutmuş zəmanəmizədək türklərin tarixi- böyük hadisələrə və Bilqamıs (“Müdrik qəhrəman”), Bilgə xaqan (“Müdrik xaqan”), İltəriş (“Torpaqları birləşdirən”), Atatürk.... kimi dahi adlara söykənən tarixi yazılacaqdır. Bizim zəmanəmiz Ustad titullu layiqli adlarla təmsil ediləcəkdir. Heydər Əlirza oğlu Əliyev belə Ustadların ən birincilərindəndir”[9].

Ulu Öndərin həyatı, siyasi və dövlət xadimi kimi fəaliyyəti ilə bağlı ciddi elmi araşdırmalar da aparılıb, müxtəlif ixtisaslar üzrə dissertasiyalar yazılıb. Məsələn, Fərid Baxşəliyev (7), Samir Pişnamazzadə (21), Leyla Hüseynova (15), Lalə Allahverdiyeva (1), Qadir Əkbərov (13), Rimunə Hüseynova (16), Tahir Paşazadə (20), Rəhman Hacıyev (14), Selahettin Dikmen (9), Salatın Əhmədova (12), Oqtay Rzayev (22), Ədalət Qasımov (17), Mehman Şabanov (23) və başqalarının dissertasiya mövzuları maraq doğurur.

Təhsil müəssisələrində ümummilli liderimizin həyat və fəaliyyətinin, irsinin dərindən öyrənilməsi üçün imkanlar genişdir. Təhsilin müxtəlif pillə və səviyyələri üzrə ictimai-humanitar fənlərin məzmununda Ulu Öndərin ideyaları öz əksini tapıb. Xüsusilə Azərbaycan tarixinin tədrisində Heydər Əliyev irsi zəngin mənbə rolunu oynayır. Məsələn, 5-ci sinifdə Azərbaycan tarixi fənninin tədrisində “Azərbaycan müasir mərhələdə” bölməsi Ulu Öndərin irsinin öyrənilməsi üçün geniş imkanlar yaradır. Bu bölmədə “Müstəqil Azərbaycanın qurucusu” (s.195-199), “Ulu Öndərin yolu ilə” (s.200-203) mövzuları Heydər Əliyev şəxsiyyətinin xarakteristikasını, onun Azərbaycanın dövlətçilik tarixində yeri və rolunu öyrənmək üçün şagirdlərin yaş və inkişaf xüsusiyyətlərinə uyğun əhəmiyyətli mənbədir. 9-cu sinif Azərbaycan tarixinin tədrisində ümummilli liderimizin görkəmli siyasi və dövlət xadimi kimi fəaliyyətini öyrənmək imkanları daha genişdir. “1970-80-ci illərdə sosial-iqtisadi yüksəliş” (s.150-153), “1970-80-ci illərdə mədəniyyətin inkişafı” (s.161-164), “Dövlət müstəqilliyinin bərpası” (s.165-169), “Qurtuluş hərəkatı” (s.169-170), “Qarabağ müharibəsi” (s.171-174), “Azərbaycan Respublikasının beynəlxalq və regional təşkilatlara üzv olması” (s.174-176), “Dövlət müstəqilliyinin möhkəmləndirilməsi” (s.176-180), “Azərbaycan Respublikasının inkişafında yeni mərhələ” (s.181-185) və “Mədəniyyətin inkişafında yeni uğurlar” (s.188- 191) mövzuları Heydər Əliyev irsinin sistemli şəkildə dərindən öyrənilməsinə xidmət edir.

10-11-ci siniflərdə tədrisin təmayüllər əsasında aparılması Azərbaycan tarixinin tədrisi imkanlarını xeyli genişləndirir. Tarixin tədrisinin konsentrik prinsipinə uyğun olaraq aşağı siniflərdə öyrənilmiş hadisə və proseslərin yenidən daha dərin təhlil və ümumiləşdirmələr əsasında öyrənilməsi üçün əlverişli zəmin yaranır. 11-ci sinfin Azərbaycan tarixində Ulu Öndərin irsinin öyrənilməsinə bilavasitə xidmət edən mövzular, əsasən, bunlardır: “İdarəçiliyin

[7] https://lib.aliyev-heritage.org/az/8845617.html

[8] https://aztc.gov.az/az/posts/id:1320

[9] https://lib.aliyev-heritage.org/az/40892278.html

möhkəmləndirilməsi. 1970-80-ci illərdə sosial-iqtisadi uğurlar" (s.144-147), "Xalq hərəkatı" (s.151-155), "XX əsrin 40-80-ci illərində mədəniyyət" (s.160-164), "Dövlət müstəqilliyinin bərpası" (s.166-169), "Birinci Qarabağ müharibəsi" (s.170-173), "Milli Qurtuluş" (s.181-183), "Hüquqi islahatlar və demokratik dövlət quruculuğu" (s.184-186), "XX əsrin 90-cı illərində həyata keçirilən sosial-iqtisadi islahatlar" (s.187-190), "Azərbaycan Respublikasının xarici siyasəti" (s.191-194) və "Yeni minilliyə yeni liderlə" (s.193-198). Təcrübə göstərir ki, bu yanaşmalar Vətən tarixinin, o cümlədən Azərbaycan tarixinin Heydər Əliyev mərhələsinin dərindən mənimsənilməsinə ciddi təsir göstərir.

Ümumtəhsil məktəblərində, ali və orta ixtisas təhsili müəssisələrində Heydər Əliyev irsinə müraciət olunarkən, ilk növbədə onun milli ruhlu və bəşəri dəyərləri yüksək qiymətləndirən böyük tarixi şəxsiyyət olduğu əsaslandırılmalıdır. Onun fəaliyyətində azərbaycançılıq məfkurəsinə söykənən milli dövlətçilik konsepsiyası xüsusi yer tutur. Bu da dövlətimizin və xalqımızın möhkəm təməllər üzərində inkişafına təminat verən müqəddəs ideya qaynağıdır. Ulu Öndərin ictimai-siyasi həyatda Azərbaycan tarixi məsələlərini ön plana çəkməsi, şəxsiyyət, cəmiyyət və dövlətçilik problemlərinə konseptual baxışları həm də nəzəri müddəalar kimi yüksək dəyərləndirilməlidir. Ölkəmizdə Heydər Əliyevin ideyaları əsasında formalaşmış elm, təhsil, mədəniyyətin davamlı inkişafına təminat verən sosial-siyasi, iqtisadi zəmin bütövlükdə cəmiyyətin tərəqqisini sürətləndirir. Sağlam nəslin yetişdirilməsi, mənəvi tərbiyə məsələləri Heydər Əliyev irsində mühüm yer tutur.

Tədris prosesində bu zəngin irsə müraciət olunması təlimin keyfiyyətinin yüksəldilməsinə, müasir dövrün tələblərinə cavab verən şəxsiyyətin formalaşmasında mühüm əhəmiyyət kəsb edir. Təkcə XX və XXI yüzilliyin əvvəlləri deyil, bütövlükdə ən qədim zamanlardan bu günümüzədək olan tarixin tədqiqi və tədrisində Heydər Əliyevin konseptual baxışları metodoloji əsas kimi olduqca əhəmiyyətlidir.

**Məqalənin elmi yeniliyi.** Məqalədə Ulu Öndər Heydər Əliyev irsinin tədqiqi əsasında onun böyük siyasi və dövlət xadimi olduğu ümumiləşdirilib və sistemli şəkildə təqdim edilib.

**Məqalənin praktik əhəmiyyəti və tətbiqi.** Məqalə Ümummilli lider Heydər Əliyevin həyatı və siyasi-dövlətçilik fəaliyyəti ilə bağlı tədris vəsaitlərinin yazılması üçün əhəmiyyətlidir. Burada əksini tapmış ideyalardan təlim-tərbiyə prosesində elmi-pedaqoji tələblər əsasında istifadə edilə bilər.

## NƏTİCƏ

Ümummilli lider Heydər Əliyev Azərbaycan xalqının yüzilliklər boyu yetirdiyi nadir şəxsiyyətlərdən biri olmaqla milli qürur mənbəyimizdir. Onun həyatı, fəaliyyəti, Azərbaycan tarixində xüsusi mərhələ kimi dövlətə, xalqa xidmətləri həmişə öyrənilməli, gənclərin vətəndaşlıq mövqeyinin, milli mənlik şüurunun formalaşdırılmasında örnək göstərilməlidir. Ulu Öndərimizin tarixi xidmətlərinin müxtəlif elmi istiqamətlər üzrə geniş və daha dərindən, sistemli şəkildə davamlı olaraq araşdırılması və ideyalarının təbliği işində yeni texnologiyalardan məqsədyönlü istifadə vacibdir.

**İstifadə edilmiş ədəbiyyat**

1 Allahverdiyeva, L.Z. (2004). İbtidai sinif şagirdlərinin ideya inamının formalaşdırılmasında Heydər Əliyev irsindən istifadənin elmi-pedaqoji əsasları. Pedaqogika üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

2 Azərbaycan Respublikası Elmlər Akademiyasında ziyalılarla görüşdə çıxış. 21 sentyabr 1993-cü il. Müstəqilliyimiz əbədidir. Birinci kitab. İyun 1993 - may 1994. Bakı: Azərnəşr, 1997, 612 s.

3 Azərbaycan Respublikası Milli Məclisinin ilk iclasında nitq. 24 noyabr 1995. Müstəqilliyimiz əbədidir. Beşinci kitab. Noyabr 1995 - mart 1996. Bakı: Azərnəşr, 1998, 500 s.

4 Azərbaycan Respublikasında 2023-cü ilin "Heydər Əliyev ili" elan edilməsi haqqında

Azərbaycan Respublikası Prezidentinin Sərəncamı. https://president.az/az/articles/view/57413

[5] Azərbaycan Respublikasının Milli bayramı-Respublika günü münasibəti ilə təntənəli mərasimdə nitq. Gülüstan sarayı. 27 may 2002-ci il. Müstəqilliyimiz əbədidir. Otuz səkkizinci kitab. Mart 2002- may 2002. Bakı: Azərnəşr, 2011, 480 s.

[6] Azərbaycanın Milli Qəhrəmanları və Vətənimizin azadlığı uğrunda şəhidlərin ailə üzvləri ilə görüşdə çıxış. 27 dekabr 1993. Müstəqilliyimiz əbədidir. Birinci kitab. İyun 1993- may 1994. Bakı: Azərnəşr, 1997, 612 s.

[7] Baxşəliyev, F.R. (2001). Heydər Əliyev və Azərbaycan təhsil sistemində aparılan islahatların əsas istiqamətləri (problemin öyrənilməsinin müqayisəli-tarixi təcrübəsi). Pedaqogika üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[8] Bakının Nəsimi rayonu ərazisində (Səməd Vurğun küçəsində) – paytaxtda ilk özəl ümumtəhsil məktəb kompleksinin istifadəyə verilməsi mərasimində nitq. 1 sentyabr 2001-ci il. Müstəqilliyimiz əbədidir. Otuz altıncı kitab. Sentyabr 2001 - noyabr 2001. Bakı: Azərnəşr, 2011, 512 s.

[9] Dikmen, S.A. (2008). Heydər Əliyevin diplomatik baxışları. Siyasi elmlər üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[10] Dünya liderləri Heydər Əliyev haqqında. Rəcəb Tayyib Ərdoğan, Türkiyənin Prezidenti. https://lib.aliyev-heritage.org/az/8845617.html

[11] Dünya liderləri Heydər Əliyev haqqında.Butros Qali, BMT-nin Baş katibi. https://aztc.gov.az/az/posts/id:1320

[12] Əhmədova, S.A. (2010). Heydər Əliyevin dil siyasəti. Filologiya üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[13] Əkbərov, Q.İ. (2016). Heydər Əliyev və Naxçıvan Muxtar Respublikasında milli mənəvi dəyərlər məsələsi. Tarix üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[14] Hacıyev, R.B. (2012). Heydər Əliyev və Azərbaycan Respublikasında gənclər siyasəti (1993-2003-cü illər). Tarix üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[15] Hüseynova, L.Ə. (2004). Heydər Əliyev irsində Azərbaycan tarixi məsələləri (müstəqillik dövrü). Tarix üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[16] Hüseynova, R.Z. (2015). Azərbaycan Respublikasının türk dövlətləri ilə münasibətlərinin inkişafında Heydər Əliyevin rolu (1993-2003-cü illər). Tarix üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[17] Qasımov, Ə.Q. (2011). Heydər Əliyev və Naxçıvan Muxtar Respublikasının inkişaf tarixi (1969-2003-cü illər). Tarix elmləri dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[18] Quliyeva, K.R. (2012). Heydər Əliyev irsində mənəvi tərbiyə məsələləri. Pedaqogika üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[19] Məşhurlar Heydər Əliyev haqqında. Oljas Süleymenov. https://lib.aliyev-heritage.org/az/40892278.html

[20] Paşazadə, T.A. (2018). Heydər Əliyev və Azərbaycan xalq yaradıcılığı. Filologiya üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[21] Pişnamazzadə, S.P. (2008). Heydər Əliyev və Azərbaycan Respublikasında milli mənəvi dəyərlərin qorunması. Tarix üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[22] Rzayev, O.Ə. (2009). Heydər Əliyev və Azərbaycan Respublikasının qloballaşma dövründə inteqrasiya və inkişaf siyasəti. Siyasi elmlər üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

[23] Şabanov, M.S. (2012). Heydər Əliyevin Azərbaycanın ərazi bütövlüyünün təmin olunması sahəsində fəaliyyəti. Tarix üzrə fəls.dok. elmi dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. Bakı.

# TƏHSİL SİSTEMİNİN MALİYYƏLƏŞDİRİLMƏSİ PROSESİ TƏHSİLİN İNKİŞAFI ÜZRƏ DÖVLƏT STRATEGİYASININ ƏSAS İSTİQAMƏTLƏRİNDƏN BİRİ KİMİ

**HÜMEYİR ƏHMƏDOV**
Pedaqogika üzrə elmlər doktoru, professor, Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi-pedaqoji kadr hazırlığı şöbəsinin müdiri.
E-mail: humeyir@gmail.com | https://orcid.org/0000-0003-0019-4266

**Məqaləyə istinad:**
Əhmədov H. (2023). Təhsil sisteminin maliyyələşdirilməsi prosesi təhsilin inkişafı üzrə dövlət strategiyasının əsas istiqamətlərindən biri kimi. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 19–28

**ANNOTASİYA**

Dünyanın bir çox ölkələrində təhsil statistikası kəmiyyət göstəriciləri hesabına yüksək rəqəmlərlə ölçülür. Bununla belə, keyfiyyət baxımından bir sıra ölkələrdə, xüsusən də inkişaf etməkdə olan ölkələrdə təhsil sisteminin müasir tələblərə cavab verməməsi müvafiq beynəlxalq təhsil və maliyyə qurumlarının qəbul etdiyi hesabatlarda öz əksini tapıb. Təhsil sisteminin maliyyələşdirilməsi prosesinə iki mühüm aspektdən baxılır: təhsilə ayrılan vəsaitin həcmi və onlardan səmərəli istifadə. Təhsilə diqqət yetirən bütün ölkələr bu və ya digər şəkildə təhsilin inkişafı ilə bağlı strateji fəaliyyət planları qəbul ediblər. Təhsilin maliyyələşdirilməsi problemi təhsilin keyfiyyəti problemi ilə vəhdət təşkil edir, çünki onlar bir-biri ilə sıx təmasdadır. Son onillikdə beynəlxalq görüşlərdə əsas diqqət dövri xərclərin səmərəliliyi və effektivliyinə deyil, təhsil üçün maliyyə çatışmazlığına yönəldilib. Keyfiyyət məsələsi daha da aktuallaşdıqca diqqət maliyyə boşluqlarına, eləcə də xərclərin səmərəliliyinə yönəlir. Təhsil hər bir cəmiyyətin bu gününü və gələcəyini müəyyən etdiyi üçün həmişə aktual məsələlər sırasındadır. Demokratik cəmiyyətlərdə hər bir vətəndaşın ədalətli şərtlərlə təhsil alması üçün şəraitin yaradılması mütləq şəkildə maliyyələşmə ilə bağlıdır. Onu da qeyd etmək lazımdır ki, dünya təcrübəsində təhsil sisteminin maliyyələşdirilməsi bir neçə istiqaməti əhatə edir və müəyyən üsullara malikdir.

**Açar sözlər:** Təhsil strategiyası, təhsil sistemi, biznes klasteri, maliyyələşdirmə, təhsil qrantları, innovasiyalar, təhsil qanunvericiliyi, ixtisaslaşma.

**Məqalə tarixçəsi**
Göndərilib: 13.10.2022
Qəbul edilib: 24.01.2023

# THE PROCESS OF THE EDUCATION FUNDING SYSTEM AS ONE OF THE MAIN DIRECTIONS OF THE STATE STRATEGY FOR THE DEVELOPMENT OF EDUCATION

**HUMEYIR AHMADOV**
Doctor of pedagogical sciences, professor, Head of Scientific Pedagogical Staff Training Department of the Institute of Education of the Republic of Azerbaijan.
E-mail: humeyir@gmail.com | https://orcid.org/0000-0003-0019-4266

**To cite this article:**
Ahmadov H. (2023). The process of the education funding system as one of the main directions of the state strategy for the development of education. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 19–28

**ABSTRACT**

In many countries of the world, education statistics are measured in high figures at the expense of quantitative indicators. However, in terms of quality, the fact that the education system in many countries, especially in developing countries, does not meet modern requirements is reflected in the reports adopted by the relevant international educational and financial institutions. The process of financing the education system is considered from two important aspects: the amount of funds allocated for education and their effective use. All countries that pay attention to education have adopted strategic action plans, one way or another related to the development of education. On the whole, the problem of financing education as a whole is adjacent to the problem of the quality of education since they are closely interconnected. In the last decade, much of the attention at international meetings have been focused on the lack of funding for basic education, rather than on the efficiency and effectiveness of recurrent spending. As the issue of quality becomes more relevant and data emerges that track non-governmental organizations' inefficiencies and government spending diversions, the focus is on financial gaps as well as spending efficiency. Education is always among the topical issues as it determines the present and future of every society.In democratic societies, the creation of conditions for every citizen to receive education on fair terms is necessarily linked to funding. It is also worth noting that the financing of the education system in world practice covers several areas and has certain methods.

**Keywords:** Educational strategy, educational system, business cluster, funding, educational grants, innovations, educational legislation, qualification.

**Article history**
Received: 13.10.2022
Accepted: 24.01.2023

## GİRİŞ

Təhsilin inkişafı hər bir dövlətin siyasi, sosial-iqtisadi və strateji xəttində önəmli sahələrdən biridir. Təhsil sahəsində mövcud olan qanunvericilik, inkişaf strategiyası və fəaliyyət planı bütün sosial meyarlar nəzərə alınaraq tərtib olunur və təsdiq edilir[1]. Cəmiyyətin inkişafının post-sənaye mərhələsinin formalaşması şəraitində dünyada təkrar ictimai istehsal milli iqtisadiyyatın innovativ inkişafı əsasında həyata keçirilir. Bu çağırış geniş çeşidli inteqrasiya olunmuş, səriştə əsaslı biliyə və insan potensialında intellektual komponentin yüksək payına malik yeni tipli müasir insan resurslarının formalaşdırılması kimi yeni vəzifələr qarşıya qoyur. Bu da öz növbəsində təhsil fəaliyyətinin və onun maliyyə təminatı sisteminin çoxşaxəli modernləşdirilməsini tələb edir. Təhsil sisteminin maliyyələşdirilməsi problemlərinə həsr olunmuş çoxsaylı tədqiqatlarda qeyd olunur ki, son illərdə təhsil fəaliyyətinə dövlət investisiyalarının həcminin artırılmasına baxmayaraq, peşə təhsili sisteminin maliyyələşdirilməsi üçün vəsait çatışmazlığı problemi hələ də aktual olaraq qalmaqdadır.

Yeni maliyyə mənbələrinin, onların səfərbər edilməsi üsullarının, o cümlədən təhsil sisteminin maliyyə mexanizminin təkmilləşdirilməsi strategiyası və taktikasını vahid təşkilati-metodoloji əsasda birləşdirən dövlət və özəl sektor tərəfdaşlığının ortaq cəhətlərinin tapılmasına ehtiyac var. Bu prosedurun həyata keçirilməsinin normativ-hüquqi əsasları, müvafiq prosesə xidmət edən investisiya infrastrukturu mövcud olduğu təqdirdə, dövlət və özəl sektorun birgə əməkdaşlığının həyata keçirilməsində dövlət idarəetmə orqanları, özəl kapital, peşə təhsili müəssisələri birlikdə iştirak edə bilər.

Dünya təcrübəsində təhsilin maliyyələşdirilməsi prosesi bir neçə istiqamətdə həyata keçirilir. Ən önəmli maliyyə qaynağı, təbii ki, dövlət büdcəsi hesab olunur. Hər bir dövlətdə təhsilin maliyyələşdirilməsi prosesində dövlətin payı olduqca yüksəkdir. Lakin bu maliyyələşmə proseduru müxtəlif yollarla həyata keçirilir. Bilavasitə maliyyələşdirmə icbari təhsil sisteminin mövcud olduğu ölkələrdə əhalinin sosial rifahının və bərabərhüquqlu təhsilin təmin olunması strategiyasının tərkib hissəsidir. Dövlət büdcəsindən dolayı yolla maliyyələşmə isə müxtəlif təhsil müəssisələrinin (ilk növbədə, ali və orta ixtisas) dövlət sifarişləri əsasında əldə etdiyi qazancdan ibarətdir.

Təhsilin büdcədəndənkənar maliyyələşdirilməsinin bir neçə yolu mövcuddur:

**1. Əhalinin təhsilə ayırdığı vəsait.** Hər bir ailə öz gəlirlərinin müəyyən bir hissəsini bu və ya digər şəkildə təhsilə xərcləyir. Ailə fərdlərindən təhsilalanlar üçün müxtəlif ləvazimatların, dərs vəsaitlərinin və ümumtəhsil müəssisələrində təhsilalanların məktəbli geyim-lərinin alınması kimi maliyyə prosesləri bir çox ölkələrdə əhalinin özü tərəfindən qarşılanır. Beynəlxalq təcrübədə geniş yayılmış bu ənənə formal təhsilin bütün sahələrində vardır.

**2. Beynəlxalq təhsil fondları.** Təhsilin inkişafı üzrə fəaliyyət göstərən bir sıra fondlar vardır ki, onların təhsilə ayırdığı vəsait hesabına əhalinin aztəminatlı qismi müəyyən tədris vəsaitləri ilə təmin olunur. Eyni zamanda, innovativ layihələrin yerinə yetirilməsi və müxtəlif elmi ixtiraların aparılması üçün aparıcı universitetlərin laboratoriya və təcrübə məkanlarının maliyyələşdirilməsi bu fondlar tərəfindən həyata keçirilir. Məsələn, Təhsil sahəsində Qlobal Əməkdaşlıq Təşkilatı təhsil sahəsində gender bərabərliyi, yoxsul ölkələrdə təhsilin səviyyəsinin yüksəldilməsi və digər sahələrdə bir çox dövlətlərlə əməkdaşlıq edir[2].

**3. Qrant layihələri.** Təhsilə ayrılan qrant layihələrinin bir qismi dövlət tərəfindən maliyyələşdirilsə də, inkişaf etmiş ölkələrin əksəriyyətində qrant layihələri özəl institutlar vasitəsilə reallaşır. Məsələn, ABŞ-da bir neçə əsas qrant növü vardır: ***müstəqil qrantlar*** –

---

[1] "Azərbaycanda Respublikasında Təhsilin inkişafı üzrə Dövlət strategiyası". Bakı, 24 oktyabr 2013-cü il.

[2] https://www.globalpartnership.org

müsabiqə prosesindən istifadə etməklə təqdim olunan qrantlar; ***tələbə qrantları*** – tələbələrin, əsasən, universitetdə (kolleclərdə) təhsil almasına yardım etmək üçün ayrılan tələbə kreditləri (Arrow, 1962); ***formula qrantları*** – ölkə Konqresi tərəfindən müəyyənləşdirilən və müstəqil müraciət prosesinin olmadığı qrantlar.

**4. Repetitorlar.** Ənənəvi təhsildən əlavə mövcud olan informal təhsil növlərindən biri məhz repetitorluq vasitəsilə həyata keçirilir. Bir sıra ölkələrdə konkret elm sahəsinə istiqamətlənən xətt üzrə inkişaf məqsədilə ümumi dərs saatından əlavə, müəyyən dərslərdən hazırlıq məşğələləri də həyata keçirilir. Bəzən repetitorluq fəaliyyətinin təhsil sisteminin maliyyələşdirilməsində rolu az görünsə də, əslində, bu sahədən əldə olunan gəlir bir çox ölkələrdə, hətta ölkənin ümumi daxili məhsulunun (ÜDM) 1 faizini təşkil edir[3].

**5. Publik hüquqi şəxs və ya özəl statuslu təhsil müəssisələri.** Beynəlxalq praktikada özəl təhsil müəssisələrinin payı getdikcə daha çox artmaqdadır. Burada institutun maliyyələşdirilmə prosesində dövlətin müəyyən payı olsa da, maliyyə təminatının böyük qismi müəssisənin öz gəlirləri hesabına həyata keçirilir. Hətta dünyada dövlət büdcəsinə şəxsi gəlirlərindən böyük miqdarda vergi ödəyən təhsil müəssisələri də vardır. Burada ödənişli təhsil sistemi və özəl sifarişlər əsas gəlir qaynağını təşkil edir.

Təhsil sisteminin maliyyələşdirilməsində bir sıra fərdi amillər də mövcuddur ki, burada müəyyən fəlsəfi və kulturoloji amillər önəmli rol oynayır. Məsələn, dövlət idarəçiliyində intellektuallığı əsas götürən bir sıra ölkələr vardır ki, bu idarəçilik sisteminin əsasını valideynlərin övladına yüksək təhsil verməsi, habelə gələcəkdə inzibati idarəetmədə öz bilik və bacarıqları sayəsində yer alması üçün önəmli ölçüdə vəsaitin sərf olunması təşkil edir.

Ali təhsilin modernləşdirilməsi mərhələsində onun maliyyə cəhətdən şəffaflaşdırılması probleminin çoxşaxəliliyini, təhsil sahəsində iqtisadi proseslərin modernləşdirilməsinin xüsusiyyətlərini nəzərə alaraq, təhsil müəssisələrinin gəlir bazasının genişləndirilməsi istiqamətində səmərəli səylər göstərilir, bu zaman özəl tərəfdaşlıq və çevik maliyyə idarəetmə modelinin qurulması araşdırma çərçivəsindən kənarda qalır. Dünyada təhsilin modernləşdirilməsinə yönəlmiş çağırışlar kontekstində qarşıya yeni vəzifələr qoyulur. Xüsusilə maliyyə idarəçiliyinin müəyyən problemləri, təhsil müəssisələrinin maliyyə-təsərrüfat fəaliyyətinin dövlət tərəfindən tənzimlənməsi, yeni problemlərin həllində sənayenin maliyyə dəstəyi mənbələrinin həcmi və strukturunun optimallaşdırılması üzrə genişmiqyaslı tədqiqatların istiqamətləri müəyyən edilməlidir. Ölkənin sosial-iqtisadi inkişafı problemləri, bu sahədə resurslardan istifadənin səmərəliliyi, vergitutmanın təkmilləşdirilməsi və digər bir sıra mühüm amillər metodoloji baxımdan müəyyən həll yollarına malikdir. Təhsilin dövlət və özəl sahə tərəfindən birgə maliyyələşdirilməsi üçün baza, təbii ki, mövcuddur. Lakin dövlət büdcəsinin yükünün azaldılması və özəl sektorun təhsilin inkişafından gəlir əldə etməsi üçün konkret metodların işlənib hazırlanması çox önəmlidir.

Reallıq ondan ibarətdir ki, təhsil müəyyən mənada fərdin xeyrinə olan şəxsi və eyni zamanda bütün cəmiyyətə fayda verən ictimai sərvətdir. Bunun ən kamil nümunəsi Kennet Arrounun "etməklə öyrənmək" (Arrow, 1962) nəzəriyyəsinin tətbiqində öz əksini tapır: insanın fəaliyyəti (və bunun qarşılığında aldığı əmək haqqı) təkcə özünün deyil, həm də həmkarlarının təhsil səviyyəsindən asılıdır. Başqa sözlə, ali təhsil təkcə fərdi tələbata deyil, həm də tədqiqatların və digər mühüm təchizat meyarlarının ortaq işlənməsinə əsaslanır. Təhsildə ümumi konsensus ondan ibarətdir ki, təhsilli vətəndaşların, eləcə də cəmiyyətin bütün üzvlərinin bərabər imkanlara malik olması bütövlükdə cəmiyyətə verdiyi bütün faydaları ilə birlikdə böyük ictimai sərvət hesab olunur. Bu arqumentlərin ən çox qeyri-müəyyən olduğu

[3] https://www.r4d.org/wp-content/uploads/Strategies-for-Financing-of-Education.pdf

yer ümumi təhsil səviyyəsidir. Beləliklə, əksər inkişaf etməkdə olan ölkələr üçün ali təhsil və ən azı ümumi orta təhsilin müəyyən hissəsi təhsil haqlarından daha çox asılı olan bir mühit yaradır. Sonra ortaya çıxan əsas məsələlər isə əmək haqqı səviyyələri, nizamnamə kapitalı və kredit müqavilələri ilə bağlıdır. Ümumdünya İnsan Hüquqları Bəyannaməsinin və təhsil hüququ ilə bağlı digər beynəlxalq sənədlərin şərhlərinə müraciət etmədən onlara rasional və qeyri-ideoloji yanaşmaq lazımdır. Onlar da təhsilə dövlət xərclərinin altsahələr üzrə bölgüsünə yanaşma ilə uzlaşdırılmalıdır.

Azərbaycan dövlətinin təhsilin inkişafı sahəsində əldə etdiyi ən böyük nailiyyətlərdən biri irqindən, cinsindən, milli mənsubiyyətindən və dini etiqadından asılı olmayaraq, qanunvericilik çərçivəsində hər kəsin bərabərhüquqlu təhsil almaq imkanlarının mövcudluğudur. Xüsusilə qızların təhsil alması istiqamətində 1901-ci ildə Bakıda inşa edilən Qızlar Məktəbinə özəl sahədən maliyyə vəsaitinin ayrılması (görkəmli messenat Hacı Zeynalabdin Tağıyevin əməyi və şəxsi vəsaiti sayəsində) faktı Azərbaycanda bərabərhüquqlu təhsilin dərin tarixi köklərinin olduğunu əyani şəkildə sübut edir.

Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının əsas strateji komponentlərindən biri maddi-texniki təminat bazasının gücləndirilməsidir. Burada iki əsas sahədə modernləşmə həyata keçirilir. Birinci sahə təhsil müəssisələrinin infrastrukturunun müasirləşdirilməsidir. Mərkəzdə və regional müstəvidə keyfiyyətli təhsilin təmin olunması məqsədilə bir sıra tikinti və təmir-bərpa işləri mütəmadi şəkildə icra olunur. Son onilliklərdə ölkədə yüzlərlə yeni məktəb binası tikilib və ya əsaslı təmir olunaraq infrastrukturu yeniləşdirilib. İkinci sahə təhsil sahəsində qanunvericiliyin təkmilləşdirilməsidir. Beynəlxalq müstəvidə qəbul olunan tədris metodlarının tətbiqi məqsədilə qanunvericilikdə bir sıra dəyişikliklər həyata keçirilir ki, bu da pedaqoji istiqamətdə təhsilin keyfiyyətinin artırılmasına xidmət edir. Burada müəllimlərin peşəkarlıq səviyyəsinin artırılması da xüsusi qeyd edilməlidir.

Təhsilin inkişafında yer alan iqtisadi meyarlara bir sıra digər amillər də daxildir. Müasir dövrün tələblərinə, həmçinin təhsilalanların psixoloji hazırlığına uyğun olan çevik proqramlar əsasında tədris resurslarının hazırlanması və məktəblərin müasir informasiya-kommunikasiya texnologiyaları ilə təmin olunması bu qəbildəndir. Bütün bu proseslər mərhələli şəkildə həyata keçirilir.

Təhsilin maliyyələşdirilmə prosesində xüsusi əhəmiyyətə malik sahələr də vardır. Bunlar inklüziv təhsil meyarlarının müəyyənləşdirilməsi, hər bir Azərbaycan vətəndaşının əmək bazarına inteqrasiyası və peşə hazırlığı məktəblərinin də fəaliyyətinin genişləndirilməsidir.

Qlobal pandemiya şəraitinin mövcud olduğu mühitdə mühüm hadisələrdən biri də distant təhsilin səviyyəsinin yüksəldilməsidir. Distant təhsilin təmin olunması, ilk növbədə, internet resurslarının dərs yükünə hazır olması və çevik bir şəkildə yeni şəraitə uyğunlaşmaqdan asılıdır. Burada həm müəllimlərin, həm də təhsilalanların psixoloji və texnoloji hazırlığı önəmli rol oynayır. Təbii ki, bu da təhsilə ayrılan vəsaitin yeni bir sahəsini təşkil edir. Bu proses qlobal mühitdə meydana gələn yeni bir anlayışın – "smart məktəblər"in təşkil olunmasını şərtləndirən əsas amillərdən birinə çevrilib. "Smart məktəblər" elektron təhsilin – rəqəmsal texnologiyaların köməyi ilə bilik və bacarıqların öyrədilməsi sistemidir. Sistemin məktəblərdə tətbiqində əsas məqsəd müasir informasiya-kommunikasiya texnologiyalarına əsaslanan rahat və pandemiya şəraitində daha təhlükəsiz mühitin yaradılmasıdır. "Ağıllı məktəb" avtomatlaşdırılmış informasiya sistemlərinə aiddir. Bu sistem texniki cəhətdən informasiya təminatı daxil olmaqla proqram-aparat kompleksi kimi həyata keçirilir. Onu funksional olaraq aşağıdakı komponentlərə bölmək olar: ***Monitorinq sistemi*** – dərs cədvəllərinin yaradılması və idarə olunması, analitik hesabat sistemi, təhsilalanların akademik göstəricilərinin və şagirdlərin bilik və bacarıqlarının test imtahanı vasitəsilə qiymətləndirilməsi, dərsin real vaxt rejimində müşahidəsi, məktəb məlumat bazasının və elektron kitabxananın günün istənilən saatında istifadəyə

açıq olması; ***Ağıllı sinif otağı*** – elektron kitab və elektron jurnallar vasitəsilə dərs idarəetmə proqramının, davamiyyətə nəzarətin, ev tapşırıqlarının həllinin, interaktiv lövhə və təlim sisteminin təmin olunması; ***Smart terminallar*** – müəllimlər və təhsilalanlar üçün ayrı-ayrılıqda elektron terminalların mövcudluğu və s. (Omidinia, Masrom, Selamat, 2013).

Distant təhsilin iqtisadi yükə münasibəti fərqlidir. Bir tərəfdən təhsilalanların gündəlik nəqliyyat və s. xərcləri azalsa da, digər tərəfdən maddi-texniki təminatın həyata keçirilməsi üçün müəyyən vəsaitin xərclənməsi tələb olunur. Məhz buna görə də distant təhsilin maliyyələşdirilməsi prosesi fərqli yanaşma tələb edir.

Ölkələr üzrə inkişaf strategiyası kimi, təhsil xərcləri də müxtəliflik təşkil edir. Aşağıgəlirli ölkələr yüksəkgəlirli ölkələrdən daha yoxsul olduğuna görə hər təhsil alan fərdə ayrılan xərclər arasındakı fərq böyük olmaqda davam edir. Bir şagirdə düşən təhsil xərclərinin ölkələrarası fərqi həmin ölkələrin ÜDM xərclərindən qat-qat çoxdur. Tələbəyə düşən xərclərin real ifadədə daha yaxşı anlaşılmasına kömək edən amillərdən biri təhsil xərclərinin əsas komponenti olan müəllimlərin maaşlarının yüksək gəlirli ölkələrdə daha çox olmasıdır. Ona görə də, təhsilin inkişafı ilə bağlı qərar verilərkən əməyin dəyərləndirilməsi inkişaf etməkdə olan ölkələrin də nəzərə almalı olduğu əsas meyarlardandır.

Burada məktəbəqədər təhsilə verilən önəm və ayrılan vəsait də xüsusi əhəmiyyət kəsb edir. Uşaqların erkən yaşda qarşılaşdıqları mühit onların qabiliyyət, davranış və istedadlarının formalaşmasında mühüm rol oynayır. Böyük ölçüdə, eyni ölkədə, lakin müxtəlif sosial-iqtisadi şəraitdə olan insanlar arasında təhsil boşluqlarına səbəb olan amillərdən biri də budur. Hər ölkə üçün ayrılıqda bu prosesləri şərtləndirən nəzəriyyə və dəlillərin təhlili və təhsil siyasətinin qurulması istiqamətindəki təsirlər müəyyən edilməlidir. Məktəbəqədər təhsilin keyfiyyətini yoxlamaq üçün hazırlanmış Perri pilot layihəsinə cəlb edilmiş imkansız uşaqların daha yüksək təlim nəticələrinə malik olduqları üzə çıxarılmışdır. (Roser, and Ortiz-Ospina, 2016).

Təhsilin maliyyələşdirilməsi prosesində təhsil müəssisəsinin ümumi strukturu, tədris modeli, maliyyə bazası böyük önəm kəsb edir. Dünya praktikası sübut edir ki, qloballaşma şəraitində təhsilin yeni maliyyə modelinin inkişafı üçün ən təsirli mexanizm təhsil, elm və innovativ konsorsium tipli təhsil komplekslərinin yaradılması, onların fəaliyyətinin ixtisasyönlü klasterlərin inkişafına yönəldilməsidir. Elm və təhsil sahəsinin investisiya və innovasiya modeli milli iqtisadiyyatın ən mühüm resurs amili kimi təhsil sahəsində innovasiyaların həm təşkilati, həm də iqtisadi inkişafı üçün yeni maliyyə modelini formalaşdıraraq, milli universitetlərin rəqabət qabiliyyətini və təcrübəyönlü fundamental elmin formalaşmasını təmin edə bilər. Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyinin qarşısında duran mühüm vəzifələrdən biri də məhz bu istiqamətdə layihələrin həyata keçirilməsindən ibarətdir. Klaster tipli elm və təhsil müəssisələrinin fəaliyyəti, eyni zamanda tətbiqi biliklərin inkişafına da münbit şərait yaradır. Özəl biznes və dövlət tərəfindən təhsilə birgə investisiya mexanizmlərinin tətbiqi üzrə qlobal tendensiya yeni xüsusi və məqsədyönlü maliyyələşdirmə mexanizmlərinin inkişafı ilə müşayiət olunur. Təhsil sahəsində "dövlət-biznes partnyorluğu" sisteminin hüquqi bazasının yaradılması və təkmilləşdirilməsi beynəlxalq təcrübədə mütəmadi tətbiq olunan praktiki sahələrdən biridir[4]. Bunun üçün büdcədən maliyyələşmənin təhsil müəssisələri arasında bölüşdürülməsindən maliyyə vəsaitlərinin adambaşına xərclərə yönəldilməsi, eləcə də birbaşa maliyyələşdirmə metodlarından bilavasitə keçidin həyata keçirilməsi baş verməlidir. Digər tərəfdən, təhsilə yönəldilmiş özəl resursların (özəl kreditləşdirmə və təhsil sığortası) toplanması üçün maliyyə alətləri formalaşdırılmalıdır. Dünyada ali təhsilin maliyyələşdirilməsinin yeni formalarına təhsil

[4] "Azərbaycan Respublikasının 2020-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası". Bakı, 22 iyul 2022-ci il.

kreditləri, əldə olunan qrantlar, təhsil sığortası və tələbələrin maliyyə dəstəyi sistemləri daxildir. Yuxarıda deyildiyi kimi, Azərbaycanda təhsil tələbə kreditinin formalaşması bu istiqamətdə atılmış ən önəmli addımlardan biridir. Burada bir neçə amil birləşir:

1. Dövlət kredit müəssisələrini (bank sektoru və s.) təhsilin inkişafına vəsait ayırmağa təşviq edir. Tələbələrə kredit verildiyi zaman borcalanın özü və ya onun əvəzinə hər hansı bir şəxsdən (valideyni, qohumu, işəgötürəni və s.) qaytarıla bilməsi zəmanəti əldə edir. Bu da özlüyündə maliyyə institutlarını təhsilin maliyyələşdirilməsinə cəlb edir.

2. Təhsil tələbə kreditinin sosial və standart növləri mövcuddur ki, bununla sosial vəziyyəti zəif olan tələbələrin tədris prosedurunun maliyyələşdirilməsi böyük ölçüdə dəstək almış olur. Bu zaman tələbə daha artıq maddi gəlirlər hesabına kredit borcunu ödəyə bilmək kimi yeni bir motivasiya əldə edir.

3. Standart kredit almaq hüququna malik olan tələbələrin qarşısına qoyulan şərtlərdən biri ümumi orta təhsil göstəricisinin mümkün 100 ballıq şkala ilə 71 baldan yuxarı olmasıdır. Ödənişli təhsil alan tələbələrin isə illik təhsil haqqının ən azı 20 faizini ödəməsi nəzərdə tutulur.

4. Tələbə kreditlərinin sığortalanması sığorta şirkətlərinin də bu prosedura cəlb olunmasına şərait yaradır.

Buradan belə nəticəyə gəlmək olar ki, təhsil və elmi fəaliyyətdə dövlət-özəl tərəfdaşlığı mərkəzləşdirilmiş fondlardan birbaşa maliyyə dəstəyi ilə yanaşı, layihələrə dövlət dəstəyinin aşağıdakı formalarını əhatə edə bilər:

- investorlara əminliklə qaytarıla bilən, təxirəsalınmaz ödənişlilik əsasında kredit resurslarının verilməsi;
- səhmdar cəmiyyətlərin "layihə üzrə" buraxılmış səhmlərinin bir hissəsinin dövlət mülkiyyətində saxlanılması şərtləri əsasında zəmanət verilməsi;
- kredit alanın təqsiri olmadan layihə baş tutmadıqda investor tərəfindən qoyulan vəsaitin bir hissəsinin geri qaytarılmasına təminatın verilməsi.

Təhsil müəssisələrinin peşəkarlıq səviyyəsinin daim yüksəldilməsini təmin edən yeni sistemin yaradılması çərçivəsində həyata keçirilən prosedurlardan biri də ali təhsil müəssisələrində əlavə təhsil üzrə strukturların yaradılmasının təşviqidir. Əlavə təhsil birmənalı olaraq ödənişli olduğu üçün dövlət büdcəsindən maliyyələşən təşkilatların maddi bazasına əlavə gəlirlərin gəlməsinə səbəb olur. Daha çox gəlir əldə etmək məqsədilə müəllimlərin peşəkarlığının yüksəldilməsi təhsilin ümumi inkişafına təkan verən mühüm amillərdəndir. Təhsilin idarə olunmasının məlumat sistemləri və yeni hesabatvermə modelinin yaradılması özündə bir sıra elektron prosedurları birləşdirir. Bu, əsasən, iki istiqamətdə həyata keçirilir: 1) təhsil müəssisələrində məlumat bazalarının, məzun-koordinasiya-informasiya sistemlərinin yaradılması, yenilənməsi və idarəetmə prosesində istifadəsinin təmin edilməsi; 2) əmək bazarının mütəmadi öyrənilməsi sisteminin yaradılması və tətbiqi.

Əmək bazarında tələb və təklifin monitorinqi sayəsində ali və orta ixtisas təhsili müəssisələrində plan yerlərinin müəyyənləşdirilməsi gələcəkdə sosial-iqtisadi inkişafa təsir göstərən ən mühüm amillərdəndir. Belə ki, bir peşə sahəsi üzrə kifayət qədər mütəxəssis olduğu halda, bu sahəyə daha çox yer ayrılması və əksinə, kadr çatışmazlığının mövcud olduğu sahələr üzrə təhsil planında az yer nəzərdə tutulması sosial balansın pozulması ilə nəticələnə bilər. "Azərbaycan Respublikasının 2020-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası"nda gəlirindən asılı olmayaraq, bütün ailələrin övladları üçün ali təhsilə əlçatanlığın təmin olunması məqsədilə ali təhsil müəssisələrinə qəbul olan tələbələrin sayının əlavə olaraq 20 min nəfər artırılması nəzərdə tutulub[5].

Təhsilin maliyyələşdirilməsi üzrə Azərbaycan modelində yer alan mühüm layihələrdən biri

[5] "Azərbaycan Respublikasının 2020-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası". Bakı, 22 iyul 2022-ci il.

də Təhsilin İnkişafı Fondunun yaradılmasıdır. Fondun gəlirləri sırasında yer alan ən mühüm vəsaitlər – Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin tabeliyindəki təhsil müəssisələrinin büdcədənkənar vəsaitləri, ödənişli təhsil xidmətləri göstərilməsindən əldə etdikləri gəlirlərdən ayırmalar; ianələr, qrantlar və cəlb edilən investisiyalar; həmçinin Fondun fəaliyyətindən əldə olunan gəlirlərdir. Bu layihə təhsil müəssisələri tərəfindən təhsilin inkişafına sərf edilən vahid vəsait bazasının mövcudluğunu təmin edir. Elm və Təhsil Nazirliyinin tabeliyində yaradılan digər bir publik hüquqi şəxs isə Peşə Təhsilinin İnkişafı Fondudur. Bütün bu tip qurumların strukturu və statusu "dövlət-biznes partnyorluğu"nun inkişafına yönəlmiş əsas istiqamətləri müəyyən edir.

Qabaqcıl beynəlxalq təcrübənin təhlili göstərir ki, təhsil sahəsindəki investor aşağıdakı problemlərin həllində iştirak edə bilməlidir: tədris, laboratoriya və maddi-texniki bazanın yenilənməsi; dövlət məşğulluq qurumlarında və özəl təşkilatlarda istehsalat və bakalavr təcrübəsi üçün eksperimental meydançaların yaradılması; şirkətlərin innovativ fəaliyyətini təmin etmək üçün universitetlərin innovasiya infrastrukturunun zəruri elementlərinin inkişafı; tələbələrin və professor-müəllim heyətinin elmi-tədqiqat işlərinin həyata keçirilməsinə və konkret biznes problemlərinin həlli üçün layihələrin hazırlanmasına cəlb edilməsi və s.

Hazırda təhsilin maliyyələşdirilməsi mexanizminin müasirləşdirilməsinin ümumi istiqaməti təhsil sistemində özünütənzimləmə proseslərinin başlanmasını nəzərdə tutan maliyyə resurslarının sərəncamında təhsil müəssisələrinin müstəqilliyinin genişləndirilməsi və onlardan istifadənin səmərəliliyinin artırılmasını nəzərdə tutur.

Təhsilin maliyyələşdirilməsinin sosial-iqtisadi aspektləri arasında iqtisadi azadlıq da mühüm əhəmiyyət daşıyır. Beynəlxalq təcrübə göstərir ki, təhsil sisteminin müasirləşdirilməsi mərhələsində "dövlət-özəl tərəfdaşlığı"na əsaslanan maliyyə mexanizminin tətbiqi tədris prosesinin qeyri-tədqiqatlara yönəlmiş yaradıcı pedaqogika metoduna keçirilməsinin ən mühüm şərtidir. Söhbət təhsil prosesində bu cür formaların axtarışından gedir ki, bu zaman tələbə öyrənmə prosesində əldə etdiyi məlumatlardan müstəqil olaraq bilik sistemini formalaşdırmaq, yeni biliklərin və şəxsi təcrübəsinin təhlili əsasında onu düzəltmək imkanı əldə edəcək, paradiqma əsaslarını dəyişməyə, gələcəyi nikbinliklə qarşılamağa hazır olacaqdır. Əmək bölgüsü, yeni peşələrin yaradılması və istehsalın təşkili, şübhəsiz, məntiqi, yaradıcı təfəkkürün, səbəb-nəticə əlaqələrinin inkişafına əsaslanan rasional biliyin, elmin inkişafını tələb edir.

Təhsilin maliyyələşdirilməsinin yeni qəbul olunmuş təşkilati-iqtisadi mexanizminin əsasını istehsal olunan məhsulların həcminə, keyfiyyətinə və struktur uyğunluğuna görə dövlət və biznes ictimaiyyətinin qarşılıqlı məsuliyyətinə əsaslanan ali təhsilin ayrı-ayrı maliyyələşdirilməsindən birgə investisiyaya keçid prinsipi təşkil etməlidir. Müasir mərhələdə iqtisadiyyatın tələbləri əsasında insan potensialı, sosial-iqtisadi meyillər, cəmiyyətin və əmək bazarının inkişafı məhz təhsilin inkişafına əsaslanır. Tərəflər təhsilə investisiya qoyuluşunun risklərini və təhsil fəaliyyəti sistemində iqtisadi resurslardan istifadənin səmərəliliyinə görə məsuliyyəti bölüşdüyü təqdirdə həm təhsilin inkişafı, həm də azad biznes rəqabətinin yaradılması üçün sağlam mühit formalaşmış olur (Əhmədov, 2022).

## NƏTİCƏ

Təhsilin maliyyələşdirilməsi prosesi ölkənin sosial-iqtisadi rifahına bilavasitə təsir göstərən və uzunmüddətli investisiya tələb edən bir prosesdir. 2015-ci ildə dünyanın 193 dövlətinin imzaladığı BMT Baş Assambleyasının "Dünyamızın transformasiyası: 2030-cu ilədək Davamlı İnkişaf Gündəliyi" adlı qətnaməsində müəyyənləşdirilən 17 əsas məqsəddən dördüncüsü təhsilə həsr olunub. O, "inklüziv, bərabər keyfiyyətli təhsilin təmin edilməsi və hamı üçün ömürboyu təhsil imkanlarının təşviqi" kimi formalaşdırılıb (Fedorchuk, Morozov, 2021). UNESCO-nun dayanıqlı inkişaf hədəfləri arasında ön sırada olan təhsilin inkişafı perspektivləri

qlobal bərabərhüquqlu təhsil modelini özündə ehtiva edir. Həmin təşkilatın "Təhsil-2030" proqramı, ümumilikdə, təhsilin bütün sosial-iqtisadi inkişafların önündə olduğu prinsipinə sadiqlik nümayiş etdirir. 2015-ci ildə Koreyanın İnçxon şəhərində dünyanın 120-dən çox ölkəsinin qəbul etdiyi bəyannamədə qeyd olunduğu kimi, inklüziv və bərabər keyfiyyətli təhsili təmin etmək, hamı üçün ömür boyu təhsil imkanları yaratmaq, digər hədəflər qlobal və milli təhsil problemlərinin həllinə kömək etmək məqsədi daşıyır. O, insan hüquqlarına və ləyaqətinə, sosial ədalətə, inklüzivliyə, müdafiəyə, mədəni, dil və etnik müxtəlifliyə, həmçinin ortaq məsuliyyət və hesabatlılığa yönəlmiş humanist təhsil və inkişaf konsepsiyasına əsaslanır. Bəyannamənin 14, 15 və 16-cı bəndlərində tərəfdar çıxan ölkələrin maliyyə dəstəyi sayəsində elm və təhsilin inkişafına ayrılan vəsaitin hər bir ölkənin ümumi daxili məhsulunun 4-6 %-ni və ya dövlət xərclərinin 15-20 %-ni təşkil etməsi hədəfə alınır. Burada ölkələrin maliyyə imkanlarının təkcə ölkədaxili xərclərə deyil, eyni zamanda dünyanın yoxsul və təhsil xərclərini ödəyə bilməyən ölkələrinə də yardım məqsədilə ayrılması nəzərdə tutulur. Bu Bəyannamənin önəmi ondan ibarətdir ki, təhsilin qlobal ölçüdə maliyyələşdirilməsi dünya tarixində ilk dəfə məhz həmin Bəyannamə ilə genişmiqyaslı hədəflərə hesablanıb. Milli hüquqi və siyasi sərhədlər daxilində Azərbaycan da bu tip qlobal layihələrin həyata keçirilməsinə öz töhfəsini verməkdədir. Dünyanın bir sıra ölkələrində olduğu kimi təhsil ocaqlarının tikintisi və bərpasına Azərbaycan dövləti tərəfindən ayrılan maliyyə vəsaitləri təhsilin qlobal inkişafına yönəlmiş hədəflər sırasında öz prioritet mövqeyini qoruyub saxlamaqdadır.

UNESCO-nun 1 sentyabr 2022-ci il tarixli məlumatında əks olunan nəticələrə görə dünyada 244 milyon uşaq və yeniyetmə təhsil almaq imkanından məhrumdur[6]. Bu cür qlobal mövqedən yanaşdıqda, qeyd edilməlidir ki, təhsil sisteminin maliyyələşdirilməsi prosesi təkcə təhsilin inkişafı üzrə deyil, ümumilikdə, sosial-iqtisadi rifaha hədəflənən beynəlxalq siyasətin əsas istiqamətlərindən biri olaraq daim ön planda yer almaqdadır.

**İstifadə edilmiş ədəbiyyat**

1. "Azərbaycan Respublikası Təhsil nazirliyinin tabeliyində "Təhsilin İnkişafı Fondu"nun yaradılması haqqında" AR Prezidentinin 14 iyul 2021-ci il tarixli Sərəncamı.
2. "Azərbaycan Respublikası Təhsil nazirliyinin tabeliyində "Təhsilin İnkişafı Fondu" publik hüquqi şəxsin yaradılması haqqında "AR NK-nın 1 mart 2022-ci il tarixli qərarı.
3. "Azərbaycan Respublikasının 2020-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası". Bakı, 22 iyul 2022-ci il.
4. "Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət strategiyası". Bakı, 24 oktyabr 2013-cü il.
5. 244 milliona detey ne nachnut novyy uchebnyy god (doklad YUNESKO)/ URL: https://www.unesco.org/ru/articles/244-milliona-detey-ne-nachnut-novyy-uchebnyy-god-doklad-yunesko
6. Arrow, K.J. (1962). "The Economic Implications of Learning by Doing". The Review of Economic Studies. 29 (3): pp. 155–173. URL: https://www.jstor.org/stable/2295952
7. Education 2030: Incheon Declaration and Framework for Action for the implementation of Sustainable Development Goal 4: Ensure inclusive and equitable quality education and promote lifelong learning opportunities for all. https://unesdoc.unesco.org/ark:/48223/pf0000245656_rus
8. Əhmədov, H.H. (2022). Təhsil sisteminin modernləşdirilməsi strateji insan kapitalının inkişafında prioritet sahələrdən biridir. "Azərbaycan müəllimi" qəzeti, 7 oktyabr.
9. Əzizov, R.E. (2022). Elmi inkişafın dəyər zənciri. "Azərbaycan müəllimi" qəzeti, 12 avqust.

[6] https://unesdoc.unesco.org/ark:/48223/pf0000245656_rus

[10] Fedorchuk, Y.M., Morozov, A.V. (2021). Strategiya razvitiya obrazovaniya: ot mezhdunarodnogo urovnya do urovnya obrazovatel'noy organizatsii, Global'naya Ekonomika i Obrazovaniye. 1(2): c.73–81.
[11] Global Partnership for Eucation. URL: https://www.globalpartnership.org
[12] Nicholas Burnett. Strategies for financing of education: A global view. Results for Development Institute / URL: https://www.r4d.org/wp-content/uploads/Strategies-for-Financing-of-Education.pdf
[13] Omidinia, S., Masrom, M., Selamat, H. (2013). An Examination of the Concept of Smart School: An Innovation to Address Sustainability, 2nd International Conference on Advances in Computer Science and Engineering (CSE 2013) July, pp. 326-329
[14] Roser, M., and Ortiz-Ospina, E. (2016). "Financing Education". Published online at OurWorldInData.org. Retrieved from: https://ourworldindata.org/financing-education [Online Resource]

# PEDAQOJİ TƏHSİLİN MƏZMUN VƏ TEXNOLOGİYALARININ MƏRHƏLƏLİ TƏŞKİLİNİN YENİ MODELİ VƏ ƏLDƏ EDİLMİŞ NƏTİCƏLƏR

**AFƏT SÜLEYMANOVA**
Ümumi və məktəbəqədər təhsildə məzmun, tədris və qiymətləndirmə şöbəsinin aparıcı məsləhətçisi, Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi. E-mail: afet.suleymanova@edu.gov.az
https://orcid.org/0000-0002-7078-5400

**Məqaləyə istinad:**
Süleymanova A. (2023). Pedaqoji təhsilin məzmun və texnologiyalarının mərhələli təşkilinin yeni modeli və əldə edilmiş nəticələr. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 29–40

**ANNOTASİYA**

Bu tədqiqatda məqsəd müəllim hazırlığının təşkilinin səmərəliliyini yüksəltmək baxımından işlənmiş məzmun və texnologiyaların mərhələli təşkilinin yeni modelinin 2009-2017-ci illərdə tətbiqindən əldə edilən nəticələrin təhlilindən, həmin modelin əhəmiyyətlilik səviyyəsinin dəyərləndirilməsindən ibarətdir. 270 saatı əhatə edən proqram üzrə dörd semestr ərzində tədris edilən eksperimental fənnin müəllim hazırlığına təsirini öyrənmək üçün Quizi-eksperimental tədqiqat növündən istifadə edilib. Bu tədqiqat növü keçmişdə həyata keçirilən eksperimentin nəticələrinin səbəblərinin öyrənilməsi baxımından əhəmiyyətli hesab edilib. Statistik əhali eksperimental fənn tətbiq edilən ali təhsil müəssisələrinin müəllimlərin işə qəbulu (MİQ) imtahanlarında iştirak edən 10360 nəfər məzunudur. "Səbəb-qarşılaşdırma" metodunun "müdaxilənin nəticələrinin tədqiqi" texnikasından yararlanmaqla əldə edilən nəticələr belə qənaətə gəlməyə əsas verir ki, pedaqoji təhsilin məzmun və texnologiyalarının mərhələli təşkilinə əsaslanan eksperimental fənn tədris edilmiş ixtisasın məzunları MİQ imtahanlarında bu fənn tədris edilməyən ixtisasın məzunlarından bir çox hallarda yüksək nəticələr nümayiş etdiriblər. Məlum olub ki, pedaqoji təhsilin məzmun və texnologiyaları, hətta bir fənn çərçivəsində belə 4 semestr boyu mərhələli təşkil edildikdə birincilərin yüksək nəticələr nümayiş etdirmə (85,4%) imkanı ikincilərdən (48,4%) 1,76 dəfə artıqdır.

**Açar sözlər:** Pedaqoji təhsilin məzmun və texnologiyaları, pedaqoji təhsilin mərhələli təşkilinin yeni modeli, müəllim hazırlığının təşkilinin səmərəliliyi.

**Məqalə tarixçəsi**
Göndərilib: 17.10.2022
Qəbul edilib: 15.11.2022

# A NEW MODEL OF THE STAGED ORGANIZATION OF CONTENT AND TECHNOLOGIES OF PEDAGOGICAL EDUCATION AND THE OBTAINED RESULTS

**AFET SULEYMANOVA**
Leading consultant of the content, teaching, and evaluation department in general and preschool education, Ministry of Science and Education of the Republic of Azerbaijan. E-mail: Afet.Suleymanova@edu.gov.az
https://orcid.org/0000-0002-7078-5400

**To cite this article:**
Suleymanova A. (2023). A new model of the staged organization of content and technologies of pedagogical education and the obtained results. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 29–40

**ABSTRACT**

The goal of this study is to assess the degree of significance of the model, which was used within the scope of the experimental subject from 2009 to 2017, and whose content and technologies were created with five stages in mind ("self-determination", "self-organization", "scientific-pedagogical organization", "self-improvement" and "self-realization"). The quiz-experimental research design was employed to investigate the impact of the experimental subject taught over four semesters on teacher training. This form of research has been deemed useful in terms of investigating the reasons of previous experiment findings. The statistical population consists of 10,360 graduates of higher education institutions who took the teacher recruitment exams, both taught and untaught experimental courses. According to the results of the teacher recruitment exams, the results of the graduates who were taught the experimental subject based on the new model and the results of the graduates who were not taught this subject were compared using the "investigation of the results of the intervention" technique of the "Causal comparison" method. Graduates of the privately taught experimental subject are known to show high results in many cases. Thus, the gradual arrangement of the content and technologies of teacher education in a course covering 270 hours has made a significant difference in the results of graduates. It was determined that the results of the graduates who were taught the experimental subject (85.4%) were 1.76 times higher than the results of the graduates who were not taught this subject (48.4%).

**Keywords:** Content and technologies of pedagogical education, a new model of the staged organization of pedagogical education, efficiency of organization of the teacher training.

**Article history**
Received: 17.10.2022
Accepted: 15.11.2022

Cəmiyyətin maraq və ehtiyacları durmadan dəyişdikcə təhsil sisteminin də məqsəd və vəzifələri müvafiq olaraq yenilənir. Sistemin məqsəd və vəzifələrinin reallaşmasının əsas açarı dəyişən tələblərə cavab verən müəllim kadrlarıdır. Bu baxımdan, zamanın tələblərinə cavab verən təhsil sisteminin qurulması böyük əhəmiyyət kəsb edir. Respublikamızda da bu istiqamətdə ciddi araşdırmalar həyata keçirilir. 2009-2011-ci illərdə Respublikanın üç ali təhsil müəssisəsində tətbiq olunub, tədrisi faktiki olaraq 2017-ci ilə qədər davam etdirilən yeni model üzrə həyata keçirilən eksperimentlər belə tədqiqatlardan hesab edilə bilər. Sözügedən yeni modeldə pedaqoji təhsilin məzmun və texnologiyalarının mərhələli təşkili əsas götürülüb, "özünütəyin", "özünütəşkil", "elmi-pedaqoji təşəkkül", "özünütəkmilləşdirmə", "özünüreallaşdırma" mərhələləri əhatə edilib. Eksperimental qruplarda təhsil alan tələbələrin məzun olduqdan sonra MİQ imtahanlarında əldə etdikləri nəticələr eksperimentə cəlb edilməyib, qruplardan məzun olanların nəticələri ilə qarşılaşdırılaraq statistik təhlillər aparılıb.

2009-2017-ci illərdə Respublikanın üç ali təhsil müəssisəsində dörd semestr boyunca tədris olunan "Təhsilin əsasları" eksperimental fənninin məzmun və texnologiyaları "özünütəyin", "özünütəşkil", "elmi-pedaqoji təşəkkül", "özünütəkmilləşdirmə" və "özünürealizə" mərhələləri gözlənilməklə tərtib edilib. İlkin olaraq gələcək müəllimlərdə özünütəyin səriştəsini formalaşdırmaq üçün fənnin tədrisi "Təhsil fəlsəfəsi və təlim prosesi" bölməsi çərçivəsində həyata keçirilən və "müəllimlərin düşüncə tərzlərinin dəyişməsinin onların peşəkarlığının inkişafına səbəb olması"na nail olunub (McBride, 2002). Bu mərhələdə "Təhsil nə üçün lazımdır?", "Onun məqsədi nədir?", "Məktəbin vəzifəsi nədir?", "Müəllimin və şagirdin təlim prosesində rolu nədən ibarətdir?", "Təlim mühiti necə olmalıdır?", "Hansı dərs uğurlu dərs hesab edilir?" kimi suallara cavab verilir. Həmin problemlər müxtəlif təhsil fəlsəfəsi baxımından araşdırılıb, müasir tələblərə cavab verən yanaşmalar müəyyən edilib və pedaqoji praktikanın ən sadə modeli və ya real forması ilə tanış olunub (McBride, 2002). Fənnin tədrisinin bu mərhələsində təlim fəaliyyətlərinin əsas məqsədi gələcək müəllimin pedaqoji təfəkkürünün formalaşmasına xidmət etməkdən, fərdin və cəmiyyətin ehtiyac və maraqlarının müasir təhsilin, məktəbin, kurikulumun, müəllim və şagird münasibətlərinin formalaşmasına və öz "peşəkar "mən"ini təyin etməsinə şərait yaratmaqdan ibarət olub.

İkinci, "özünütəşkil" mərhələsində fənn üzrə təhsil proqramı gələcək müəllimin "pedaqoji əmək mədəniyyəti"nin formalaşdırılması baxımından tərtib edilib. Bu mərhələyə "Cəmiyyətin təhsil ehtiyacları və onların hüquqi təminatı", eləcə də "Təhsildə dövlət siyasəti" fəsilləri daxil edilib. Gələcək müəllimlər tərəfindən şagird, valideyn və həmkarları ilə hüquqi baxımdan əsaslandırılan qarşılıqlı fəaliyyətin qurulmasını təmin edən normativ hüquqi aktlar praktik tapşırıqlar üzrə öyrənilib, təhsil iştirakçılarının hüquq və vəzifələri araşdırılıb. Həmçinin Azərbaycan Respublikasının qoşulduğu müvafiq beynəlxalq hüquqi aktlar nəzərdən keçirilib, təhsil sahəsinin müxtəlif istiqamətləri üzrə dövlət siyasətini müəyyən edən strateji sənədlər praktik situasiyalar üzrə tədqiqatlar aparılmaqla öyrənilib. Sənədlərdə vurğulanan humanistlik, demokratiklik, dünyəvilik, bərabər şərait, millilik, şəxsiyyətyönlülük, keyfiyyətlilik, səmərəlilik, inteqrativlik, şəffaflıq və s. prinsiplərin rəhbər tutulmasının məktəbin və sinfin idarə edilməsində əhəmiyyəti müəyyənləşdirilib. Beləliklə, hüquqi və siyasi savadlılığı təmin olunmuş müəllimin özünütəşkili – öz fəaliyyətini sistemli, düşünülmüş şəkildə qurmaq imkanları maksimum səviyyəyə yüksəldilir. Gələcək müəllim öz sinfində mövcud vəziyyəti: maddi-texniki bazanı, şagirdlərin milli-etnik tərkibini, idraki imkanlarını, sosial, mənəvi-psixoloji, fiziki-fizioloji vəziyyətini, eləcə də valideynlərin intellektual səviyyəsi, sosial, mənəvi-psixoloji vəziyyətini araşdıraraq qarşıya çıxa biləcək problemləri proqnozlaşdırmağın yollarını öyrənib və "özünün pedaqoji-peşə fəaliyyətini layihələşdirmək, həyata keçirmək və təkmilləşdirmək üçün qabiliyyətlərini inkişaf

etdirib" (Fraenkel, 2012). Yəni eksperimental fənn proqramı üzrə bu bölmə gələcək müəllim hazırlığı üzrə təhsilin hər üç iştirakçısı ilə əməkdaşlıq şəraitində sinfin düzgün idarə edilməsinə xidmət göstərən real, işlək plan qurmaq, onları mərhələ-mərhələ həyata keçirmək, eləcə də əldə edilən nəticələri qiymətləndirmək və növbəti mərhələdə görüləcək işlərlə bağlı qərarlar qəbul etmək kimi mühüm bacarıqlara yiyələnməsinə xidmət edib. Gələcək müəllimlər, həmçinin müasir maliyyələşmə şəraitində müəllimin planlı və sistemli fəaliyyətinin məktəbin və pedaqoji kadrların büdcəsinə mümkün təsiri də öyrənilib, bu məsələlər "Təhsilin iqtisadiyyatı" məzmun xətti üzrə yığcam əhatə edilib.

"Elmi-pedaqoji təşəkkül" fasiləsiz pedaqoji təhsilin məzmun və texnologiyalarının üçüncü mərhələsi olub, gələcəyin müəllimlərinin "elmi-pedaqoji fəaliyyət üçün pedaqoji qabiliyyətinin inkişaf etdirilməsi" baxımından əhəmiyyətli hesab edilib. Bu mərhələdə tədris edilən məsələlər pedaqoji təhsil alan tələbələrin "təhsil müddətində dövlət tədris proqramları ilə yaxından tanış olması və onlarla işləyə bilməsi" (Fraenkel, 2012) baxımından əhəmiyyətli hesab edilib. Burada əsas məqsəd müəllimin peşə fəaliyyətində zəruri olan bilik və bacarıqlara yiyələnməsi və gələcək fəaliyyətinin istiqamətlərini dərk etməsindən ibarətdir. Təhsilin məzmununda həyata keçirilən islahatlar nəticəsində tədris proqramlarının xarakteri əsaslı şəkildə dəyişib. Müasir təhsil proqramları yalnız təhsilin məzmununu deyil, həm də onun reallaşdırılması yollarını və qiymətləndirmə vasitələrini əks etdirir. Bunu nəzərə alaraq məzmunla bağlı mühüm nəzəri biliklərlə yanaşı, həm də təlimin təşkilinə verilən tələblərin gözlənilməsi, dərsin forma və üsullarının düzgün təlim materiallarının məqsədəmüvafiq seçilməsi, qiymətləndirmə vasitələrinin müəyyən edilməsi vacib hesab olunur. Bundan əlavə, kurikulumun tətbiqi üzrə əldə edilən nəticələrin təhlil edilməsi, problemlərin aşkar olunması, onları doğuran səbəblərin müəyyənləşdirilməsi, buna əsasən növbəti mərhələdə müvafiq qərarların qəbul edilməsi kimi bacarıqlar da keyfiyyəti yüksəltmək istiqamətində müəllim üçün mühüm hesab edilir. Qeyd edilən məsələlər eksperimental fənnin "Təhsilin məzmunu (kurikulum) və onun elmi-nəzəri əsasları" adlı dördüncü fəsilində əhatə edilib. Fəsilin tədrisi müddətində auditoriya şəraitində əldə edilmiş bilik və bacarıqlar beşinci, "Məktəbin və sinfin idarəedilməsi metodologiyası" fəslinin tədrisi zamanı real məktəb şəraitində ilkin passiv təcrübələrdə araşdırmalar və təhlillərin aparılması yolu ilə tətbiq olunur. Bu mərhələdə gələcək müəllimlərin bilik və bacarıqlarındakı mövcud üstünlük və boşluqları aşkar etmək, problemlərin aradan qaldırılması istiqamətində işlər aparılır. Elə həmin mərhələ çərçivəsində nəzəriyyə ilə təcrübəni əlaqələndirmək və "öyrətmək" peşəsinin sirlərini tamamilə əxz etməyə əsaslanan fəal təcrübə yer alır. Müəllimin fəaliyyət və funksiyalarına daxil olan bütün məsələlərin layihələşdirilməsi və həyata keçirilməsini əhatə edən təcrübələr bu mərhələdə nəzərdə tutulur (Fraenkel, 2012).

Beləliklə, "Təhsilin əsasları" adlı eksperimental fənn çərçivəsində 1) Təhsil fəlsəfəsi və təlim prosesi; 2) Cəmiyyətin təhsil ehtiyacları və onların hüquqi təminatı; 3) Təhsildə dövlət siyasəti; 4) Təhsilin məzmunu (kurikulum) və onun elmi-nəzəri əsasları; 5) Təhsilin metodoloji (praktik) əsasları; 6) Təhsilin maliyyələşdirilməsi və keyfiyyətin yüksəldilməsində onun rolu" kimi fəsillər əhatə edilib.

Eksperimental fənnin tədrisi bu baxımdan daha çox müstəqil tədqiqatlar aparmaqla bilik və bacarıqları əldəetmə texnologiyalarına əsaslanır. Ona görə də tələbələrin təşəbbüskarlığını, yaradıcılığını məhdudlaşdıran ənənəvi tədris texnologiyalarından imtina edilməsi, onların yaradıcı fəaliyyətinə imkan verən, tədqiqatçılıq bacarıqlarını stimullaşdıran dərslərə geniş yer verilməsi daha məqsədəuyğundur. Yeni pedaqoji texnologiyaları və müasir təlim yanaşmalarını əks etdirən dərslərin üstünlük təşkil etməsi, təlim prosesində öyrənənin məsuliyyətini və müstəqilliyini artıran müxtəlif iş formalarından (kollektiv iş, qruplarla iş, cütlərlə iş, fərdi iş) istifadə olunması da keyfiyyətin artırılmasına zəmin yaradır.

Təlim prosesində dialoqa, məntiqi və tənqidi

təfəkkürün inkişafına, yaradıcı fəaliyyətə əsaslanan interaktiv metodlara üstünlük verilməlidir. Bununla da sərbəst düşünmə üçün real imkanlar açıla, pedaqoji prosesi tədqiqat prosesinə çevirmək olar. Təcrübə göstərir ki, öyrənənlərin onlara təqdim edilən hazır məlumatları yadda saxlamaqla deyil, həm kəmiyyət, həm də keyfiyyət tədqiqatları aparmaqla təlimə cəlb edilməsi daha məqsədəmüvafiqdir. Bunun üçün kəmiyyət tədqiqatlarının diskriptiv, korelyasiya, səbəb-müqayisə və eksperimental üsulları yeri gəldikcə, məqsədəuyğun şəkildə tətbiq edilməlidir. İlkin məlumatların tətbiqi, təhlili və sintezi yolu ilə zəruri məlumatları toplayıb, onlarla bağlı mühakimələr yürüdərək pedaqoji təhsildə nəzərdə tutulan məzmunun mənimsənilməsi də vacib amildir. Bunun üçün aşağıdakı təlim strategiyalarından istifadə edilə bilər: məlumat bazalarından (kitabxana və İnternet) məqsədyönlü istifadə; problem həlli; tədqiqat; hadisənin (video, audio, mətn) araşdırılması; müzakirə; tədqiqatların nəticələrinin təqdim edilməsi; dərs müşahidələri və məktəblərdə görüşlər; məsləhət saatları; müstəqil oxu və s.

Təlimin məqsədinin reallaşdırılmasına xidmət edən forma və üsullarının seçilməsi ilə yanaşı, öyrənənlərin tədqiqat imkanlarının daha da genişləndirilməsi, məlumat bazalarının zənginləşdirilməsi məqsədi ilə əhəmiyyətli hesab edilən əsərlərin elektron versiyasının təhsilalanlara təqdim edilməsi vacib amildir. Müxtəlif müşahidələr aparmaq, təhlil etmək, müzakirələrdə iştirak etmək, mühakimələr yürütmək məqsədi ilə uğurlu və nöqsanlı elektron dərs nümunələrinin tədris vəsaitlərinin sırasına daxil edilməsi keyfiyyətin artırılmasına təsir edir.

Eksperimental fənnin tədrisinin səmərəliliyini artırmaq üçün ali təhsil müəssisələrində müvafiq fənn kabinetinin yaradılması, otaqların iki tələbəyə bir kompüter olmaqla təchiz olunması və onların İnternetə çıxışının təmin edilməsi vacib şərtlərdəndir. Çünki tədqiqatlar aparmaq, elektron məlumat bazalarından məlumatlar əldə etmək, nəticələri ilə bağlı təqdimatlar və hesabatlar hazırlamaq hər bir təhsilalanın İKT-nin fəal istifadəçisinə çevrilməsinə yardımçı olur.

2013-2017-ci il pedaqoji kadr hazırlığı ilə məşğul olan ali təhsil müəssisələrinin məzunlarının nailiyyətləri Təhsil Nazirliyində MİQ imtahanının nəticələri baxımından təhlil edilib. 2013-cü ildən 2017-ci ilə qədər məzmun və texnologiyaları mərhələli təşkil edilmiş eksperimetnal fənn üzrə kurs almış "İbtidai sinif müəllimliyi" ixtisası üzrə bakalavriat səviyyəsinin nəticələri bu kursu keçməmiş digər ixtisaslar üzrə həmin illərin məzunlarının nəticələri ilə qarşılaşdırılıb. Qarşılaşdırma zamanı 2013-2017-ci illərdə məzunların 5 illik nəticələrilə MİQ imtahanında aşağıda qeyd olunan parametrlər üzrə nəticələri əsas götürülüb:

1. "36 və daha artıq bal toplayanlar" üzrə statistik göstəricilərə əsasən eksperimental fənn tədris edilən ali təhsil müəssisələrinin "İbtidai sinif müəllimliyi" ixtisasının məzunları ilə bu fənn tədris edilməyən digər ixtisas məzunlarının nəticələrinin qarşılıqlı müqayisəsi;
2. "36 və daha artıq bal toplayanlar" üzrə statistik göstəricilərə əsasən eksperimental fənn tədris edilməyən ali təhsil müəssisələrinin "İbtidai sinif müəllimliyi" ixtisasının məzunları ilə bu fənn tədris edilməyən digər ixtisas məzunlarının nəticələrinin qarşılıqlı müqayisəsi;
3. "48 və daha artıq bal toplayanlar" üzrə statistik göstəricilərə əsasən eksperimental fənn tədris edilən ali təhsil müəssisələrinin "İbtidai sinif müəllimliyi" ixtisasının məzunları ilə bu fənn tədris edilməyən digər ixtisas məzunlarının nəticələrinin qarşılıqlı müqayisəsi;
4. "48 və daha artıq bal toplayanlar" üzrə statistik göstəricilərə əsasən eksperimental fənn tədris edilməyən ali təhsil müəssisələrinin "İbtidai sinif müəllimliyi" ixtisasının məzunları ilə bu fənn tədris edilməyən digər ixtisas məzunlarının nəticələrinin qarşılıqlı müqayisəsi.
5. Eksperimental fənn tədris edilən Azərbaycan Dövlət Pedaqoji Universitetini, Azərbaycan Müəllimlər İnstitutunu (hazırda müstəqil ali təhsil müəssisəsi kimi fəaliyyət göstərmir, ADPU–ya birləşdirilib) və Gəncə Dövlət Universitetinin "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunların bu fənn tədris edilməyən digər ixtisasların məzunlarının 5 illik (2013-2017) nəticələri MİQ imtahanında "36 bal və daha artıq nəticələr" parametri üzrə qarşılıqlı

**Cədvəl 1** "36 və daha çox bal toplayanlar" parametri üzrə "Təhsilin əsasları" eksperimental fənni tədris edilməmiş BDU, SDU, LDU, NDU-da "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunlarla həmin fənn tədris edilməyən digər ixtisas məzunlarının beş illik nəticələrinin müqayisəsi

| | Eksperimental fənn üzrə təhsil almış qruplar | Eksperimental fənn üzrə təhsil almamış qruplar | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | İbtidai sinif müəllimliyi | Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | Coğrafiya müəllimliyi | Biologiya müəllimliyi | Fizika müəllimliyi | İnformatika müəllimliyi | İngilis dili müəllimliyi | Kimya müəllimliyi | Tarix müəllimliyi | Riyaziyyat müəllimliyi |
| **Azərbaycan Dövlət Pedaqoji Universiteti** | 79 | 71 | 78 | 60 | 49 | 77 | 81 | 79 | 67 | 63 |
| **Gəncə Dövlət Universiteti** | 80 | 71 | 76 | 64 | 20 | 59 | 74 | 72 | 72 | 60 |
| **Azərbaycan Müəllimlər İnstitutu və filialları** | 71 | 64 | 65 | | | 67 | 71 | | 61 | 48 |

müqayisə edilib. Əsas məqsəd dörd semestri əhatə edən bir fənn çərçivəsində pedaqoji təhsilin məzmun və texnologiyalarının imkanlarının pedaqoji kadr hazırlığına verilən tələblər baxımından dəyərləndirilməsidir. Müqayisələrin nəticələri cədvəl 1-də təqdim edilib.

Cədvəldən göründüyü kimi, ADPU-nun məzunları "İngilis dili müəllimliyi" ixtisası üzrə 2% daha yüksək, "Kimya müəllimliyi" ixtisası üzrə 79% olmaqla bərabər nəticə göstərib, "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisası üzrə 8%, "Coğrafiya müəllimliyi" ixtisası üzrə 7%, "Biologiya müəllimliyi" ixtisası üzrə 19%, "Fizika müəllimliyi" ixtisası üzrə 30%, "İnformatika" müəllimliyi ixtisası üzrə 2%, "Tarix" müəllimliyi" ixtisası üzrə 12%, "Riyaziyyat müəllimliyi" ixtisası üzrə isə 16% aşağı nəticə nümayiş etdiriblər.

Gəncə Dövlət Universiteti və Azərbaycan Müəllimlər İnstitutunun "İbtidai sinif müəllimliyi" ixtisası üzrə məzunları pedaqoji kadr hazırlığının bütün digər ixtisaslarından 4-60% arasında fərqlə daha yüksək nəticə göstərib.

Eksperimental fənn tədris edilən ali təhsil müəssisələrinin "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunların və bu fənn tədris edilməyən digər ixtisasların məzunlarının 5 illik (2013-2017) nəticələrinin MİQ imtahanında "48 bal və daha artıq nəticələr" parametri üzrə qarşılıqlı müqayisəsi zamanı cədvəl 2-də təqdim olunan məlumatlar müəyyən edilib.

Cədvəldən göründüyü kimi, "48 bal və daha artıq" parametrinə görə ADPU və "Təhsilin əsasları" fənni tədris edilən "İbtidai sinif müəllimliyi" ixtisasının məzunlarının nəticələri GDU-da "Kimya", ADPU və AMİ-də "İngilis dili" ixtisasları istisna olmaqla bu fənn tədris edilməyən digər yeddi ixtisas üzrə məzunların nəticələrindən daha yüksəkdir.

Beləliklə, 2013-2017-ci illərdə məzunların

**Cədvəl 2** "48 və daha çox bal toplayanlar" parametri üzrə ADPU, GDU və AMİ-də eksperimental fənn tədris edilmiş "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunlarla həmin fənn tədris edilməyən digər ixtisas məzunlarının beş illik nəticələrinin müqayisəsi

| | İbtidai sinif müəllimliyi | Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | Coğrafiya müəllimliyi | Biologiya müəllimliyi | Fizika müəllimliyi | İnformatika müəllimliyi | İngilis dili müəllimliyi | Kimya müəllimliyi | Tarix müəllimliyi | Riyaziyyat müəllimliyi |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| **Azərbaycan Dövlət Pedaqoji Universiteti** | 28 | 17 | 20 | 17 | 7 | 17 | 28 | 39 | 21 | 18 |
| **Gəncə Dövlət Universiteti** | 28 | 15 | 14 | 10 | 0 | 18 | 26 | 33 | 19 | 21 |
| **Azərbaycan Müəllimlər İnstitutu və filialları** | 16 | 11 | 12 | | | 17 | 18 | | 11 | 12 |

5 illik nəticələrinin MİQ imtahanında həm "36 bal və daha artıq", həm də "48 bal və daha artıq" parametrlərinə görə məzmun və texnologiyaları mərhələli tətbiq olunan "Təhsilin əsasları" eksperimental fənni tədris edilmiş "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunların nəticələri həmin ali təhsil müəssisələrində bu fənn tədris edilməyən, digər ixtisas məzunlarının nəticələrindən əhəmiyyətli dərəcədə yüksək olub.

"Təhsilin əsasları" eksperimental fənni tədris edilməyən Bakı Dövlət Universiteti, Sumqayıt Dövlət Universiteti, Lənkəran Dövlət Universiteti və Naxçıvan Dövlət Universitetinin "İbtidai sinif müəllimliyi" ixtisası üzrə məzunlarının və bu fənn tədris edilməyən digər ixtisaslar üzrə məzunların 5 illik (2013-2017) nəticələrinin MİQ imtahanında "36 bal və daha artıq", "48 bal və daha artıq" parametri üzrə qarşılıqlı müqayisəsi aparılıb.

Aparılmış təhlillər göstərir ki, bu parametr üzrə də məzunların nümayiş etdirdiyi nəticələrin birmənalı dəyərləndirilməsi asan deyil. Belə ki, Bakı Dövlət Universitetində "İbtidai sinif müəllimliyi" ixtisasını bitirənlər digər ixtisasların məzunlarından daha aşağı nəticə göstərdikləri halda, digər üç ali təhsil müəssisəsində "Kimya" (LDU və NDU) və "Azərbaycan dili və ədəbiyyatı" (NDU) ixtisası istisna olmaqla qalan yeddi ixtisas üzrə daha yüksək nəticə nümayiş etdirib. Təhlillərin nəticələri cədvəl 3-dəki kimidir.

Təhlillər zamanı BDU-nun "İbtidai sinif müəllimliyi" ixtisası üzrə 36 və daha artıq bal toplayan məzunların faizinin digər ixtisaslardan 24-37 faiz aşağı olması müşahidə edilib. LDU-nun "İbtidai sinif müəllimliyi" ixtisasını bitirənlər eyni parametr baxımından "Kimya" ixtisası üzrə məzunlardan 3%, NDU-da isə 12% az nəticə göstərib. Həmçinin NDU-nun "Azərbaycan dili və ədəbiyyatı" ixtisas üzrə məzunları "İbtidai sinif müəllimliyi" ixtisasını bitirənlərdən 4 % aşağıdır.

Eksperimental fənn tədris edilməyən ali təhsil müəssisələrinin "İbtidai sinif müəllimliyi" ixtisası üzrə məzunlarla bu fənn tədris edilməyən digər ixtisasları bitirənlərin 5 illik (2013-2017) nəticələrinin MİQ imtahanında "48 bal və daha artıq nəticələr" parametri üzrə qarşılıqlı müqayisəsi aparılıb (cədvəl 4).

Göründüyü kimi, 2013-2017-ci illərdə məzunların 5 illik nəticələrinin MİQ imtahanında "48 və daha çox bal toplayanlar" parametrinə görə BDU-nun "İbtidai sinif müəllimliyi" ixtisasının məzunları 48 bal toplaya bilməyib,

**Cədvəl 3** "36 və daha çox bal toplayanlar" parametri üzrə "Təhsilin əsasları" eksperimental fənni tədris edilməmiş BDU, SDU, LDU, NDU-da "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunlarla həmin fənn tədris edilməyən digər ixtisas məzunlarının beş illik nəticələrinin müqayisəsi

| | İbtidai sinif müəllimliyi | Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | Coğrafiya müəllimliyi | Biologiya müəllimliyi | Fizika müəllimliyi | İnformatika müəllimliyi | İngilis dili müəllimliyi | Kimya müəllimliyi | Tarix müəllimliyi | Riyaziyyat müəllimliyi |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| **Bakı Dövlət Universiteti** | 40 | 87 | 85 | 78 | 63 | 69 | | 83 | 79 | 82 |
| **Sumqayıt Dövlət Universiteti** | 81 | 64 | 64 | 52 | 18 | 63 | | 55 | 55 | 37 |
| **Lənkəran Dövlət Universiteti** | 69 | 68 | 66 | 48 | | 61 | 62 | 72 | 67 | 41 |
| **Naxçıvan Dövlət Universiteti** | 71 | 75 | 67 | 45 | | | 50 | 83 | 29 | 50 |

yəni bütün digər ixtisaslardan aşağı nəticə nümayiş etdirib. Sumqayıt Dövlət Universitetinin "İbtidai sinif müəllimliyi" ixtisasının məzunları "Coğrafiya", "Fizika" və "Riyaziyyat" ixtisaslarını bitirənlərin nəticələrindən 1-6 faiz arasında fərqlə yüksək nəticə göstərib. Digər 5 ixtisas üzrə ("Azərbaycan dili ədəbiyyatı", "Biologiya", "İnformatika", "Kimya", "Tarix") 8-14 faiz arasında fərqlə aşağıdır.

Lənkəran Dövlət Universitetinin "İbtidai sinif müəllimliyi"ni bitirənlər digər 8 ixtisas üzrə məzunlarla müqayisədə ("Fizika" ixtisası üzrə müsabiqədə iştirak edilməyib) 5-38 faiz fərqlə aşağı nəticə nümayiş etdirib, göstəriciləri isə Naxçıvan Dövlət Universitetinin "İbtidai sinif müəllimliyi" ixtisası üzrə məzunların digər 7 ixtisas ("Fizika" və "İnformatika" ixtisaslarını bitirənlər müsabiqədə iştirak etməyib) məzunların nəticələrindən yüksək olduğu müəyyən edilib.

Beləliklə, aparılmış təhlillərin nəticələri göstərir ki, birinci şəraitdə ("Təhsilin əsasları" fənni tədris edilən ADPU, GDU və AMİ-də) MİQ-in "36 və daha artıq" parametri üzrə nəticələrinə əsasən "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunlar digər ixtisas məzunları ilə müqayisədə 24 haldan 21-də (87,5%) yüksək, 2-də (8,3%) bərabər, 1 halda (4,5%) aşağı nəticə göstərib (cədvəl 5).

Eyni üsulla dəyərləndirmə "48 və daha artıq" parametri üzrə nəticələrə görə aparılıb. Müəyyən edilib ki, "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunlar digər ixtisas məzunları ilə müqayisədə 24 haldan 20-də (83,3%) yüksək, 1 halda (4.1%) bərabər, 3 halda (12,5%) aşağı nəticə göstərib (cədvəl 6).

İkinci şəraitdə də ("Təhsilin əsasları" fənni tədris edilməyən BDU, SDU, LDU və NDU-da) "36 və daha artıq bal toplayanlar" parametri üzrə "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunların nəticələri digər ixtisas məzunlarının nəticələri ilə müqayisədə 31 haldan 20-də (64,5%) yüksək, 11 halda (35,5%) aşağı nəticə nümayiş etdiriblər (cədvəl 7).

"48 və daha artıq" parametri üzrə nəticələrə görə aparılmış eyni xarakterli dəyərləndirmələr zamanı müəyyən edilib ki, "İbtidai sinif müəllimliyi" ixtisasının məzunlarının nəticələri digər ixtisas məzunlarının nəticələri ilə müqayisədə 31 haldan 10-da (32,5) yüksək,

**Cədvəl 4** “48 və daha çox bal toplayanlar” parametri üzrə “Təhsilin əsasları” eksperimental fənni tədris edilməmiş BDU, SDU, LDU, NDU-da “İbtidai sinif müəllimliyi” ixtisasını bitirən məzunlarla həmin fənn tədris edilməyən digər ixtisas məzunlarının beş illik nəticələrinin müqayisəsi

| | İbtidai sinif müəllimliyi | Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | Coğrafiya müəllimliyi | Biologiya müəllimliyi | Fizika müəllimliyi | İnformatika müəllimliyi | İngilis dili müəllimliyi | Kimya müəllimliyi | Tarix müəllimliyi | Riyaziyyat müəllimliyi |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| **Bakı Dövlət Universiteti** | 0 | 29 | 21 | 20 | 13 | | | 39 | 32 | 38 |
| **Sumqayıt Dövlət Universiteti** | 7 | 15 | 4 | 1 | 21 | | | 18 | 16 | 6 |
| **Lənkəran Dövlət Universiteti** | 6 | 11 | 13 | 12 | | 14 | 16 | 44 | 21 | 14 |
| **Naxçıvan Dövlət Universiteti** | 43 | 21 | 0 | 18 | | | 17 | 33 | 14 | 17 |

**Cədvəl 5** “Təhsilin əsasları” fənni tədris edilən ADPU, GDU və AMİ-də) “İbtidai sinif müəllimliyi” ixtisasını bitirən məzunların MİQ-in “36 və daha artıq” parametri üzrə nəticələrinin digər ixtisas məzunlarının nəticələri ilə müqayisəsi

| | İbtidai sinif müəllimliyi | Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | Coğrafiya müəllimliyi | Biologiya müəllimliyi | Fizika müəllimliyi | İnformatika müəllimliyi | İngilis dili müəllimliyi | Kimya müəllimliyi | Tarix müəllimliyi | Riyaziyyat müəllimliyi |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | **Qiymətləndirmə halı – cəmi 24** | | | | | | | | |
| **Azərbaycan Dövlət Pedaqoji Universiteti** | 79 | 71 | 78 | 60 | 49 | 77 | 81 | 79 | 67 | 63 |
| **Gəncə Dövlət Universiteti** | 80 | 71 | 76 | 68 | 20 | 59 | 74 | 72 | 72 | 60 |
| **Azərbaycan Müəllimlər İnstitutu və filialları** | 71 | 64 | 65 | | | 67 | 71 | | 61 | 48 |

**Cədvəl 6** "Təhsilin əsasları" fənni tədris edilən ADPU, GDU və AMİ-də) "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunların MİQ-in "48 və daha artıq" parametri üzrə nəticələrinin digər ixtisas məzunlarının nəticələri ilə müqayisəsi

| | İbtidai sinif müəllimliyi | Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | Coğrafiya müəllimliyi | Biologiya müəllimliyi | Fizika müəllimliyi | İnformatika müəllimliyi | İngilis dili müəllimliyi | Kimya müəllimliyi | Tarix müəllimliyi | Riyaziyyat müəllimliyi |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | **Qiymətləndirmə halı – cəmi 24** | | | | | | | | |
| **Azərbaycan Dövlət Pedaqoji Universiteti** | 28 | 17 | 20 | 17 | 7 | 17 | 28 | 39 | 21 | 18 |
| **Gəncə Dövlət Universiteti** | 28 | 16 | 14 | 10 | 0 | 18 | 26 | 33 | 19 | 21 |
| **Azərbaycan Müəllimlər İnstitutu və filialları** | 16 | 11 | 12 | | | 15 | 18 | | 1 | 12 |

21 halda (67,7) aşağı olub (cədvəl 8).

Nəticələr cədvəl 9-da təqdim edildiyi kimi ümumiləşdirilib.

Beləliklə, "36 bal və daha artıq", "48 bal və daha artıq" kimi parametrlərə görə əldə edilmiş nəticələrə görə pedaqoji təhsilin məzmun və texnologiyalarının mərhələli təşkili baxımından 2009-2017-ci illərdə eksperimental "Təhsilin əsasları" fənni tətbiq edilmiş ali təhsil müəssisələrinin (ADPU, GDU və AMİ) "İbtidai sinif müəllimliyi" ixtisası üzrə məzunların nəticələri həmin fənn tədris edilməyən digər ixtisasları bitirən məzunların nəticələri ilə müqayisədə 2013-2017-ci illərdə MİQ imtahanlarında əldə etdikləri 5 illik nəticələrə görə 48 haldan (24-ü "36 və daha artıq bal", 24-ü "48 və daha artıq bal") 41-də (21+20) yüksək, 3 (2+1) halda bərabər, 4 (1+3) halda aşağı nəticə nümayiş etdiriblər. Eksperimental fənn tətbiq edilməyən ali təhsil müəssisələrində (BDU, SDU, LDU, NDU) isə 62 haldan (31-i "36 və daha artıq bal", 31-i "48 və daha artıq bal") 30-da (20+10) yüksək, 32 (21+11) halda aşağı nəticə göstərib. Qeyd edilənlər cədvəl 10-da təqdim edildiyi kimidir.

Cədvəldən göründüyü kimi, pedaqoji təhsilin məzmun və texnologiyalarının beş mərhələsi baxımından tələblər gözlənilməklə proqramı tərtib edilmiş "Təhsilin əsasları" eksperimental fənni tədris edilmiş "İbtidai sinif müəllimliyi" ixtisası bitirən məzunlarının nəticələri həmin universitetlərin eksperimental fənn tədris edilməyən digər ixtisaslarının məzunlarının nəticələri ilə müqayisədə "yüksək" parametri üzrə 85,4% "bərabər" parametri üzrə 6,25%, "aşağı" parametri üzrə 8,3% faiz təşkil etdiyi müəyyənləşdirilib. Nəticələrin etibarlılığını təmin etmək məqsədi ilə eksperimental fənn tətbiq edilməyən ali təhsil müəssisələrində də "İbtidai sinif müəllimliyi" ixtisası üzrə məzunların MİQ imtahanlarında 5 illik nəticələrinin digər ixtisasları bitirən məzunların nəticələri ilə müqayisəli təhlilinin nəticələrinə görə "yüksək" parametri üzrə 48,4%, "bərabər" parametrinə görə 0%, "aşağı" parametrinə görə 51,6% təşkil edib. Beləliklə, eksperimental fənn tədris edilən ali təhsil müəssisələrində eksperimental qrup olan "ibtidai sinif müəllimliyi" ixtisasının məzunları digər qruplarla müqayisədə 4 halda (8,3%), eksperimental fənn tədris edilməyən

**Cədvəl 7** "Təhsilin əsasları" fənni tədris edilməyən BDU, SDU, LDU və NDU-da "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunların MİQ-in "36 və daha artıq" parametri üzrə nəticələrinin digər ixtisas məzunlarının nəticələri ilə müqayisəsi

| | İbtidai sinif müəllimliyi | Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | Coğrafiya müəllimliyi | Biologiya müəllimliyi | Fizika müəllimliyi | İnformatika müəllimliyi | İngilis dili müəllimliyi | Kimya müəllimliyi | Tarix müəllimliyi | Riyaziyyat müəllimliyi |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | **Qiymətləndirmə halı – cəmi 31** | | | | | | | | |
| **Bakı Dövlət Universiteti** | 40 | 87 | 85 | 78 | 63 | 69 | | 83 | 79 | 82 |
| **Sumqayıt Dövlət Universiteti** | 81 | 64 | 64 | 52 | 18 | 63 | | 56 | 56 | 37 |
| **Lənkəran Dövlət Universiteti** | 69 | 68 | 66 | 48 | | 61 | 62 | 72 | 67 | 41 |
| **Naxçıvan Dövlət Universiteti** | 71 | 75 | 67 | 45 | | | 50 | 83 | 29 | 50 |

**Cədvəl 8** "Təhsilin əsasları" fənni tədris edilməyən BDU, SDU, LDU və NDU-da "İbtidai sinif müəllimliyi" ixtisasını bitirən məzunların MİQ-in "48 və daha artıq" parametri üzrə nəticələrinin digər ixtisas məzunlarının nəticələri ilə müqayisəsi

| | İbtidai sinif müəllimliyi | Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | Coğrafiya müəllimliyi | Biologiya müəllimliyi | Fizika müəllimliyi | İnformatika müəllimliyi | İngilis dili müəllimliyi | Kimya müəllimliyi | Tarix müəllimliyi | Riyaziyyat müəllimliyi |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | **Qiymətləndirmə halı – cəmi 31** | | | | | | | | |
| **Bakı Dövlət Universiteti** | 0 | 29 | 21 | 20 | 13 | 21 | | 39 | 32 | 38 |
| **Sumqayıt Dövlət Universiteti** | 7 | 15 | 4 | 11 | 1 | 21 | | 18 | 16 | 6 |
| **Lənkəran Dövlət Universiteti** | 6 | 11 | 13 | 12 | | 14 | 16 | 44 | 21 | 14 |
| **Naxçıvan Dövlət Universiteti** | 43 | 21 | 0 | 18 | | | 17 | 33 | 14 | 17 |

**Cədvəl 9** Eksperimental fənn tədris edilən və edilməyən universitetlərdə "İbtidai sinif müəllimliyi" ixtisası üzrə məzunların MİQ imtahanının nəticələrinin digər ixtisaslar bitirən məzunların nəticələri ilə müqayisəsi

| 36 və daha artıq bal | | | | | 48 və daha artıq bal | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | 24 haldan | Eksperimental fənn tədris edilən ADPU, GDU, AMİ (faizlə) | 31 haldan | Eksperimental fənn tədris edilməyən BDU, SDU, LDU, NDU (faizlə) | | 24 haldan | Eksperimental fənn tədris edilən ADPU, GDU, AMİ (faizlə) | 31 haldan | Eksperimental fənn tədris edilməyən BDU, SDU, LDU, NDU (faizlə) |
| Yüksək | 21 | 87,5% | 20 | 64,5% | Yüksək | 20 | 83,3% | 10 | 32,5% |
| Bərabər | 2 | 8,3% | 0 | 0 | Bərabər | 1 | 4,1% | 0 | 0 |
| Aşağı | 1 | 4,5% | 11 | 35,5% | Aşağı | 3 | 12,5% | 21 | 67,7% |

**Cədvəl 10** Nəticələrin ümumiləşdirilməsi

| | **Eksperimental fənn keçilən ADPU, GDU, AMİ** | | **Eksperimental fənn keçilməyən BDU, SDU, LDU, NDU** | |
|---|---|---|---|---|
| | Cəmi 48 hal | Faizlə | Cəmi 62 hal | Faizlə |
| Yüksək | 41 (21+20) | 85,4% | 30 (20+10) | 48,4% |
| Bərabər | 3 (2+1) | 6,25% | 0 | 0 |
| Aşağı | 4 (1+3) | 8,3% | 32 (21+11) | 51,6% |

ali təhsil müəssisələri ilə eyni xarakterli müqayisədə isə məzunlar 32 halda (51,6%) aşağı nəticələr nümayiş etdiriblər.

Əldə edilmiş nəticələr belə qənaətə gəlməyə əsas verir ki, proqramı pedaqoji təhsilin məzmun və texnologiyalarının mərhələli təşkili əsasında hazırlanan "Təhsilin əsasları" eksperimental fənni tədris edilmiş məzunlar MİQ imtahanlarında əhəmiyyətli fərqlə yüksək nəticələr göstəriblər. Məlum olub ki, pedaqoji təhsilin məzmun və texnologiyaları, hətta bir fənn çərçivəsində (4 semestr, 270 saat) mərhələli təşkil edildikdə, daha yüksək nəticələrə nail olmaq mümkündür: 1,76 ( ≈ 2 dəfə) dəfə (85,4% / 48,4%)

**İstifadə edilmiş ədəbiyyat**


1. Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyası. http://www.e-qanun.az/ framework/ 13540
2. Fraenkel, J.R. (2012). How to design and evaluate research in education/ Jack Fraenkel, Norman Wallen, Helen, Hyun. — 8th ed.
3. MkBrayd, R. (2002). Beynəlxalq məsləhətçi, milli məsləhətçilər: Aydın Kazımzadə, Bəhram Şiriyev, Tərcüməçi: Aynur Balakişiyeva, Müəllim hazırlığı (pedaqoji təhsil, ixtisasartırma və yenidənhazırlanma), Yekun hesabat, Təhsil Sektorunun İnkişafı Layihəsi, Azərbaycan Respublikası Təhsil Nazirliyi.
4. Süleymanova, A.Y. (2014). "Təhsilin əsasları", Bakı, "Təhsil", 400 s.

# TƏHSİLALANLARIN NARKOTİK VASİTƏLƏRDƏN VƏ PSİXOTROP MADDƏLƏRDƏN QORUNMASI ÜZRƏ İŞİN TƏŞKİLİ

**PİRALI ƏLİYEV**
Pedaqogika üzrə elmlər doktoru, professor, Bakı Slavyan Universitetinin pedaqogika və psixologiya kafedrasının müdiri.
E-mail: piralibexbud56@mail.ru
https://orcid.org/0000-0003-2420-1125

**Məqaləyə istinad:**
Əliyev P. (2023). Təhsilalanların narkotik vasitələrdən və psixotrop maddələrdən qorunması üzrə işin təşkili. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 41–52

**Məqalə tarixçəsi**
Göndərilib: 22.12.2022
Qəbul edilib: 18.01.2023

**ANNOTASİYA**

Son vaxtlar dünyada gənc nəsil arasında narkotik vasitə və psixotrop maddələri qəbul edənlərin sayı getdikcə artmaqdadır. İnzibati qadağa və cəzaların verilməsinə baxmayaraq, bu sahədə müsbət nəticə əldə etmək müşkülə çevrilib. Bu araşdırmada məqsəd gənc nəslin zərərli vərdişlərdən qorunmasının optimal yollarını tapmaqdan ibarətdir. Bunun üçün ümumtəhsil məktəblərində təhsilalanların narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəsinin mövcud vəziyyətini öyrənmək məqsədilə müəllimlər, valideynlər və şagirdlər arasında anket sorğusu keçirilib. Suallar üzrə cavablar ümumiləşdirilib və iştirakçılar maarifləndirmə sahəsində ehtiyaclarına görə qruplaşdırılıb. Məqalədə aparılan araşdırmanın nəticəsi olaraq ümumtəhsil məktəblərində narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısının alınması üçün hazırlanan və tətbiq olunan maarifləndirici təhsil proqramı üzrə həyata keçirilən məqsədyönlü işlərin müsbət nəticəsindən bəhs olunur.

**Açar sözlər:** Narkotik vasitə və psixotrop maddə, qanunsuz dövriyyə, zərərli vərdiş.

# ORGANIZATION OF WORK TO PROTECT STUDENTS FROM DRUGS AND PSYCHOTROPIC SUBSTANCES

**PIRALI ALIYEV**
Doctor of Sciences in Pedagogy, Professor, Head of the Department of Pedagogy and Psychology of Baku Slavic University.
E-mail: piralibexbud56@mail.ru
https://orcid.org/0000-0003-2420-1125

**To cite this article:**
Aliyev P. (2023). Organization of work to protect students from drugs and psychotropic substances. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 41–52

**ABSTRACT**

Recently, the number of people taking narcotics and psychotropic substances among the young generation growing up in the world is increasing. Despite the imposition of administrative bans and penalties, it has become difficult to achieve positive results in this area. The purpose of this study is to find the optimal ways to protect the growing young generation from harmful habits. For this, we organized a survey among teachers, parents and students to find out the current situation of the use of narcotics and psychotropic substances by students in secondary schools. Responses to the questions were summarized and participants were grouped according to their educational needs. As a result of the research, an educational program was developed and implemented to prevent the use of narcotics and psychotropic substances in secondary schools. Targeted activities carried out under that program gave positive results.

**Keywords:** Narcotic drugs and psychotropic substances, illegal trafficking, harmful habit.

**Article history**
Received: 22.12.2022
Accepted: 18.01.2023

## GİRİŞ

Müasir dövrdə cəmiyyətin qarşısında duran əsas vəzifələrdən biri gənclərin narkotik vasitələrdən və psixotrop maddələrin qəbulundan qorunmasıdır. Dövlət gənc nəslin sağlamlığının qayğısına qalır və bu məsələnin həllini əks etdirən normativ hüquqi sənədlər qəbul edir.

«Azərbaycan Respublikası Konstitusiyası»nda[1], BMT-nin «Uşaq hüquqları haqqında Konvensiyası»nda[2], «Uşaq hüquqları haqqında Azərbaycan Respublikasının Qanunu»nda[3], «Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu»nda[4], «Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası»nda[5], «Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları)»nda[6], «Ümumi təhsil haqqında Azərbaycan Respublikasının Qanunu»nda[7], «Əhalinin sağlamlığının qorunması haqqında Azərbaycan Respublikasının Qanunu»nda[8], «Sanitariya-epidemioloji salamatlıq haqqında Azərbaycan Respublikasının Qanunu»nda[9] uşaq-gənclərin sağlamlığı məsələsinə geniş yer verilməsinə baxmayaraq, mütəxəssislərin fikrincə, dünya miqyasında narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin azalması barədə nikbin fikir söyləmək çətindir.

## PROBLEMİN TƏDQİQİ VƏZİYYƏTİ

Psixoloji və pedaqoji ədəbiyyatda narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısının alınması problemi tam öyrənilməyib, aparılan araşdırmalar isə daha çox tibbi və hüquqi xarakter daşıyır. Son illərdə nəzəri və praktik səviyyədə pedaqogikada gənclər arasında narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısının alınması sahəsində müəyyən tədqiqatlar aparılsa da (Beloqurov, 1999; Motuqina, 1997; Buyanov, 1990; Qabiani, 1990; Qurski, 1988; Makeyea, 2000; Özden, 1992 və b.), təhsil sistemində bu sahədə pedaqoji maarifləndirici konsepsiyanın olmaması, elm sahələrinin əlaqələndirilməməsi və mütəxəssislərin profilaktik fəaliyyətinin pedaqoji modellərinin həyata keçirilməsinə praktik yanaşmalar, maliyyələşdirmə məsələləri pedaqoji səylərin cəmləşməsinə ciddi maneə yaradır.

## PRAKTİK VƏZİYYƏT

Ümumtəhsil müəssisələrində narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısının alınması sahəsində müasir pedaqoji vəziyyətin təhlili profilaktikanın real həyatdan təcrid edilməsi ilə bağlı bir sıra ziddiyyətləri qeyd etməyə imkan verdi: nəzəriyyənin praktikadan geri qalması; bu sahədə sistemsiz təlim və tədris prosesi; müasir reallıqların qarşıya qoyduğu vəzifələri həll etmək üçün müəllimlərin pedaqoji təhsil səviyyəsinin yetərli olmaması. Bundan əlavə, makro-sosiumun gənc nəslə dağıdıcı təsirlərinin genişlənməsi praktik olaraq müəllimlərdən bu təsirlərə qarşı hazır olmalarını, məktəbdə vaxtında, əlaqələndirilmiş və yönəldilmiş tərbiyə işləri aparmaq bacarığı tələb edir. Uşaq və gənclərin narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısının alınması üzrə vahid tərbiyə konsepsiyasının mövcud olmaması bu sahədə

[1] Azərbaycan Respublikası Konstitusiyası. Bakı, 2014.

[2] BMT-nin Uşaq hüquqları haqqında Konvensiyası. Bakı, 1998.

[3] Uşaq hüquqları haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 1998.

[4] Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı: Hüquq ədəbiyyatı, 2009.

[5] Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası. "Azərbaycan müəllimi" qəz., 2013, 25 oktyabr.

[6] Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları). Bakı, 2010.

[7] Ümumi təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 2019.

[8] Səhiyyə haşiyələri / Alkoqolizm üzrə statistika. DST/ Avropa. 2004.

[9] Sanitariya-epidemioloji salamatlıq haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 1992.

aparılan işi çətinləşdirir və müəyyən nöqsanların olmasına gətirib çıxarır. Mövcud vəziyyəti öyrənmək və maarifləndirmə işində nəticəyə nail olmaq üçün Bakı və Sumqayıt şəhərlərində, habelə Abşeron rayonunun ümumi təhsil müəssisələrində işləyən 156 müəllimlə anket sorğusu təşkil olundu. Sorğu bir neçə parametrlə təhlil olundu. Məlum oldu ki, sorğuda iştirak edən müəllimlərdən yaşca ən kiçiyinin 24, ən böyüyünün isə 67 yaşı olub. Respondentlərin mütləq əksəriyyəti qadın (92,3%), yerdə qalanı isə kişi cinsinə (7,6%) mənsubdur. "Boş vaxtınızda hansı işlə məşğul olursunuz?" sualına "Hər gün ailəmlə ünsiyyət qururam" cavabını seçənlər (87 nəfər) ümumi iştirakçıların 55,7 faizini təşkil edir. "Həyatda sizin üçün dəyərli olan nədir?" sualına iştirakçıların 41 faizi (64 nəfər) "ailədə sağlam münasibət" cavabını seçib. Digər cavabların dinamikası aşağıdakı diaqramlarda əyani şəkildə göstərilir (Diaqram 1-7).

Problemə şagirdlərin yanaşmasını öyrənmək üçün Bakının Binəqədi rayonu 100 və 283 nömrəli, Nəsimi rayonu 44 nömrəli, Xətai rayonu 29 nömrəli, Yasamal rayonu 18 nömrəli, Suraxanı rayonu 279 nömrəli, Sabunçu rayonu 72 nömrəli, Nizami rayonu 229 nömrəli, Sumqayıt şəhər 2, 9, 17, 38 nömrəli, Xırdalan şəhər 6 nömrəli, Abşeron rayonu, Saray qəsəbəsinin 3 nömrəli ümumtəhsil məktəbinin şagirdləri arasında aparılıb. Sorğuda, ümumilikdə, VII-XI sinif olmaqla 1045 şagird iştirak edib ki, onlardan 528-i qadın, 521-i isə kişi cinsinin nümayəndəsidir. "BSQ və KSQ-nin nəticələrinə görə təhsil uğurunuzu necə qiymətləndirirsiniz?" sualına şagirdlərin 425-i "orta oxuyuram", 391-i "yaxşı oxuyuram", 164-ü "əlaçıyam", 69-u isə "zəif oxuyuram" cavabını verib. Digər sorğular üzrə dinamika aşağıdakı kimidir (Diaqram 8-14).

Valideynlərlə aparılan sorğunun təhlilindən məlum oldu ki, sorğuda iştirak edən 559 valideynin yaş həddi 28-45 arasındadır. Onlardan 175-i ali, 192-si tam orta, 104-ü orta ixtisas, 74-ü ümumi orta və 14-ü ibtidai təhsillidir. Valideynlərdən 520-si evli, 22-si boşanmış, 12-si dul və 5-i subaydır. Sorğuda iştirak edən valideynlərin 363-ü işsizdir. Sorğu üzrə dinamika aşağıdakı kimidir (Diaqram 15-21).

**Diaqram 1** Gənclər narkotik maddələrdən nə səbəbə istifadə edirlər?




**Diaqram 2** Zərərli vərdişlər haqqında hansı mənbələrdən öyrənirsiniz?




**Diaqram 3** Zərərli vərdişlər haqqında ən etibarlı məlumat mənbəyini qeyd edin



**Diaqram 4** Zərərli vərdişlər haqqında nə bilmək istərdiniz?




**Diaqram 5** Zərərli vərdişlər haqqında biliklərinizi hansı formada almaq istərdiniz?




**Diaqram 6** Uşağın sağlamlığını kim qorumalıdır?




## TƏHSİL MÜƏSSİSƏSİNDƏ MÖVCUD VƏZİYYƏTİN QİYMƏTLƏNDİRİLMƏSİNƏ AİD YANAŞMALAR

Təhsil müəssisələrində narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin profilaktikasının mövcud vəziyyətinin təhlili altı əsas yanaşmanın müəyyənləşdirilməsinə imkan verdi:

***Məlumatlandırma*** – narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin insan orqanizminə mənfi təsirləri haqqında məlumatın verilməsi; ənənəvi yanaşma kimi effektliliyinin xeyli aşağı olması; yəni bu sahədə bilik verilir, ancaq bunlar narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəyə mane olmur.

***Emosional yanaşma*** – bu zaman fərdin duyğuları, təcrübələri nəzərə alınır. Bu texnika olduqca təsirlidir, lakin yanaşmanı tətbiq edərkən bilmək lazımdır ki, yeniyetmələr artıq psixoaktiv maddələrdən istifadə edirlər.

***Sosial amillərin roluna əsaslanan yanaşma*** (Bandyra, 1977) – özünü tənzimləməyə və özünü idarə etməyə böyük əhəmiyyət verir, sosial amillərə həssaslıq uşağın biliyindən, bacarığından, dünyagörüşündən, inanclarından, əqidəsindən və öz gələcəyi ilə bağlı fikirlərindən asılıdır. Uşaqlar gələcək həyatında qarşılarına ciddi məqsədlər qoysalar belə, psixoaktiv maddələrin istifadəsi bu məqsədlərə çatmaqda birbaşa çətinliklər yaradır. Sosial təsirlərə qarşı həssaslıq özünü düzgün qiymətləndirməməkdə, özünə inamsızlıqda və cəmiyyətdə artan sosial ehtiyacları özündə təmin edə bilməməkdə göstərir. Hesab olunur ki, zərərli sosial vərdişlərin qarşısı psixoloji dözümlülüklə alına bilər, narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısını isə düzgün təlim-tərbiyə ilə almaq olar. Bir çox gəncin siqaret çəkməyi dayandırması və həmyaşıdları arasında müsbət liderlərin formalaşmasında bu yanaşmanın uğurlu təsiri vurğulanır (Bandyra, 1977).

***Həyati bacarıqların formalaşmasına əsaslanan yanaşma*** – insanlara fəaliyyətlərini idarə etməyə və istiqamətləndirməyə, başqaları ilə birlikdə yaşamaq qabiliyyətinin inkişafına, davranışı dəyişdirmə üsullarından istifadə

edərək xarici mühitə təsir etməyə imkan verir. Yeniyetmələrin müxtəlif sosial təsirlərə, o cümlədən narkotik istifadəsinə qarşı müqavimətini artırmaq məqsədi daşıyır və tədqiqatçılar tərəfindən perspektivli qiymətləndirilir (Botvin, Schinke, Orlandi, 1988).

***Narkotik vasitələrin və psixotrop maddələrin istifadəçisinin fəaliyyətində alternativ davranışa əsaslanan konsepsiya*** (Allison, 1989). Narkotik istifadəsi riskini azaltmaq üçün xüsusi müsbət fəaliyyətin inkişafına, fərdi şüuru inkişaf etdirməyə, əməkdaşlığa, peşəkar bacarıqların inkişafına, estetik münasibətlərin qurulmasına, yaradıcı və intellektual təcrübənin öyrənilib tətbiq olunmasına, deviant davranış qrupları üçün önləyici strategiyanın funksional ekvivalentliliyinin formalaşmasına yönəldilir (Allison, 1989).

***Sağlam həyat tərzinə əsaslanan yanaşma strategiyası*** (Belogurov, 1999). Aşağıdakı şəkildə ifadə olunur: "Maksimum dərəcədə sağlam seçim et". Sağlamlığı möhkəmləndirməyə əsaslanan konsepsiyasının əsasını həyat qabiliyyəti, sağlam şəxsiyyətin inkişafı, sağlam həyat tərzi təşkil edir və burada insan davranışı təcrid olunmuş şəkildə deyil, şəxsiyyətin sosiallaşması ilə birlikdə götürülür (Belogurov, 1999).

Uşaq və gənclərin narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəsinin qarşısının alınmasına dair yanaşmaların təhlili göstərir ki, müasir dövrdə onların effektliliyi kifayət qədər aşağıdır. Müəllimlər məktəb çərçivəsində xüsusi hazırlıqlı olmalı, bütün sağlam uşaqlarla sistemli şəkildə səmərəli profilaktik işlər aparmalıdır.

Məqsəddən asılı olaraq profilaktik proqramların aşağıdakı növlərindən istifadə oluna bilər:

***Universal yanaşma*** – narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısını almaq üçün əhaliyə ümumi xəbərdarlıq edilməsi; bütün iştirakçıların vahid risk faktorları var, fərdi risk faktorları qiymətləndirilmir, iştirakçılar seçilmir, bir mütəxəssis (hər hansı bir baza təhsili olan) çox sayda iştirakçı ilə işləyir, proqram əziyyətli deyil və maliyyə dəyəri aşağıdır (Kolesov, Turtsevich, 1988).

**Diaqram 7** Uşaqlara zərərli vərdişlər haqqında nə zaman məlumat verilməlidir?




**Diaqram 8** Gənclər narkotik maddələrdən nə səbəbə istifadə edirlər?




**Diaqram 9** Zərərli vərdişlər haqqında hansı mənbələrdən öyrənirsiniz?



**Diaqram 10** Zərərli vərdişlər haqqında ən etibarlı məlumat mənbəyini qeyd edin




**Diaqram 11** Zərərli vərdişlər haqqında nə bilmək istərdiniz?




**Diaqram 12** Zərərli vərdişlər haqqında maariflənməni hansı formada almaq istərdiniz?




***Seçiciyə görə yanaşma*** – narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin başlanmasının qarşısını almaq məqsədilə xəbərdarlıq. "Risk qrupu"na daxil olanlar və ümumilikdə fərdi risk dərəcəsindən asılı olmayaraq, onun hər bir üzvü üçün nəzərdə tutulub. Qrupa daxil olan uşaq və yeniyetmələrin zərərli maddələrdən istifadə riskini müəyyən edən xüsusi testlərdən istifadə olunur. Testlərdə iştirak etmək istəyənlər könüllü olaraq dəvət edilir.

***Göstəricilərə görə yanaşma*** (Makeyeva, 2000) – narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin ilk əlamətləri və bununla əlaqədar digər problemləri olan uşaq və gənclər üçün nəzərdə tutulub; iştirakçılar xüsusi üsulla seçilir, fərdi olaraq qiymətləndirilir, risk faktorları və davranış pozuntuları olduqda spesifik formada işləyir, təcrübəli heyət xüsusi formada (intensiv, ekstensiv) təlim təklif edir (Makeyeva, 2000).

Azərbaycanın və xarici ölkə alimlərinin əsərlərinin təhlili göstərdi ki, psixoloji asılılığın yaranması və inkişafının qarşısının alınması yollarını göstərən heç bir nəzəriyyəni mükəmməl saymaq olmaz. Uşaq və gənclərin narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəsinin qarşısının alınmasında pedaqoji komponentin rolu əsaslandırılmayıb. Ümumbəşəri dəyərlərin (sağlamlıq, sevgi, təhsil) düzgün tərbiyəsi uşaq şəxsiyyətinin və xarakterinin formalaşmasına əhəmiyyətli təsir göstərir. Narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəyə səbəb kimi uşaq və gənclərin ətraf mühitlə münasibətlərinin pozulmasını göstərmək olar. Başqa bir səbəb ailədir, bütün hallarda, uğursuz ailələrdə tərbiyə işinin düzgün qurulmaması buna gətirib çıxarır.

Narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəyə gətirib çıxaran səbəblərdən biri də bu sahədə *təhsil müəssisəsinin fəaliyyətinin az öyrənilməsidir.* Narkotik istifadəçiləri, narkotiklərin yayılması ilə mübarizə haqqında danışarkən, narkomaniyanın reallıqdan xəyal dünyasına qaçmaq cəhdi olduğunu başa düşürlər. Ona görə də narkomaniya ilə mübarizə əvvəlcə belə bir düşüncənin səhv olmasına yönəldilməlidir. Qarşıya qoyulan problemin həllində *tərbiyə işi sistemli, məqsədyönlü olmalıdır.* Narkotik vasitələrdən və psixotrop maddələrdən istifadə probleminin mənəvi tərəfi həm anlayışın özünüdərketmə, həm də qarşısının alınması strategiyasını təyin etmək baxımından çox əhəmiyyətlidir. Tərbiyə prosesində əxlaqın bərpası və dəyərlərin formalaşması bütün arzuolunmaz halların qarşısını ala bilər.

Narkotik vasitələrdən və psixotrop maddələrdən istifadə əleyhinə proqramların (kurikulumların) tərtibində beynəlxalq və yerli təcrübənin təhlilindən belə nəticəyə gəlmək olar ki, deviant davranışın qarşısının alınması sahəsində bir neçə yenilik təqdim olunub. Bunlardan biri də *Həyat bilgisi* fənn proqramı (kurikulumu) və dərsliyidir. Bu, hərtərəfli, müasir, geniş, əsaslı metodoloji proqram kimi zərərli xarici təsirlərlə mübarizəyə, uşaqlarda sağlam həyat tərzi formalaşdırmağa imkan verir. Keçən əsrin səksəninci illərinin ortalarından bu proqram ingilisdilli ölkələrdə istifadə edilirdi, sonra altı il ərzində dəyişməmiş və ya qismən uyğunlaşdırılmış bir formada, demək olar, qırx ölkədə, müstəqilliyin bərpasından sonra isə Azərbaycanda tətbiq olundu.

Həyati bacarıqlar uşaqların bir-biri ilə, onlara bilik, bacarıq və səriştə aşılayanlarla düzgün münasibət qurmasına, öz həyatına məsuliyyətlə yanaşıb sağlam qərarlar verməsinə, arzuolunmaz hallara qarşı yüksək müqavimət göstərmələrinə imkan verərək zərərli davranışları minimuma endirir. Təlim sayəsində insan bu biliyi tətbiq edir, tənqidi düşünməyə başlayır, düzgün qərarlar qəbul edir, özünü və başqalarını başa düşməyə çalışır, qarşısına məqsəd qoyur, ətrafdakıların ehtiyac və arzularını nəzərə alaraq başqaları ilə necə danışıq aparmağı bilir. Müəyyən edilib ki, narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısının alınması ilə məşğul olan müəllimlərin profilaktik işlərə hazırlıqlarının aşağıdakı müddəalar əsasında qurulması tələb olunur:

- narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəyə qarşı müqavimətin formalaşdırılmasına təhsil prosesinin tərkib hissəsi kimi baxılmalıdır;
- narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəyə qarşı maarifləndirici tədbirlər hazırlanmalı və tətbiq olunmalıdır.

Pedaqoji profilaktika ***üç əsas komponenti*** birləşdirir: uşaq və gənclərin xüsusi təlim və tərbiyəsi; hüquq-mühafizə orqanlarının dəqiq fəaliyyəti; yetkinlik yaşına çatmayanlar tərəfindən narkotik maddələrin istifadəsinə qarşı müsbət həyat alternativlərinin yaradılması (dövlətin gənclər siyasəti ilə müəyyən edilir).

**Diaqram 13** Uşağın sağlamlığını kim qorumalıdır?




**Diaqram 14** Uşaqlara zərərli vərdişlər haqqında nə zaman məlumat verilməlidir?




**Diaqram 15** Gənclər narkotik maddələrdən nə səbəbə istifadə edirlər?



**Diaqram 16** Zərərli vərdişlər haqqında hansı mənbələrdən öyrənirsiniz?




**Diaqram 17** Zərərli vərdişlər haqqında ən etibarlı məlumat mənbəyini qeyd edin




**Diaqram 18** Zərərli vərdişlər haqqında nə bilmək istərdiniz?




Pedaqoji maarifləndirmə aşağıdakı prinsiplər əsasında qurulmalıdır:

***1) Kompleks yanaşma prinsipi.*** Bu problemi həll etmək üçün məktəblərin, ailələrin, daxili işlər orqanları və səhiyyə sahəsində mütəxəssislərin, digər hökumət və ictimai təşkilatların birgə səyləri lazımdır;

***2) Sosial uyğunluq prinsipi.*** Təhsildə sosial sifarişlə razılaşdırılmış qarşılıqlı fəaliyyəti əks etdirmək və cəmiyyətin sağlam üzvlərinin tərbiyəsi məqsədini daşıyır;

***3) Fərqləndirmə prinsipi.*** Uşaq və gənclərin yaş və şəxsiyyətyönlü təhsili nəzərə alınaraq narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəsinin qarşısının alınmasının məqsədi, vəzifəsi, vasitələri və planlaşdırılan nəticələrinin müəyyənləşdirilməsini təmin edir;

***4) Çoxaspektlilik prinsipi.*** Profilaktik fəaliyyətdə müxtəlif yanaşmaların birləşməsini nəzərdə tutur;

***5) Aksioloji prinsip.*** Yeniyetmələrdə sağlam həyat tərzi, xeyirxahlıq, insanlara, cəmiyyətə, dövlətə və təbiətə hörmət kimi dəyərləri formalaşdırmağa xidmət edir.

Məktəblilərin narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəsi əleyhinə maarifləndirmə işinin planı *yeddi bloka bölünə bilər,* bunların hər biri məqsəd və vəzifələrə, idarəetmə, elmi və metodiki fəaliyyət proqramına malik olmalıdır:

- *təşkilati blok* – məktəb narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin profilaktikası ilə məşğul olan təşkilatlarla (daxili işlər, səhiyyə, media, digər dövlət və ictimai təşkilatlar) metodik işi əlaqələndirir və əməkdaşlığı təmin edir;
- *diaqnostik blok* – region məktəblərində narkotik vasitələrdən və psixotrop maddələrdən istifadə ilə bağlı vəziyyəti, uşaq və gənclərin məlumatlılıq səviyyəsini müəyyənləşdirmək üçün ilkin sorğu aparır, uşaqlarla psixodiaqnostik profilaktik iş aparır, narkotikə meyilliliyin mümkün amillərini və «risk qruplarını» aşkar edir;
- *elmi-metodik blok* – müəllimləri profilaktik işlərə hazırlayır, ümumtəhsil müəssisələrinin siniflərinin tərkibində «Bacarıqlı əllər» proqramını, uşaqlara həyati davranış bacarıqlarını və sağlamlıqlarına dəyərli münasibət bəxş etmələrini istiqamətləndirir;
- *maarifləndirici blok* – ailələrə məsləhət verir və bu işə dəstək verən valideyn qrupları ilə mühazirələr, seminarlar və təlimlər təşkil edir, uşağının böyüdüyü mikro-mühitdə valideynlərin uşaqlarının narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəsinə qarşı dözümsüz halına münasibət formalaşdırır, ailələrin

uşaqların erkən alkoqolizmə cəlb olunmasının qarşısını alır, uşaqlarla emosional davranış və onlarla qəddar rəftar hallarını aradan qaldırır;

• *informasiya bloku* – məlumatlılığı genişləndirir, bütün müsbət sosial qüvvələri narkotik vasitələrdən və psixotrop maddələrdən istifadə əleyhinə təbliğata cəlb edir, məktəbdə və rayonda aparılan işləri kütləvi informasiya vasitələrində əks etdirir, videoçarxlar, şəkillər nümayiş etdirir.

Təcrübə zamanı şagirdlərin yaş və cinsi xüsusiyyətləri nəzərə alınmaqla narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin səbəbləri və dinamikasını müəyyənləşdirmək üçün sosioloji tədqiqatlar aparılmalıdır. Bu zaman diqqət yetirilməsi vacib olan məqamları belə qruplaşdırmaq olar:

• mütəmadi olaraq sağlamlığın, hər bir insanın həyatı üçün vacib olduğunu aşılayan maarifləndirmə işinin təşkili;

• müəllimlərə elmi və metodik yardım göstərmək; təlimə və seminarlara mütəxəssislər: həkimlər, psixoloqlar, hüquqşünaslar cəlb etmək;

• narkotik vasitələrdən və psixotrop maddələrdən istifadə əleyhinə maarifləndirmə, sosial dəyişikliklərə adekvat münasibət, hər cür mənfi təsirlərin aradan qaldırılması ilə bağlı valideynlərlə işləri genişləndirmək;

• valideyn və müəllimləri uşaq və gənclərin asudə vaxtlarının təşkili işinə cəlb etmək;

• uşaq və gənclərin həyati bacarıqlarını inkişaf etdirməyə yönəlmiş interaktiv iş metodlarına diqqət yetirmək (fikirlərini aqressiv bildirməmək, xarici təsirlərə davamlılıq, sağlamlığa ziyan vurmamaq, konstruktiv tənqidi dinləmək);

• ümumi orta və tam orta təhsil səviyyəsində şagirdlərlə eksperimenti genişləndirmək, narkotik vasitələrdən və psixotrop maddələrdən istifadə ilə mübarizə tədbirlərinin əsas, həlledici əlaqəsi olan təhsil müəssisələrində sosial şərait yaratmaq üçün əldə edilmiş eksperiment nəticələrini dərinləşdirmək və nəzəri cəhətdən əsaslandırmaq;

• gənclərlə tütün və alkoqollu içkilər istifadə edən məktəb rəhbərliyini dəyişdirmək və onlara həvalə olunan müəssisələrdə bu halları tamamilə aradan qaldırmaq.

**Diaqram 19** Zərərli vərdişlər haqqında maariflənməni hansı formada almaq istərdiniz?




**Diaqram 20** Uşağın sağlamlığını kim qorumalıdır?




**Diaqram 21** Uşaqlara zərərli vərdişlər haqqında nə zaman məlumat verilməlidir?




*«Faydalı vərdişlər»* proqramında istifadə olunan metodik yanaşma ümumtəhsil məktəblərində tədris olunan fənlər üçün ənənəvi metodologiyaya alternativdir; dərslər qurularkən, dialektik «spiralvari yanaşma» ilə didaktikanın eklektik metodlarından istifadə edilib. Bu, müəllimə narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısının alınması problemini müvəffəqiyyətlə həll etmək, onu

bütün lazımi tədris-metodiki ədəbiyyat kompleksi ilə silahlandırmaq, sosiallaşmanın, özünütərbiyənin və uşağın şəxsiyyətinə xüsusi mütəşəkkil təsir göstərən üç əsas pedaqoji prosesin qarşılıqlı əlaqəsini təmin etməyə imkan verir.

## TƏHSİL MÜƏSSİSƏSİNDƏ ANTİNARKOTİK TƏBLİĞATIN FORMALARI

Məktəblərdə şagirdlərə seçmə yolla ardıcıl profilaktik baxış keçirmək lazımdır. Profilaktik baxışın məqsədi narkotizmə düçar olan məktəblilərin mümkün qədər erkən müəyyən olunması və davranışlarının tənzimlənməsi üzrə konkret tədbirlərin işlənib hazırlanmasıdır.

Narkomanlıq tendensiyalarının ilkin profilaktikasının vacib məqsədlərindən biri antinarkotik təbliğatdır. Seminar, «dəyirmi masa», konfranslar həkim-narkoloq, yaxud həkimlər tərəfindən xüsusi plan üzrə aşağıdakı qaydada aparılmalıdır:

- pedaqoji kollektivlə hər ay bir dəfədən az olmayaraq (məsələn, sinif rəhbərləri üçün keçirilən seminarlar çərçivəsində);
- valideynlərlə hər ay bir dəfədən az olmayaraq (hər ay keçirilən valideyn iclasları çərçivəsində);
- məktəblilərlə 3-4 mühazirə həcmində (xüsusi kurslar çərçivəsində).

Təxmini olaraq *effektiv məktəb proqramına üç komponent daxil edilir:* narkotiklərin insan orqanizminə ziyanını əks etdirən tədris komponenti; təhlükə ilə qarşılaşan və narkotiklərdən istifadə edən məktəblilərə kömək etmək üçün müdaxilə komponenti; məktəbin nizamnaməsinin və əsasnaməsinin tələblərini pozan uşaqlarla tərbiyəvi iş aparan intizam komponenti.

## NARKOTİK VASİTƏLƏRDƏN VƏ PSİXOTROP MADDƏLƏRDƏN İSTİFADƏ ƏLEYHİNƏ VALİDEYN-İCMA QRUPLARININ İŞİ

Narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin qarşısını almaq məqsədilə dəstək qruplarını yaratmaqda valideynlər mühüm rol oynayır. Onlar ailələri və ya icmaları narkotiklərin qəbulunun mənfi təsiri barədə məlumatlandıra, uşaqların fərdi və qrupdakı fəaliyyətinə sərhəd qoya, habelə bütün məktəblilərə yaşıdları tərəfindən edilən təzyiqlərə müqavimət göstərmək və müsbət alternativlər təklif etmək üçün birgə işləyə bilərlər. Təəssüflər olsun ki, hazırda belə qruplar azdır. Bir çox valideynlərin isə narkotik qəbulunun fəsadları haqqında elmi məlumatı yoxdur. Onlar narkotik qəbul edənlərin simptomlarını ayırd edə, narkotikləri fərqləndirə bilmir, narkotiklərin qəbulunu qadağan edən qanunları dərk etmirlər. Bir çoxu əmindir ki, onların uşaqları narkotiklərdən istifadə etmirlər.

## NƏTİCƏ

Təhsilalanların narkotik vasitələrdən və psixotrop maddələrdən istifadəsinin qarşısının alınması üçün həyata keçirilən pedaqoji-psixoloji profilaktika işi müəllimdən tədris fəaliyyətini optimallaşdırmağı, bu zaman diaqnostikadan, korreksiyadan və sağlam həyat tərzinə yönəlmiş təşkilati-metodik tədbirlərdən kompleks istifadə etməyi tələb edir.

Şagirdlər arasında narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin effektiv pedaqoji profilaktikası məktəbin aparıcı rolunu qoruyub saxlamaqla, müxtəlif təşkilatlarla inteqrasiya olunmuş, çoxölçülü və əlaqəli formada mümkündür. Təhsilalanlar tərəfindən narkotik vasitələrdən və psixotrop maddələrdən istifadənin effektli profilaktikası, psixoaktiv maddələrin istifadəsinin əhəmiyyətli dərəcədə azaldılması üçün müayinəyə əsaslanan erkən diaqnoz qoyulması əsas şərtdir. Beləliklə, qeyd olunan neqativ hallar üzrə profilaktik tədbirlərin rolu təhlil edilərkən məlum oldu ki:

1. Ümumtəhsil məktəblərində bütün şagirdlərlə məktəb fənləri çərçivəsində sisemli şəkildə xüsusi hazırlanmış müəllimlər tərəfindən aparılan profilaktik işin effektivliyi müsbət nəticə verir.
2. Müəllimlərin və valideynlərin iştirakı ilə təhsilalanlar üçün həyati bacarıqları formalaşdıran müasir metodologiya ilə ixtisaslaşdırılmış

bir proqram əsasında yeni modelin yaradılması zəruridir.

3. Yaşından və müəyyən sosial qrupa mənsubiyyətindən asılı olmayaraq bütün uşaqlara yönəlmiş pedaqoji profilaktik proqramların əsasını ümumbəşəri dəyərlərin (sağlamlıq, sevgi, təhsil) tərbiyəsi, uşaqlar və gənclər üçün şəxsiyyətin xarakterinin formalaşmasına həlledici təsir göstərən dəyərlər təşkil edir.

4. Narkotik vasitələrdən və psixotrop maddələrdən istifadə əleyhinə tibbi-pedaqoji profilaktik tədbirlər məktəblilər üçün narkotik maddələrin istifadəsinin real ehtimalını proqnozlaşdıran üç əsas komponentə əsaslanır: təhsilalanların təlim və tərbiyəsi; yetkinlik yaşına çatmayanların narkotik əleyhinə təhlükəsizliyini təmin edən hüquq-mühafizə orqanlarının dəqiq fəaliyyəti; yetkinlik yaşına çatmayanlar tərəfindən narkotik maddələrin istifadəsi üçün müsbət həyat alternativlərinin yaradılması (dövlət siyasəti ilə müəyyən edilir).

**İstifadə edilmiş ədəbiyyat**


1. Allison, F. (1989). Implications of the Ontario Student Drug Survey for School-based Prevention Proqrams. Alcohol and Drug Addiction Research Foundation. Toronto.
2. Azərbaycan Respublikası Konstitusiyası. Bakı, 2014.
3. Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası. "Azərbaycan müəllimi" qəz., 2013, 25 oktyabr.
4. Bandyra, A. (1977). Social Learning Theory Englewood Cliffs. NY Prentice Hall, 66p.
5. Belogurov, S.V. (1999). Populyarno o narkotikakh i narkomanakh. Kniga dlya vsekh. SPb.; M.: Nevskiy dialekt. Izdatel'stvo BINOM, 128 s.
6. Berezin, S.V., Lisetskiy, K.S., Motygina, I.A. (1997). Psikhologiya ranney narkomanii. Samara, 64s.
7. BMT-nin Uşaq hüquqları haqqında Konvensiyası. Bakı, 1998.
8. Botvin, G. (1990). et al Addictive Behavijbs, VI5 44-63 p
9. Botvin, G., Schinke, S.P., Orlandi, M.A. (1988). Crissis. V 10 162-77p.
10. Buhringer, G., Bohmer, K. (1991). Drug Prevention in School Documentation of the European Conference October. 24-34 p.
11. Burian, W. (1994). das Modlinger Modell Die psychodynamische Behahdlunq der Droqenabhanqiqheitunddiedrbeitin der therapeutischenGemeinsehaft Suchtkrankheit Dac Kalksburqen Modell und die Eutwichlbnq der Behandlunq Abhanqiqer Vien Sprinqer Verlad. 316-332 s.
12. Buyanov, M.I. (1990). Razmyshleniya o narkomanii. M.: «Prosveshcheniye», 69s.
13. Cadoret, R. Trouqhton, E.O., Gorman, T.W., Heywood, E. (1986). Arch qen Psychiat. vol 43, 1131-1136 p.
14. Əhalinin sağlamlığının qorunması haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 1997.
15. Gabiani, A.A. (1990). Na krayu propasti: narkomaniya i narkomany. M., 220s.
16. Gurski, S. (1988). Vnimaniye narkomaniya. M.: Meditsina, 144s.
17. Kapaklıkaya, İ. (1986). Uyuşturucu ve gençlik. Yeni Asya Yay. İstanbul.
18. Kolesov, D.V., Kazakov, L.X., Pleshkova, G.V. (1992). Profilaktika narkomanii i toksikomanii sredi shkol'nikov (posobiye dlya uchiteley). M. 19 s.
19. Kolesov, D.V., Turtsevich, S.V. (1988). Narkotizm: sushchnost' i profilaktika. M., 48 s
20. Makeyeva, A.G. (2000). Rannyaya profilaktika narkotizma u detey i podrostkov. M., 34 s.
21. Nikolayeva, L.P., Kolesov, D.V. (2000). Uroki profilaktiki narkomanii v shkole. Posobiye dlya uchitelya. Moskva-Voronezh, 30s.
22. Özden, S.L. (1992). Uyuşturucu madde bağımlılığı. Nobel tip kitabı. İstanbul, s.83.
23. Sanitariya-epidemioloji salamatlıq haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 1992.
24. Səhiyyə haşiyələri / Alkoqolizm üzrə statistika. DST/ Avropa. 2004.
25. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı: Hüquq ədəbiyyatı, 2009.
26. Uşaq hüquqları haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 1998.
27. Ümumi təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 2019.
28. Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları). Bakı, 2010.

# ICILS BEYNƏLXALQ QİYMƏTLƏNDİRMƏ NƏTİCƏLƏRİNİN TƏHLİLİ VƏ TƏHSİLİN İDARƏ OLUNMASINDA ROLU

**GÜNƏŞ ABBASOVA**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin magistrantı, Bakı şəhəri,
Nizami Sərxanov adına 256 nömrəli tam orta məktəbin coğrafiya müəllimi.
E-mail: gunes.abbasova.99@mail.ru
https://orcid.org/0000-0003-1993-6450

**Məqaləyə istinad:**
Abbasova G. (2023). ICILS beynəlxalq qiymətləndirmə nəticələrinin təhlili və təhsilin idarə olunmasında rolu. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 53–61

**Məqalə tarixçəsi**
Göndərilib: 13.02.2023
Qəbul edilib: 06.03.2023

## ANNOTASİYA

Müasir dövrümüzdə həyatın bütün sahələrində kompüter texnologiyalarından geniş istifadə olunur. Belə bir şəraitdə İKT avadanlıqlarından təhsil müəssisələrində də geniş istifadə edilməsi, bu barədə biliklərin inkişaf etdirilməsi aktualdır. Məhz bunun üçün Beynəlxalq Kompüter və İnformasiya Savadlılığı Tədqiqatı (International Computer and Information Literacy Study – ICILS) həyata keçirilir. ICILS iştirakçı ölkələrə şagirdlərin XXI əsrin tələblərinə uyğun kompüter və informasiya sahəsi üzrə bilik və bacarıqlarını, bu bacarıqlara yiyələnmək üçün lazım olan ev və məktəb mühitini qiymətləndirmək imkanı verir. Tədqiqatın məqsədi ICILS qiymətləndirmə nəticələrini müxtəlif ölkələr üzrə təhlil etmək və bu nəticələrdən təhsilin idarə olunmasında istifadə istiqamətlərini müəyyənləşdirməkdir. Mövzunu tədqiq etmək üçün ədəbiyyat araşdırması aparılaraq məlumatlar əldə edilib. Məlumatlar əsasında ICILS nədir, necə həyata keçirilir, 2018-ci ildə həyata keçirilən ICILS nəticələrinin təhlili və bu nəticələrdən təhsilin idarə olunmasında istifadə mexanizmindən bəhs edilir.

**Açar sözlər:** ICILS, ICILS-2013, ICILS-2018, Beynəlxalq qiymətləndirmə, təhsilin idarə olunması, Təhsil Nailiyyətlərinin Qiymətləndirilməsi üzrə Beynəlxalq Assosiasiya.

# ANALYSIS OF ICILS INTERNATIONAL EVALUATION RESULTS AND ITS ROLE IN EDUCATION MANAGEMENT

**GUNASH ABBASOVA**
Graduate student, Azerbaijan State Pedagogical University, Geography teacher at the secondary school No 256, Baku.
Email: gunes.abbasova.99@mail.ru
https://orcid.org/0000-0003-1993-6450

**To cite this article:**
Abbasova G. (2023). Analysis of ICILS international evaluation results and its role in education management. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 53–61

**ABSTRACT**

In our age, computer technologies are widely used in every field. In such a situation, the spread of ICT equipment in educational institutions, the knowledge, access, and use of this issue has become an urgent issue. The International Computer and Information Literacy Study (ICILS) is conducted for this purpose. ICILS enables participating countries to assess students' 21st-century computer and information skills and the home and school environment necessary to acquire these skills. The study aims to analyze the ICILS evaluation results for different countries and to determine the ways of using these results in educational administration. To examine the subject, 2 volumes of information on the subject were obtained by scanning the literature. Based on the data, what ICILS is, how it is applied, the analysis of the 2018 ICILS results, and how these results will be used in educational management were discussed. In addition, suggestions on how these results can be used in educational management are presented.

**Keywords:** ICILS, ICILS-2013, ICILS-2018, International assessment, educational administration, International Association for the Evaluation of Educational Achievement (IEA).

**Article history**
Received: 13.02.2023
Accepted: 06.03.2023

## GİRİŞ

Dünya ölkələri inkişaf etdikcə, iqtisadi və siyasi sahələrdə ciddi dəyişikliklər baş verdikcə təhsilin prioritetlərində də əhəmiyyətli yeniliklər meydana gəlir. Buna misal olaraq, müasir texnologiyanın təhsil sahələrinə daxil edilməsini, biliklə yanaşı bacarığa əsaslanan tələbatın çoxaldığı yeni bazar formasını və s. göstərə bilərik. Bəhs olunan bu dəyişiklikləri biz təhsil müəssisələrində təhsilverənlərin informasiya və kommunikasiya texnologiyaları (İKT) ilə işləməsində, müasir təhsil proqramlarının və bunlara uyğun dərs vəsaitlərinin hazırlanmasında görə bilərik (Abbaslı, 2021). Rəqəmsallaşmanın baş verdiyi bu dövrdə əksər sahələrdə dataların yaradılması və ötürülməsində İKT-nin rolu əvəzsizdir. Mövzu bu səbəbdən olduqca aktualdır və İKT haqqında biliklər, onlara çıxış, onlarla işləmək bacarığı təhsilin tərkib hissəsinə daxil edilib.

ICILS – Kompüter və İnformasiya Savadlılığı üzrə Beynəlxalq Tədqiqat 8-ci sinif şagirdləri arasında aparılır (Frallion və b., 2013). Dünyanın əksər ölkələrinin təhsil sistemlərində 8-ci sinifdə təhsilalanların orta yaşı 13,5 və daha yüksək olduqda, bu tədqiqat həmin siniflərdə oxuyan şagirdlər üzrə, 8-ci sinifdə təhsilalanların orta yaşı 13,5-dən kiçik olarsa, o zaman 9-cu sinif şagirdləri üzrə aparılır. Bu tədqiqat Təhsil Nailiyyətlərinin Qiymətləndirilməsi üzrə Beynəlxalq Assosiasiya tərəfindən təşkil olunur (İEA, 2018). Müxtəlif ölkələr ICILS tədqiqatına qoşulmaqla təhsilalanların kompüter və informasiya savadlılığı üzrə sahib olduqları bilik və bacarıqların nə səviyyədə olduğunu müəyyən etməklə bərabər, onlarda bunu inkişaf etdirmək üçün məktəb və ev şəraitinin nə dərəcədə əlverişli olub-olmadığını müəyyən edir. İlk tədqiqat 2013, ikincisi isə 2018-ci ildə təşkil olunub. Bu beynəlxalq qiymətləndirmə hər 5 ildən bir keçirildiyi üçün üçüncü tədqiqatın bu il (2023-cü ildə) keçirilməsi nəzərdə tutulub.

ICILS informasiya və kommunikasiya texnologiyaları bacarıqlarını 2 meyar əsasında qiymətləndirir:

***1) CİL (computer and information literacy) Kompüter və informasiya savadlılığı meyarı*** – kompüterin avadanlıqlarının istifadəsi, məlumatların toplanması və istifadə edilməsini qiymətləndirir. Bu meyar evdə, məktəbdə, iş yerində və başqa yerlərdə araşdırmalar, kommunikasiya yaratmaq, habelə istehsal etmək məqsədi ilə kompüterlərdən fərdi istifadə bacarıqlarını müəyyən edir.

***2) CT (computational thinking) Hesablama düşüncəsi meyarı*** – şagirdlərin hesablama düşüncəsinin ölçülməsinə, yəni problemlərin konseptuallaşdırılmasına və həlli əməliyyatlarının icrasına yönəlib.

2013-cü ildə keçirilən ilk ICILS-in əsas məqsədlərindən bəzilərinə nəzər salaq (Andreyevna, 2017):

1. Texnologiyanın cəmiyyətdə geniş yayıldığı müasir dövrdə şagirdlərin təhsilə, işə və həyata hazırlıq dərəcəsinin monitorinqi;
2. Müxtəlif ölkələrin təhsilalanlarının kompüter və informasiya sahəsi üzrə bilik və bacarıq səviyyələrinin ölkə daxilində müəyyən edilməsi və digər ölkələrin nəticələri ilə qarşılaşdırılması;
3. Müxtəlif ölkələrin təhsilalanlarının kompüter və informasiya sahəsi üzrə bilik və bacarıqlarına təsir edən əsas faktorların müəyyən edilməsi;
4. Təhsilalanların kompüter və informasiya sahəsi üzrə bilik və bacarıqlarının təkmilləşdirilməsində məktəb təhsilinin rolunun qiymətləndirilməsi və s.

Azərbaycanın ICILS tədqiqatında iştirakı 2023-cü il üçün nəzərdə tutulub. Ölkəmiz ICILS beynəlxalq qiymətləndirməsinin yalnız kompüter və informasiya savadlılığı (CİL) meyarı üzrə qiymətləndirməsində iştirak edəcək. Beləliklə, azərbaycanlı şagirdlərin kompüter və informasiya texnologiyaları ilə əlaqədar bilik və bacarıqları müəyyən edilərək, bu sahə üzrə ölkədəki ümumi vəziyyət təhlil olunacaq və müvafiq tədbirlərin görülməsinə imkan yaradılacaq (İbrahimov, 2021).

## ICILS BEYNƏLXALQ QİYMƏTLƏNDİRMƏ PROSESİ VƏ İŞTİRAKÇI ÖLKƏLƏRİN ƏLDƏ ETDİYİ TƏCRÜBƏLƏR

ICILS tədqiqatı vasitəsilə hesablama düşüncəsinin qiymətləndirilməsi şagirdlərin

məktəbdə kompüterlərlə problemi həlletmə bacarıqlarını necə inkişaf etdirdikləri barədə məlumatlar toplamaq və beynəlxalq səviyyəli müqayisələr aparmaq üçün bir fürsətdir. Bu qiymətləndirmə tədqiqatında da digər beynəlxalq tədqiqatlarda olduğu kimi müəllimlər və şagirdlərdən sorğu anketləri vasitəsilə müəyyən məlumatlar toplanır. Şagirdlər İKT avadanlıqlarının əlçatanlığı, evdə və məktəbdə İKT-dən istifadə və s., müəllimlər tədrisdə İKT-dən istifadə ilə bağlı yanaşmalar və bu sahədə peşəkar inkişafa dair sorğu anketlərini doldururlar. Təhsil müəssisələrindəki İKT koordinatorları isə məktəbdə İKT avadanlıqları və öyrənmə prosesinə dəstək vermək üçün onlardan necə istifadə edildiyi barədə sorğu anketini doldururlar. İştirakçı ölkələr milli səviyyədə İKT-yə dair kurikulum, resurslar, tədris proqramları, həmçinin kompüter və informasiya savadlılığının inkişafı ilə əlaqəli məlumatları bölüşürlər.

ICILS-də iştirak edən ölkələr keçirilən qiymətləndirmə prosesinə əsasən aşağıdakı təcrübələrə yiyələniblər (Andreyevna, 2017):

- test çərçivəsinin, qiymətləndirmə vasitələrinin və kompüter-informasiya savadlılığının inkişaf etdirilməsi istiqamətində görülən işlərlə tanış olunması;
- təhsilalanların ICILS qiymətləndirməsi üçün seçilmə formalarının öyrənilməsi;
- ICILS tədqiqat materialları ilə təhsil müəssisələrinin təlim-tədris materiallarının əlaqələndirilməsi prosesinin izlənilməsi;
- dataların əldə olunması, emalı, nəticələrin qiymətləndirilməsi və tədqiqatın monitorinqi üçün xüsusi kompüter proqramlarından istifadə edərək meta-mövzu üzrə praktiki tapşırıqların yerinə yetirilmə dərəcəsinin öyrənilməsi;
- hər hansı ölkənin digər ölkələrlə müqayisədə özünün kompüter və informasiya savadlılığı üzrə inkişaf səviyyəsini görməsi.

## 2018-Cİ İLDƏ KEÇİRİLƏN ICILS BEYNƏLXALQ QİYMƏTLƏNDİRMƏSİNİN NƏTİCƏLƏRİNİN TƏHLİLİ

2018-ci ildə aparılan ICILS beynəlxalq tədqiqatında yalnız CİL meyarı üzrə Çili, İtaliya, Qazaxıstan, Uruqvay ölkələri və Rusiya Federasiyasının Moskva şəhəri; hər 2 meyar üzrə Danimarka, Finlandiya, Fransa, Almaniya, Koreya Respublikası, Lüksemburq, Portuqaliya, ABŞ dövlətləri və Almaniyanın Şimali Reyn-Vestfaliya vilayəti iştirak edib. Dünyanın 12 ölkəsində 46 mindən çox şagird və 26 min müəllimi əhatə edən 2018-ci il ICILS təqdiqatlarının nəticələri dünya üzrə bu sahədə vəziyyəti və ölkələrin gələcək inkişafının səviyyəsinə dair olduqca maraqlı məqamları üzə çıxarır (Diaqram1). Qiymətləndirmə nəticələrinə



**Diaqram 2**




görə bu sahədə liderlik 557 bal ilə Danimarkaya məxsusdur. Sonrakı yerləri isə 549 balla Rusiya və 542 balla Koreya Respublikası tutur (Fraillon, 2018).

Nəticələr göstərir ki, tədqiqatda iştirak edən şagirdlərin 18%-i kompüter və informasiya savadlılığı (computer and information literacy – CIL) meyarının şkalasının ən aşağı səviyyəsinə belə, çata bilməyib. Ümumilikdə, şagirdlərin 25%-i qeyd olunan meyar üzrə ən aşağı nəticəni əldə edib. Onların 21%-i isə CIL meyarı üzrə iki dəfə daha yüksək səviyyəyə çataraq, kompüterlərdən məlumat toplama və idarəetmə vasitəsi kimi istifadəyə dair müstəqil işləmək bacarığına sahib olduğunu göstərib. Tədqiqatda iştirak edən şagirdlərin yalnız 2%-i CIL meyarı üzrə ən yüksək nəticəyə nail olub (Diaqram 2) (Andreyevna, 2017).

Cədvəl 1-dən göründüyü kimi, bütün ölkələr üzrə orta hesabla, şagirdlərin ən azı həftəlik istifadə etdiyi xüsusi proqramlar bunlardır: sənədlərin yazılması və redaktə edilməsi (33%), elektron cədvəldən istifadə etmək (21%), "slayd şou" təqdimatları yaratmaq (19%), videoların yazılması və ya redaktə edilməsi (28%), kompüter proqramları və ya tətbiqlər yazmaq (12%), rəsm və rəngləmə proqramından istifadə (20%) və musiqi istehsalı və ya redaktə edilməsi (20%). Şagirdlərin daha az faizi kompüter proqramları və ya skriptlər yazmağa (12%), veb-səhifə yaratmaq və ya redaktə etməyə (8%) vaxt ayırıb. Çilidə şagirdlərin həftə ərzində "musiqi istehsal etmək və ya redaktə etmək" üzrə göstəricisi 38%, Qazaxıstanda 39% olduğu halda, inkişaf etmiş ölkələr olan Finlandiyada 4%, Danimarka və Koreya Respublikasında isə 7% təşkil edir. Maraqlıdır ki, Danimarkada ümumi proqramlardan həftəlik istifadənin göstəricilərinin yüksək olmasına baxmayaraq, musiqi və veb-sayt istehsalı və ya redaktəsi üçün həftəlik İKT-dən istifadənin göstəriciləri çox aşağıdır. 2013 və 2018-ci illər üzrə göstəricilərin müqayisəsi zamanı Çili, Almaniya və Koreyada rəsm çəkmək və qrafik proqramlardan həftəlik istifadədə artımların olduğu ortaya çıxdı. Ümumiyyətlə isə bütün göstəricilər üzrə istifadəni əks etdirən ən yüksək ballar Danimarka və Qazaxıstanda, ən aşağı isə Koreya, Finlandiya və Şimali Reyn-Vestfaliyada (Almaniya) müşahidə olunub. Mütəxəssis tətbiqlərinin istifadəsinə dair ən yüksək bal Qazaxıstanda, ən aşağı bal isə Finlandiyada qeyd edilib (Fraillon, 2018). İştirak tələblərinə cavab verən iştirakçılar arasında ən aşağı göstərici 1% ilə "veb-sayt yaratmaq və ya redaktə etmək" kateqoriyası üzrə Finlandiyada müşahidə olunduğu halda, ən yüksək göstərici 84% ilə "sənədlər yazmaq və ya redaktə etmək" kateqoriyası üzrə Danimarkada müşahidə olunub.

Cədvəl 2-dən göründüyü kimi, orta hesabla ICILS-2018 ölkələri üzrə birbaşa sinif təlimatı vasitəsilə məlumat təqdim edən müəllimlərin demək olar ki, 2/3-si tez-tez və ya həmişə İKT-dən istifadə etdiyini bildirir (64%). Həmin müəllimlərin 1/3-dən çoxu aşağıdakı kateqoriyalar üzrə İKT-dən tez-tez və ya həmişə istifadə ediblər:

- Şagirdlərin öyrənmələri ilə bağlı valideynlər və ya qəyyumlarla ünsiyyət qurulması (45%);
- Şagirdin bütün sinif qrup müzakirələrinin və təqdimatlarının dəstəklənməsi (43%);
- Fərdi və ya qrup halındakı şagirdlərə düzəliş və ya təkmilləşmə işləri apararkən dəstək verilməsi (40%);
- Öyrənməni dəstəkləmək üçün sorğu-sual aparılması (40%);
- Şagirdlərin öyrənməsinin testlər vasitəsilə qiymətləndirilməsi (38%).

**Cədvəl 1** İnformasiya məhsullarını yaratmaq və ya redaktə etmək üçün müxtəlif ölkələrdəki şagirdlərin məktəbdə və ya məktəbdən kənarda həftəlik olaraq İKT-dən istifadə etmə faizləri

| Ölkə | İKT-dən ən azı həftəlik istifadə etdiyini bildirən şagirdlərin faizi: | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | Sənədlər yazmaq və ya redaktə etmək | Hesablamalar aparmaq, məlumatları saxlamaq və ya qrafiklər çəkmək üçün elektron cədvəldən istifadə etmək (Məsələn, MS Excel-dən istifadə etməklə) | Sadə "slayd şou" təqdimat yaratmaq (məsələn, "Power-Point"dən istifadə etməklə) | Videolar qeyd etmək və ya redaktə etmək | Kompüter proqramları, skriptlər və ya tətbiqlər yazmaq (Məsələn, Logo, LUA və ya Scratch) | Rəsm, rəngləmə və ya qrafik proqramların dan və ya tətbiqlərdən istifadə etmək | Musiqi istehsal etmək və ya redaktə etmək | Veb-sayt yaratmaq və ya redaktə etmək |
| Çili | 33 | 20 | 26 | 29 | 13 | 22 | 38 | 8 |
| Danimarka | 84 | 51 | 38 | 22 | 10 | 11 | 7 | 4 |
| Finlandiya | 22 | 6 | 5 | 21 | 4 | 9 | 4 | 1 |
| Fransa | 28 | 13 | 10 | 27 | 10 | 15 | 19 | 9 |
| Almaniya | 22 | 8 | 51 | 34 | 12 | 19 | 13 | 4 |
| İtaliya | 21 | 23 | 14 | 23 | 8 | 19 | 14 | 9 |
| Qazaxıstan | 34 | 41 | 41 | 37 | 19 | 20 | 39 | 24 |
| Koreya Respublikası | 14 | 8 | 8 | 12 | 9 | 13 | 7 | 3 |
| Lüksemburq | 32 | 17 | 15 | 37 | 13 | 23 | 20 | 10 |
| Portuqaliya | 33 | 16 | 21 | 29 | 12 | 17 | 27 | 8 |
| Uruqvay | 39 | 33 | 27 | 33 | 17 | 27 | 34 | 11 |
| ICILS 2018 ortalaması | 33 | 21 | 19 | 28 | 12 | 20 | 20 | 8 |
| İştirak tələblərinə cavab verməyən nümunə iştirakçıları | | | | | | | | |
| ABŞ | 49 | 20 | 17 | 30 | 12 | 29 | 15 | 6 |
| İştirak tələblərinə cavab verən nümunə iştirakçılarının müqayisəsi | | | | | | | | |
| Moskva (Rusiya Federasiyası) | 34 | 15 | 19 | 31 | 14 | 25 | 19 | 11 |
| Şimali Reyn-Vestfaliya (Almaniya) | 19 | 7 | 4 | 33 | 12 | 18 | 14 | 5 |

**Cədvəl 2** ICILS qiymətləndirilməsi üçün sorğu götürülən müxtəlif ölkələrdəki müəllimlərin dərslərdə müxtəlif öyrətmə texnikalarından istifadə üçün İKT-dən istifadə faizləri

| Ölkə | İKT-dən tez-tez istifadə etdiyini bildirən müəllimlərin faizi: | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Birbaşa sinif təlimatı vasitəsilə məlumatın təqdim edilməsi | Fərdi və ya qrup halındakı şagirdlərə düzəliş və ya təkmilləşmə işləri apararkən dəstək verilməsi | Şagirdin rəhbərlik etdiyi bütün sinif müzakirələrinin və təqdimatların dəstəklənməsi | Şagirdlərin öyrənmələrinin testlər vasitəsilə qiymətləndirilməsi | Şagirdlərə işlərinə dair rəylərin verilməsi | Nümunələrin təkrarlanması ilə bacarıqların öyrənilməsinin möhkəmləndirilməsi | Şagirdlər arasında əməkdaşlığın dəstəklənməsi | Şagirdlərlə ekspertlər və ya xarici mentorlar arasında ünsiyyət | Şagirdlərin öyrənmələri haqqında valideynlər və ya qəyyumlar ilə ünsiyyət | Araşdırma xarakterli öyrənmənin dəstəklənməsi |
| Çili | 66 | 44 | 44 | 36 | 40 | 45 | 39 | 25 | 36 | 50 |
| Danimarka | 77 | 49 | 55 | 66 | 42 | 51 | 34 | 42 | 62 | 59 |
| Finlandiya | 70 | 29 | 41 | 21 | 23 | 28 | 14 | 18 | 77 | 33 |
| İtaliya | 47 | 28 | 34 | 20 | 18 | 28 | 26 | 11 | 34 | 20 |
| Qazaxıstan | 62 | 55 | 57 | 58 | 50 | 57 | 56 | 45 | 52 | 55 |
| Koreya Respublikası | 67 | 43 | 35 | 28 | 28 | 44 | 32 | 24 | 23 | 39 |
| Portuqaliya | 58 | 28 | 36 | 39 | 25 | 34 | 21 | 17 | 31 | 21 |
| ICILS-2018 ortalaması | 64 | 40 | 43 | 38 | 32 | 41 | 31 | 26 | 45 | 40 |
| İştirak tələblərinə cavab verməyən nümunə iştirakçıları | | | | | | | | | | |
| Fransa | 60 | 31 | 21 | 19 | 13 | 22 | 12 | 10 | 37 | 22 |
| Almaniya | 48 | 18 | 25 | 15 | 14 | 23 | 12 | 8 | 25 | 22 |
| Luksemburq | 63 | 43 | 35 | 14 | 14 | 27 | 16 | 11 | 32 | 24 |
| ABŞ | 69 | 49 | 47 | 43 | 36 | 49 | 36 | 25 | 59 | 45 |
| Uruqvay | 37 | 34 | 28 | 31 | 24 | 30 | 32 | 19 | 13 | 37 |
| İştirak tələblərinə cavab verməyən nümunə iştirakçıları | | | | | | | | | | |
| Moskva (Rusiya Federasiyası) | 77 | 53 | 55 | 58 | 58 | 64 | 53 | 37 | 60 | 56 |
| Şimali Reyn-Vestfaliya (Almaniya) | 37 | 12 | 22 | 11 | 11 | 16 | 9 | 7 | 17 | 17 |

Müəllimlərin 1/3-dən azı aşağıdakı kateqoriyalar üzrə İKT-dən daha tez-tez istifadə etdiyini bildirib:

- Şagirdlərə işləri ilə bağlı rəy bildirilməsi (32%);
- Şagirdlər arasında əməkdaşlığın dəstəklənməsi (31%);
- Şagirdlərlə ekspertlər və ya kənar mentorlar arasında ünsiyyətə vasitəçilik edilməsi (26%).

Danimarka, Qazaxıstanda və Rusiya Federasiyasının Moskva şəhərində müxtəlif tədris təcrübələrində İKT-dən daha çox istifadə olunduğu halda, İtaliya və Almaniyanın Şimali Reyn-Vestfaliya vilayətində daha aşağı olub. İştirak tələblərinə cavab verən iştirakçılar arasında ən aşağı göstərici 7% ilə "şagirdlərlə ekspertlər və ya kənar mentorlar arasında ünsiyyət" kateqoriyası üzrə Şimali Reyn-Vestfaliyada müşahidə olunduğu halda, ən yüksək göstərici 67% ilə "birbaşa sinif təlimatı vasitəsilə məlumat təqdim etmək" kateqoriyası üzrə Koreya Respublikasında müşahidə olunub (Fraillon, 2018).

## TƏHSİLİN İDARƏ OLUNMASINDA ICILS BEYNƏLXALQ QİYMƏTLƏNDİRMƏ NƏTİCƏLƏRİNİN İSTİFADƏSİNƏ DAİR TÖVSİYƏLƏR

Yuxarıda da qeyd etdiyimiz kimi, ICILS qiymətləndirilməsinin keçirilməsində əsas məqsədlərdən biri odur ki, müxtəlif ölkələrdə 8-ci sinif şagirdlərinin kompüter və informasiya savadlılığının səviyyəsi, bu sahədə vəziyyətin nə yerdə olduğu müəyyən edilsin və buna müvafiq olaraq təkmilləşdirmə tədbirləri görülsün. Bu da birbaşa olaraq təhsilin idarə olunmasında öz əksini tapır. Belə ki, təhsilin idarə olunmasında ICILS qiymətləndirməsinin nəticələrindən müxtəlif ölkələrdə ən çox iki istiqamətdə istifadə olunur:

***1) Kurikulumda (təhsil proqramında) dəyişikliklər etmək.*** Bu özünü xüsusilə informatika fənninin kurikulumunda göstərir. Belə ki, informatika fənninin kurikulum çərçivəsini ICILS tədqiqatının çərçivəsi ilə uyğunlaşdırmaq, bu qiymətləndirmədə yüksək nəticə əldə etmiş ölkələrin təcrübəsinə yiyələnmək və bunu təkmilləşdirmə işləri aparmaq istəyən ölkələrin öz ölkəsinə uyğunlaşdırmasına çalışması nümunə kimi göstərilə bilər.

***2) Şagirdlərin İKT avadanlıqlarına əlçatanlığını artırmaq.*** ICILS nəticələrinə görə, şagirdlərin İKT avadanlıqlarına evdə də, məktəbdə də əlçatanlığı ilə onların bu sahədə savadlılığı arasında əlaqə mövcuddur. Belə ki, şagirdlərin kompüterlə həm evdə, həm məktəbdə, həm də istənilən başqa bir yerdə məşğul ola bildiyi ölkələrdə daha yaxşı nəticələr əldə edilib. Buna görə də İKT resurslarına şagirdlərin əlçatanlığını artırmaq yönündə işlər görmək lazımdır. Məhz Danimarkanın ən ön sırada olmasını şagirdlərin kompüter və digər avadanlıqlara çıxışının əlçatanlılığı ilə əlaqələndirə bilərik. Müxtəlif ölkələrdə məktəblər, xüsusilə də kənd məktəbləri kompüter avadanlıqları ilə tam təmin olunmayıb və mövcud avdanlıqlar işlək deyil və ya şagirdlər üçün əlçatan deyil. Şagirdlərin kompüterlərə əlçatanlığını artırmaq üçün dövlət məktəbləri kompüterlərlə təmin edə, həmçinin maraqlı tərəflərdən investisiyalar qəbul edə bilər. Məktəblər ənənəvi kağız-qələm formatından planşet, kompüter formatlı dərslərə keçid edə bilərlər (Haqverdiyev, 2010). Digər tərəfdən, kompüter avadanlıqlarının əlavə dəyər vergisindən azad olunması onların qiymətinin aşağı düşməsinə səbəb olar, bu isə şagirdlərin onları əldə etmə imkanlarını artırar.

Şagirdlərin İKT savadlılığına nail olmaq üçün əvvəlcə müəllimlərin İKT savadlılığını təmin etmək lazımdır. Bir çox ölkələrdə müəllimlərin İKT-dən istifadə bacarıqları aşağı səviyyədədir. Bunu pandemiya zamanı distant dərslərin təşkilində onların kompüterdən, müxtəlif proqramlardan istifadədə problemlə üzləşməsi də bir daha sübut etdi. Bu məqsədlə təhsili idarə edən şəxslər müəllimlərin İKT savadlılığını yüksəltmək üçün onları mütəmadi olaraq müxtəlif təlimlərə cəlb etməlidir. Müəllimlik ixtisasına hazırlaşan tələbələrin təhsil aldıqları müddətdə bu bacarıqların yüksəldilməsi yönündə işlər də görülməlidir (Haqverdiyev, 2010).

Tədqiqatlar nəticəsində məlum olub ki, şəhər və kəndlərdən qiymətləndirmədə iştirak edən

şagirdlərin CİL balları müxtəlif olub. Şəhərdə yaşayan şagirdlərdə bu daha yüksəkdir. Həmin şagirdlərin nəticələrinin daha üstün olmasının səbəbini tək İKT avadanlıqlarına çıxış ilə əlaqələndirmək düzgün olmazdı, burada həmçinin sosiallaşmaq amilini də nəzərə almaq lazımdır. Bəzi kəndlərdə lazımi avadanlıqların olmasına baxmayaraq, şagirdlər onlardan düzgün istifadə edə bilmir. Düşünürük ki, daha tez və effektiv nəticə almaq üçün onlayn təlimlər təşkil oluna, şagirdlərin fikir mübadiləsi, eyni zamanda baş verən yeniliklərlə bağlı məlumatların ötürülməsi üçün vahid platforma yaradıla bilər.

## NƏTİCƏ

Tədqiqatda ICILS beynəlxalq qiymətləndirmə prosesi, bu prosesdə müxtəlif ölkələrin əldə etdiyi təcrübələr, 2018-ci ildə keçirilən qiymətləndirmədə müxtəlif ölkələrdə müvafiq meyarlar üzrə həm şagirdlərlə keçirilən imtahanlar, həm də müəllimlərlə və şagirdlərlə aparılan sorğuların nəticələri nəzərdən keçirilib, 8-ci sinif şagirdlərinin məktəbdə və məktəbdənkənar, müəllimlərin isə dərsin təşkili zamanı İKT-dən istifadəyə üstünlük verdikləri istiqamətlər müəyyən edilib. ICILS nəticələrindən təhsilin idarə olunmasında, əsasən, iki istiqamətdə istifadə olunduğu müəyyən edilib: 1) kurikulumların təkmilləşdirilməsində; 2) şagirdlərin İKT avadanlıqlarına əlçatanlığının artırılmasında. Təhsilin idarə olunmasında bu nəticələrdən müəllimlərin İKT savadlılığının artırılması, şəhər və kənddə təhsil alan şagirdlərin sosiallaşması arasındakı fərqin azaldılması üçün onlayn platformaların yaradılması. Təhsilalanların İKT avadanlıqları ilə daha çox vaxt keçirməsi məqsədilə dərslərin kağız-qələm formatından kompüter-planşet formasına keçirilməsi aktual və prioritet vəzifələrdən biridir.

**İstifadə edilmiş ədəbiyyat**


1 Abbaslı, İ. (2021). Beynəlxalq qiymətləndirmə tədqiqatlarının təhsil sistemlərinin inkişafında rolu. Azərbaycan müəllimi. https://muallim.edu.az/news.php?id=17699

2 Andreyevna, M.R. (2017). Mezhdunarodnoye issledovaniye komp'yuternoy i informatsionnoy gramotnosti ICILS. Nauka v megapolise elektronnyy nauchnyy zhurnal dlya obuchayushchikhsya goroda Moskvy Science In A Megapolis.

3 ARTİ. (2022). https://www.arti.edu.az/az/newsd/1791-azarbaycanin-beynalxalq-qiymatlandirmalarda-istiraki

4 Fraillon, J., Ainley, J., Schulz, W., Friedman, T., Duckworth, D. (2018). IEA International Computer and Information Literacy Study International Report.

5 Fraillon, J., Ainley, J., Schulz, W., Friedman, T., Gebhardt, E. (2013). IEA International Computer and Information Literacy Study International Report.

6 Haqverdiyev, V. (2010). Orta məktəblərdə İKT-nin rolu. Rabitə dünyası. http://anl.az/down/meqale/rabitadunyasi/2010/dekabr/150294.htm

7 İbrahimov, T. (2021). Azərbaycan ICILS 2023-də iştirak edəcək. Azərbaycan müəllimi. https://muallim.edu.az/news.php?id=15546

8 İEA. (2018). https://www.iea.nl/studies/iea/ICILS

9 Qarayeva, S. (2021). Təhsildə qiymətləndirmə tədqiqatları: əsas meyar keyfiyyətdir. 525-ci qəzet. https://525.az/news/181159-tehsilde-qiymetlendirme-tedqiqatlari-esas-meyar-keyfiyyetdir.

# TƏDRİS İŞİNİN TƏŞKİLİNDƏ DİDAKTİK KONSEPSİYA VƏ PARADİQMALARIN ÖYRƏNİLMƏSİ YOLLARI

**KAMAL CAMALOV**
Pedaqogika elmləri doktoru, dosent, Naxçıvan Müəllimlər İnstitutu,
Azərbaycan Respublikasının Əməkdar müəllimi.
E-mail: kamal.camalov@gmail.com
https://orcid.org/0000-0003-1977-7250

**Məqaləyə istinad:**
Camalov K. (2023). Tədris işinin təşkilində didaktik konsepsiya və paradiqmaların öyrənilməsi yolları. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 62–68

**ANNOTASİYA**

Məqalədə tədris işinin təşkilində didaktik konsepsiya və paradiqmaların öyrənilməsi yolları tədqiq-təhlil süzgəcindən keçirilir. Qeyd edilir ki, vətəndaş tərbiyəsi ilə məşğul olan hər bir müəllim şəxsi keyfiyyəti, nüfuzu, peşəkarlığı, pedaqoji məharəti və s. ilə məktəbə və cəmiyyətə nümunə olmalıdır. Belə olduğu təqdirdə müəllim tədris prosesini təşkil edərkən şagirdlərdə həm də nümunəvi davranış normaları, əxlaqi dəyərlər, mənəvi tərbiyə, həmçinin dövlətçiliyə, onun atributlarına məhəbbət, hörmət və ehtiram hissi aşılaya bilər. Məqalədə o da vurğulanır ki, hər bir müəllim tədris prosesi zamanı şagirdlərdə idrak marağını formalaşdırmaqla onları müvafiq biliklərlə silahlandırmalı, təlimdə idrak prosesini didaktik məsələlərlə şərtləndirməli və təlim prosesinin yaradıcısına çevrilməlidir. Məqalənin nəticəsi onu göstərir ki, müəllim şüurluluq və fəallıq prinsipi ilə sıx bağlı olan sistematiklik və ardıcıllıq prinsipinə əməl etsə, şagirdlərə verilən biliklər də asanlıqla və şüurlu şəkildə mənimsənmiş olar. Həmçinin müəllim əyaniliyi uşaqlarda fikir formalaşdırmaq vasitəsi hesab etməli və uşaq psixologiyasının xüsusiyyətini əsas tutaraq, əyani təlimin zəruri olduğunu bilməlidir. Təlimdə uşaqların yaş xüsusiyyətləri nəzərə alınmaqla işin həm məzmunu, həm də metodiki formaları uşaqların gücünə uyğun olmalıdır. Bu halda onlar öz güclərinə əmin olar, bu da daha artıq müvəffəqiyyət əldə etmək üçün motivasiya yaradar.

**Açar sözlər:** Tədris işinin quruluşu, təlimin tərbiyə xarakteri, tədrisdə sistematiklik və ardıcıllıq, əyanilik, maraq və əyləncə.

**Məqalə tarixçəsi**
Göndərilib: 06.02.2023
Qəbul edilib: 24.02.2023

# WAYS OF STUDYING DIDACTIC CONCEPTS AND PARADIGMS IN THE ORGANIZATION OF TEACHING WORK

**KAMAL JAMALOV**
Doctor of Pedagogical Sciences, docent, Nakhchivan Institute of Teachers.
E-mail: kamal.camalov@gmail.com
https://orcid.org/0000-0003-1977-7250

**To cite this article:**
Jamalov K. (2023). Ways of studying didactic concepts and paradigms in the organization of teaching work. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 62–68

**ABSTRACT**

In the article, the ways of learning didactic concepts and paradigms in the structure of teaching work were analyzed. It is noted that every teacher who performs educational duties has personal qualities, reputation, professionalism, and pedagogical skills, etc. should be an example to the school and society. While organizing the educational process, every teacher should also instill in students exemplary behavior norms, moral values, and moral education duties, as well as love, respect, and reverence for statehood and its attributes. In the article, it is emphasized that every teacher should acquire known knowledge by forming the cognitive interest of the students during the teaching process, conditioning the cognitive process in the training with didactic issues, and becoming the creator of the training process. The conclusion of the article shows that if the teacher follows the principle of systematicity and consistency, which is closely related to the principle of awareness and activity, the knowledge given to the students will be easily and consciously mastered. Also, the teacher should consider visualization as a means of awakening the child's mind and should know that visual training is necessary based on the characteristics of child psychology. Similarly, if the knowledge given by the teachers is assimilated by the students thoughtfully, that knowledge will be solid, stronger, and unshakable. Taking into account the age characteristics of the children in the training, both the content and methodical forms of the work should be suitable for the children's strengths . Then they become confident in their strength, which gives them the energy and desire to achieve more success.

Keywords: The structure of teaching work, educational nature of training, systematicity and consistency in teaching, visibility, interest and fun.

**Article history**
Received: 06.02.2023
Accepted: 24.02.2023

## GİRİŞ

Təhsilalanların ümumtəhsil məktəblərində bilik qazanma prosesi təhsilin keyfiyyətinin yüksəldilməsində mühüm amildir. Ona görə də təhsilin keyfiyyətinin yüksəldilməsinin səciyyəvi xüsusiyyətləri, funksiyaları, imkan və yollarının necə formalaşdırılması pedaqoji prinsiplər əsasında müəyyənləşdirilməlidir. Nəzərə almaq lazımdır ki, uşaqlar tərəfindən cisim və hadisələrin elmi surətdə öyrənilməsi ümumi didaktik tələblər baxımından müəyyən edilir. Buna görə də təlimin tərbiyə xarakterli olması, təlim işindəki sistematikliyin, ardıcıllığın qorunması, müəllimin rəhbər rolu, təlim prosesində şagird idrakının və aktivliyinin əhəmiyyəti, həmçinin əyanilik vasitəsilə cisim və hadisələrin hissi cəhətdən qavranılması kimi problemlərin ciddi təhlil olunması elmi-pedaqoji cəhətdən xüsusi əhəmiyyət kəsb edir.

Bunu nəzərə alaraq, məktəblərdə tədris prosesinin quruluşuna verilən bir sıra ümumi didaktik tələbləri də müəyyən etməliyik. Çünki didaktika nəyi öyrətmək; necə öyrətmək; hansı üsul, vasitə və tərzdə öyrətmək kimi suallara cavab verilməsi kimi şərtləri müəyyən edir.

## TƏDRİSİN TƏRBİYƏEDİCİ XARAKTERİ

Biz təhsil-tədris işini tərbiyənin əsas və ən mühüm hissəsi hesab edirik. “Təlim prosesində tərbiyə işini səmərəli aparmaq, məktəblilərdə yüksək mənəviyyat, vətənpərvərlik hissi, əməksevərlik, müstəqillik formalaşdırmaq pedaqoji ustalığın daha bir elementidir” (Abdullayev, Abdullayeva, 2021). Deməli, müəllim tədris prosesini təşkil edərkən, planlaşdırmanı elə səviyyədə qurmalıdır ki, mənəvi tərbiyə işi unudulmasın. Əbu Əli ibn Sina yazırdı ki, uşaq 6 (altı) yaşına çatdığı zaman onu müəllimə tapşırın. Elə müəllimə tapşırın ki, o müəllim mömin, müdrik, doğrucul, ədalətli, nəzakətli, səliqəli, yüksək əxlaqi keyfiyyətlərə malik, vüqarlı, ağır təbiətli, şit hərəkətlərdən uzaq, eyni zamanda xoşxasiyyət, pak, təmiz, özünü məclisdə aparmağı bacaran, yemək-içməyin, danışmağın, söhbətin və ünsiyyətin qaydalarını bilən olsun (Rüstəmov, 2006).

Tədris işi mənəvi tərbiyənin ən mühüm komponentlərindən biridir. Biliklərin dolğun və möhkəm surətdə mənimsənməsi, bunlardan düzgün və yerində istifadə etmək, bildiyini vərdişə və bacarığa çevirmək səriştəsi sosial cəmiyyətin yaratdığı yeni insan xarakterinin mühüm cəhətləridir. Düzgün qurulan təlim, təhsil işi təhsilalanlarda dünyagörüşünün yaranmasına, ideyaların möhkəmlənməsinə səbəb olur. Təlim işi prosesində şagirdlərdə başladığı işi sona çatdırmaq, məqsədə nail olmaq, vaxta qənaət etmək bacarığı, düzgünlük, dürüstlük kimi əxlaqi keyfiyyətlər tərbiyə edilir. Hər dərsin ümumi məqsədlərindən başqa spesifik xüsusiyyətləri də vardır. Məsələn, təbiətşünaslıq dərsləri müşahidədə diqqətli olmağı öyrədir, təcrübənin özünə müraciət etmək adətləri yaradır. Riyaziyyat insanı dürüstlüyə, təfəkkürdə məntiqi ciddiliyə alışdırır. Azərbaycan dili yalnız dərslərdə deyil, ictimai həyatda da mədəni nitq vərdişləri formalaşdırır. Tarix dərslərində tarixi hadisələri düzgün qiymətləndirmək, elm və incəsənət xadimləri, tarixi şəxsiyyətlər ilə tanışlıq, məslək uğrunda mübarizə əzmi, məqsədə nail olmaq üçün inad göstərmək kimi müsbət xüsusiyyətlər tərbiyə edilir. Tədris predmetinin məqsədi təlim məşqləri vasitəsilə əldə edilən müəyyən vərdişlər qazandırmaqdır. Məktəblərimiz bu məşqlər üçün mövzu və ya material seçdikdə tərbiyəvi məqsədlər əsas yer tutur. Bu isə əxlaq tərbiyəsinin nə qədər böyük əhəmiyyət daşıdığını göstərir.

## TƏDRİSDƏ SİSTEMATİKLİK VƏ ARDICILLIQ

Məktəbin qarşısında duran məqsədlərdən belə bir nəticə hasil olur ki, tədrisin gedişi sistematik biliklərin mənimsənməsinə uyğun olmalıdır. Bir sıra burjua pedaqoqları (H.Spenser, E.Trondayk, C.Dyui və b.) təkid edirdi ki, tədris işində mühüm olan cəhət faktiki məlumatların müəyyən həcmi deyil, müstəqil surətdə bilik əldə etmək üsulları ilə həqiqəti tapmaq metodudur. Belə yanaşma gənclərin biliklərinin məhdudlaşdırılmasına səbəb olur. Məsələnin düzgün həll edilməsi, bilik həcmi və onları

mənimsəmə metodları bir-birinə qarşı qoyula bilməz. Məzmunun həlledici rol oynadığı nəzərə alınaraq şagirdlərə müvafiq mövzular üzrə elmi cəhətdən əsaslandırılmış biliklərin mənimsədilməsi üçün yeni öyrənmə üsulları aşılanmalıdır. Bu zaman tətbiq olunan metodlar öyrənməyə mane olmamalıdır. Faktiki biliklər əldə etmək vəzifəsi ilə şagirdlərdə təfəkkürü inkişaf etdirmək, onları müstəqil olaraq bilik kəsb etmək vəzifəsinə alışdırmaq işini bir-birinə qarşı qoymaq düzgün deyildir. Əksinə, şagirdlərdə öyrəndiyini biliyə, biliyi bacarığa, bacarığı isə vərdişə çevirmək işində ardıcıllığı inkişaf etdirməklə mənimsəməni daha effektiv etmək olar.

"Təhsilalmanın səmərəsi üçün ona təsir göstərən amilləri nəzərə almaq mühüm şərtdir" (İsmixanov, Vəliyeva, Mollayeva, 2016). Bu mülahizələrdən ümumtəhsil məktəbləri şəraitində həyata keçirilən ən mühümlərini təhlil edək:

a) *Yaxından uzağa.* Kiçik yaşlı məktəbliyə onu əhatə edən şeylər əlverişli və anlaşılandır; onunla tədris işini məktəblinin bilavasitə müşahidə etdiyi cisim və hadisələrlə tanışlıqdan başlamaq lazımdır. Disterveq bu qaydanı təsdiq edərək göstərir ki, hər şeyi uşağın istədiyi kimi etmək olmaz, çünki "insandan böyük məsafə və uzun zaman etibarilə uzaqda olan hər şey uşağa ruhən yaxındır" (Disterveq, 1963).

b) *Məlumdan məchula.* Uzaq və mürəkkəb olan yaxın və sadə olandan daha çox məlumdursa, o halda yaxındakından deyil, uzaqdakından başlamaq lazımdır. Çünki hər zaman və hər yerdə məchulu, məluma çevirmək üçün onları müqayisə etmək insanın zehni inkişafına səbəb olur. Məluma sahib olmaq üçün məchuldan başlamağı, qaranlıq içərisində işıq tapmaqla müqayisə etmək olar. "Məlumdan məchula" qaydası məntiqi və psixoloji əsaslara tamamilə uyğundur. Bu qayda artıq didaktik qaydalara daxil edilib.

c) *Sadədən mürəkkəbə.* Disterveq bu qaydanı başqa qaydalarla birləşdirir: "Daha asandan, daha çətinə". Bu tamamilə doğrudur və tədrisdə hər zaman qəbul edilməlidir. Aydındır ki, çətindən asana öyrənmə metodu düzgün deyil. Bu qayda tədrisdəki ardıcıllıq prinsipinə tamamilə zidd olardı. "Sadədən mürəkkəbə" qaydası daimi bir qayda deyildir. Bir çox hallarda sadə mürəkkəbdən daha çətin olur. Məsələn, hər hansı bir bitki haqqında məlumatı bütünlükdə mənimsəmək onun ayrı-ayrı hissələrini mənimsəməkdən asandır, halbuki bütöv bitki onun hissələrindən daha mürəkkəbdir.

## MÜƏLLİMİN HƏLLEDİCİ ROLU

Öyrətmə prosesində müəllimin rolunun nə qədər böyük olduğu yuxarıda verilən məlumatdan da görünür. Uşaqlara elmlərin əsasını öyrətmək, onları şüurlu intizama alışdırmaq, təlim və əməyə rəğbət ruhunda tərbiyə etmək hər bir müəllimin həlledici roludur.

Müəllim görüləcək işin məqsədini uşaqlara izah edir, onlarda motivasiya yaradır. Biliklərin mənimsənilməsi prosesində müəllimin rolu əsasdır. Buna baxmayaraq, pedaqoji prosesin təşkili zamanı onun metod və texnologiyaları öz istədiyi kimi seçməsi taktiki cəhətdən düzgün olmaz. Bunu konkret nümunələr əsasında nəzərdən keçirək. Müəllim buxarın genişlənmə və onun elastiki olmaq xassəsini, habelə buxar motorlarında bu hadisələrdən istifadə etmək qaydalarını nə qədər əhatəli şərh etsə və fikrini müvafiq təcrübələrlə əsaslandırsa da, məsələnin mahiyyəti barədə təhsilalanlarda zəruri bilik və bacarıqlar formalaşdıra bilməz. Şagirdlər özləri müəllimin göstərdiyi təcrübə (kartof tıxacının atılması, tıxacın silindrdə hərəkət etməsi) əsasında nəticə çıxarmaq səriştəsinə malik olsalar, onların qazandığı biliklər daha möhkəm olar. Habelə müəllim "heyvanların həyatı" mövzusunu öyrədərkən, yalnız öz hekayəsi, dərs kitabı və şəkillərlə kifayətlənməməlidir. Aydındır ki, belə mövzuların tədrisi zamanı şagirdlərin müəllimin rəhbərliyi ilə quşlar, balıqlar, xırda məməlilər kimi canlı obyektlər üzərindəki müşahidələri, zooparklara edilən ekskursiyalar mənimsəmə səviyyəsini artırır. Deməli, tədrisin təşkilinin daha effektli olması müəllimin düzgün metod seçmək bacarığından, müxtəlif metodlardan nə dərəcədə istifadə edə bilməsindən, hər bir halda bu

metodları necə müvəffəqiyyətlə birləşdirməsindən asılıdır. "Doğrudan da təlim prosesinin idarə olunmasında informasiyalar çox böyük rol oynayır" (İsmixanov, Bəxtiyarova, 2012). Təcrübəli müəllim tədris prosesini düzgün idarə etməyi, dərsi proqramın məzmununa, məqsəd və vəzifələrinə, habelə uşaqların yaş xüsusiyyətlərinə uyğun qurmağı bacarır. "Beləliklə, müəllim məktəbdə tədris olunan hər bir fənnin, hər bir mövzunun həyatda rolunu bildiyindən və bildiyini şagirdlərinə lazımınca anlatdığından təlim-tərbiyədə uğur qazana bilər" (Kazımov, 2009).

## ŞAGİRDLƏRİN DÜŞÜNCƏLİ VƏ AKTİV OLMASI

Məktəbdə müəllimin rəhbər rolu şagirdlərin aktivliyi, məntiqi düşüncə səviyyəsi ilə xarakterizə olunur. Hər bir şagird mənimsədiyi nəzəriyyəni, öyrəndiyi qaydaları praktikada yalnız o halda, düzgün tətbiq edə bilər ki, o, elmi əsaslandırma səriştəsinə malik olsun. Öyrənilən biliyi düşünmədən həyata keçirmək ancaq orta əsr sxolastik metodlarının xarakterinə uyğun haldır.

Əbunəsir Fərabi "Əzbər öyrənmək, yoxsa başa düşmək yaxşıdır?" sualını belə cavablandırır: "Başa düşmək, dərk etmək əzbər öyrənməkdən yaxşıdır. Əzbərləməyə can atan insan əsas məqsədə nail ola bilmir, sanki əbəs yerə çalışır. Başa düşmək anlamaqla, dərk etmək isə müqayisə aparmaqla, mahiyyəti bilməklə bağlıdır. İnsan bu istiqamətdə fəaliyyət göstərməyə can atarsa, yəni ümumiləşdirmələrə və qanunlara istinad edərsə, daha çox fayda əldə edəcəkdir. Deməli, başa düşmək, həqiqətən də əzbərləməkdən daha yaxşıdır" (Rüstəmov, 2006).

"Daima şagirdin qulağına çığırırlar, guya qıfa bir şey tökürlər, şagirdin vəzifəsi isə ona deyilən sözləri təkrar etməkdən ibarətdir. Mən istərdim ki, müəllim işin bu cəhətini düzəltsin, işin lap əvvəlindən şagirdin bacarıqlarına uyğun olaraq ona öz fikrini söyləmək imkanı versin, onda cisimlərə qarşı zövq oyatsın, şagird cisimləri seçməyi, bunların arasındakı fərqləri tapmağı bacarsın; müəllim bəzi vaxt şagirdə yol göstərsin, bəzən də bu yolu tapmağı öz öhdəsinə buraxsın" (Camalov, 2022).

Deməli, pedaqoqlar həmişə mövzunun mənasını anlamadan onun mexaniki surətdə öyrənilməsinə, əzbərçiliyə, habelə şagirdlərin yalnız hafizələrini birtərəfli "doldurmağa" qarşı daim mübarizə aparıb, uşağın müstəqil aktiv təfəkkürünün inkişaf etdirilməsinə əhəmiyyət verilməməsinə qarşı çıxıblar. Müasir psixopedaqogika da şagirdlərin müstəqil aktiv təfəkkürünü inkişaf etdirmək prinsipini həyata keçirir. Belə ki, şagirdlərdə fikir aydınlığını, məntiqi ardıcıllığı, yaradıcılıq qabiliyyətini daha da yüksəltmək üçün bir çox qabaqcıl məktəblərdə konkret didaktik təlim metodları (Qar topası, Əqli hücum, BİBÖ, Diskussiya, Söz assosiasiyaları, Venn diaqramı, İnsert, Rollu oyunlar, Debatlar, Yazılı debatlar, Ziq-zaq, Dəyirmi masa və s.) həyata keçirilir. Bu kimi təlim metodları ilə aşağıdakı üstünlükləri əldə etmək olar:

1. Şəxsi yaradıcı fəaliyyət sayəsində bilikləri müstəqil qazanmaq;
2. Təlim prosesinə yüksək maraq oyatmaq;
3. Produktiv (məhsuldar) təfəkkürü inkişaf etdirmək;
4. Təlim nəticəsində əldə olunan bilik və bacarıqların möhkəmliyini və faydalılığını artırmaq.

Unutmaq olmaz ki, "təlim prosesi zamanı uşağın psixi inkişafı üçün lazımi şərait təmin edilməlidir" (Həsənli, Camalov, 2011). Məktəbdə tədris işinin quruluşu uşağın aktivliyi prinsipinə əsaslanmalıdır. Məktəb uşaq təfəkkürünün müstəqilliyinin inkişaf etdirilməsinə, tədris fəaliyyətinin cürbəcür növləri ilə uşaq aktivliyinin inkişafına çalışmalıdır.

*Əyanilik.* Təlimdə əyanilik şagirdlərə mükəmməl təsir göstərərək onlarda müşahidəçiliyi, təfəkkürü, təxəyyülü inkişaf etdirir və fəallığı artırır. Əyaniliyin tətbiqi növləri çoxdur: əşya və obraz əyaniliyi; obrazlı nitq əyaniliyi; şərti təsviri əyanilik; dinamik əyanilik və s.

Tədrisdə əyanilik prinsipini düzgün tətbiq etmək üçün təlim prosesində onun nə qədər mühüm əhəmiyyət kəsb etdiyini elmi-pedaqoji prinsiplər və konsepsiyalarla əsaslandırmalıyıq. Əyaniliyin uşaqlara verdiyi biliklər onlar

tərəfindən xarici hisslərin köməyi ilə mexaniki şəkildə mənimsənilməlidir. Uşaqlar bu və ya başqa hadisəni əyani surətdə mənimsəməklə onun mahiyyəti və məzmunu ilə bağlı zəruri biliklərə malik olmaq imkanı qazanırlar. Bu formada öyrənmə sadədən mürəkkəbə, asandan çətinə, mücərrəddən konkretliyə doğru mərhələli mənimsəmənin keyfiyyətini artırır. Buna nail olmaqla təhsilalanlar öz zehinlərini zənginləşdirir və daha mürəkkəb bilik və vərdişləri mənimsəməyə qadir olurlar.

*Uşaqların yaş xüsusiyyətlərinin nəzərə alınması və uşaqlarda fərdi yanaşma zərurəti.* Təlim işində uşaqların yaş xüsusiyyətləri nəzərə alınmazsa müvəffəqiyyət qazanmaq olmaz. Hər bir sinifdə keçirilən tədris materialının həcmi, çətinliyi və məzmunu uşaqlar üçün əlverişli, anlaşılan olmalı, ictimai həyatın ən parlaq hadisələri haqqında canlı, obrazlı və təhsilalanları maraqlandıran mövzulara üstünlük verilməlidir. İşin həm məzmunu, həm də metodiki formaları uşaqların qabiliyyətinə uyğun olduqda, onlar daha çox maraq və həvəslə işləyirlər.

Müəllimin işi şagirdin, yalnız nöqsanlarını göstərməklə məhdudlaşmamalı, onun bir vətəndaş, rəqabətqabiliyyətli şəxsiyyət kimi formalaşmasına, habelə ictimai əməyə və əmək fəaliyyətinə hazırlamağa xidmət etməlidir.

## NƏTİCƏ

Nəticə onu göstərir ki, hər bir müəllim uşağın qavrayış və ya zehni inkişafına yaradıcı yanaşmalıdır. Təlimin üsul, vasitə və tərzləri müasir tələblərə uyğun qurulmalıdır. Ümumtəhsil məktəblərində təhsilin keyfiyyətinin yüksəldilməsi bilavasitə uşaqlarda elmlərin əsasını öyrənməkdə, onları şüurlu intizama alışdırmaqda, təlim və əməyə yanaşmaq ruhunda tərbiyələndirməkdə həlledici rol oynayar. Tərbiyə işini həyata keçirən hər bir müəllim şəxsi keyfiyyəti, nüfuzu, peşəkarlığı, pedaqoji məharəti və s. ilə məktəbə və cəmiyyətə nümunə olmalıdır.

Tədris prosesi təşkil edilərkən şagirdlərdə nümunəvi davranış normaları, əxlaqi dəyərlər, mənəvi tərbiyə, həmçinin dövlətçiliyə, onun atributlarına hörmət və ehtiram hissi aşılanmaqla bərabər, idrak marağı da formalaşdırılmalı, onlar məlum biliklərə yiyələnməlidirlər. Təlimdə idrak prosesi didaktik məsələlərlə şərtləndirilməli və təlim prosesi yaradıcı prosesə çevrilməlidir. Müəllim şüurluluq və fəallıq prinsipi ilə sıx bağlı olan sistematiklik və ardıcıllıq prinsipinə əməl edərsə şagirdlərə verilən biliklər də asanlıqla və şüurlu şəkildə mənimsənər. Y.A.Komenskinin sözləri ilə desək, fərqləndirilməsi lazım gələnlərin hamısı tam aydınlığı ilə fərqləndirilməli və bütün sonra gələnlər əvvəlkilərə əsaslanmalıdır (Komenski, 2012).

Hər bir müəllim əyaniliyi uşağın fikrini oyatmaq vasitəsi hesab etməli və uşaq psixologiyasının xüsusiyyətini əsas tutaraq əyani təlimin zəruri olduğunu bilməlidir. Didaktik təlim metodları düşüncəli surətdə mənimsəndikdə, o bilik daha möhkəm olar.

Hər bir müəllim uşaq təfəkkürünün müstəqilliyinin inkişaf etməsinə, tədris fəaliyyətinin cürbəcür növləri ilə uşaq aktivliyinin inkişafına çalışmalıdır.

Təlimdə uşaqların yaş xüsusiyyətləri nəzərə alınmaqla işin həm məzmunu, həm də metodiki formaları uşaqların gücünə uyğun olmalıdır. Belə olduqda onlar öz güclərinə əmin olarlar, bu da daha artıq müvəffəqiyyət əldə etmək üçün onlara motivasiya verər.

**İstifadə edilmiş ədəbiyyat**


1. Abdullayev, A.A., Abdullayeva, S.A. (2021). İbtidai təhsilin pedaqogikası. Bakı, ADPU-nun nəşriyyatı, 320 s.
2. Abbasov, A.N., Məmmədli, L.A., Əmirəliyeva, İ.B. (2022). Pedaqogika nəzəriyyəsi və tarixi. Bakı, Mütərcim nəşriyyatı, 464 s.
3. Camalov, K.H. (2022). Təlimin optimallaşdırılmasının üsul, vasitə və tərzləri. Peşə təhsili və insan kapitalı (Elmi-praktiki, metodiki jurnal). №1, səh.13-18.
4. Disterveq, F.A. (1963). Alman müəllimləri üçün rəhbər kitabı. Moskva, Tixomirov nəşriyyatı, 266 s.
5. Həsənli, O.Q., Camalov, K.H. (2011). Sosial psixopedaqogikada istedadlı uşaqlar problemi. Bakı, Elm və təhsil nəşriyyatı, 392 s.

6 İsmixanov, M.A., Vəliyeva, S.M., Mollayeva, E.Ə. (2016). Təhsilin əsasları. Bakı, ADPU-nun nəşriyyatı, 208 s.
7 İsmixanov, M.A., Bəxtiyarova, R.Ə. (2012). Məktəbin idarə edilməsi. Bakı, ADPU-nun nəşriyyatı, 236 s.
8 Kazımov, N.M. (2009). Pedaqoji ustalığın problemləri. Bakı, Çaşıoğlu nəşriyyatı, 296 s.
9 Komenski, Y.A. (2012). Böyük didaktika. Bakı, Elm və təhsil nəşriyyatı, 388 s.
10 Komenski, Y.A. (1961). Seçilmiş pedaqoji əsərləri. Bakı, Azərnəşr, 340 s.
11 Məmmədov, A.U. (1993). Təlimin psixoloji əsasları. Bakı, Maarif nəşriyyatı, 296 s.
12 Pestalotsi, İ.H. (1970). Seçilmiş pedaqoji əsərləri. Bakı, Maarif nəşriyyatı, 368 s.
13 Rüstəmov, F. (2006). Pedaqogika tarixi. Bakı, Nurlan nəşriyyatı, 752 səh.
14 Vaxterov, V.P. (1961). Əyani tədris metodu. Bakı, Azərnəşr, 216 s.

# UNİVERSİTET MUXTARİYYƏTİ: MALİYYƏ, AKADEMİK VƏ İNZİBATİ PERSPEKTİVDƏN YANAŞMA

**FİDAN SARIBƏYLİ**
Bakı Fransız Liseyi Təhsil Kompleksinin Azərbaycan dili və ədəbiyyatı müəllimi, Azərbaycan Respublikasının Təhsil İnstitutunun doktorantı, İstanbul Universiteti-Cerrahpaşa Ali təhsil müəssisələrinin idarəolunması ixtisası üzrə magistrantı. E-mail: saribaylifidan@gmail.com
https://orcid.org/0000-0001-9347-5475

**Məqaləyə istinad:**
Sarıbəyli F. (2023). Universitet muxtariyyəti: maliyyə, akademik və inzibati perspektivdən yanaşma. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 69–76

**ANNOTASİYA**

Universitet elmi fəaliyyətlə məşğul olan qurumdur. Bu ali təhsil müəssisəsi biliyi istehsal edir, öyrədir, təqdim edir və yayır. Bu dörd funksiya onun əsas prinsipini təşkil edir. Bacarıqlı, sorğu-sual etməyi bacaran, müəyyən fərziyyələr əsasında sual verən, milli-iqtisadi vəziyyət barədə düşünən vətəndaşlar yetişdirən universitet cəmiyyətə mühüm töhfələr verir. Universitetin bu vəzifəni yerinə yetirməsi və bununla bağlı müsbət nəticələr əldə etməsi üçün onun ideal şəraiti olmalıdır. Üzərinə götürdüyü rol və vəzifələri yerinə yetirmək üçün universitet mövcud siyasi vəziyyətdən uzaq durmağı bacarmalı, akademik, inzibati və maliyyə sahələrində öz seçim hüququna malik olmalıdır. Universitet muxtariyyəti akademik dünyanın rasional və rəqabətli təbiətinin əsasını təşkil etdiyindən, bu, akademik mühitdə çox müzakirə olunan və haqqında danışılan bir anlayışdır. Universitet muxtariyyətinin ölçüləri olan maliyyə, akademik və inzibati muxtariyyətləri kontekstdən çıxarmadan dəyərləndirmək, araşdırmaq lazımdır. Bu məqalənin məqsədi aparılan araşdırmalar çərçivəsində həm inzibati, həm də akademik muxtariyyət anlayışlarını müqayisə və təhlil etmək olsa da, maliyyə muxtariyyəti məsələsinə də toxunulur.

**Açar sözlər:** Universitet muxtariyyəti, maliyyə muxtariyyəti, akademik muxtariyyət, inzibati muxtariyyət.

**Məqalə tarixçəsi**
Göndərilib: 13.06.2022
Qəbul edilib: 05.12.2022

# UNIVERSITY AUTONOMY: AN APPROACH FROM FINANCIAL, ACADEMIC AND ADMINISTRATIVE PERSPECTIVES

**FIDAN SARIBAYLI**
Teacher of Azerbaijani language and literature at Baku French Lyceum Educational Complex, Doctoral Student of the Institute of Education of the Republic of Azerbaijan, Master's degree in Higher Education Management in Istanbul University-Cerrahpasa. E-mail: saribaylifidan@gmail.com
https://orcid.org/0000-0001-9347-5475

**To cite this article:**
Saribayli F. (2023). University Autonomy: An Approach from Financial, Academic and Administrative Perspectives. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 69–76

**ABSTRACT**

Universities are institutions engaged in scientific activities. This higher education institution produces, teaches, presents and disseminates knowledge. These four functions constitute its main principle. The university makes important contributions to the society by educating competent citizens who are able to ask questions behind certain assumptions, and think about the national-economic situation. In order to fulfill its assumed roles and responsibilities, the university must be able to stay away from the political power, and must have its own choice in academic, administrative and financial fields. Since university autonomy is the basis of the rational and competitive nature of the academic world, it is a concept that is widely discussed and talked about in the academic environment. Financial, academic and administrative autonomies, which are the dimensions of university autonomy, are an integral part of academic life. University autonomy depends on the maintenance of these three autonomies together, in a coherent manner. For this reason, financial, academic and administrative autonomy should not be separated. At the same time, the concept of university autonomy must be analyzed and understood without being taken out of context. The purpose of this article is to analyze, compare and contrast the concepts of administrative, academic and financial autonomy.

**Keywords:** Autonomy of universities, financial autonomy, academic autonomy, administrative autonomy.

**Article history**
Received: 13.06.2022
Accepted: 05.12.2022

## GİRİŞ

Muxtariyyət dedikdə, müəssisə və ya təşkilatın müvafiq qanunvericilik əsasında özünü idarəsi başa düşülür. Təhsildə muxtariyyət elm və düşüncə azadlığının hüquqi təminatıdır. XIX əsrdə Almaniyanın Berlin Universitetində əsası qoyulan azadlıq-muxtariyyət haqqında müzakirələrin ABŞ-da "1940-cı il Bəyannaməsi" olaraq adlandırılan manifestlə davamı, Birləşmiş Millətlər Təşkilatı, Avropa Şurası və YUNESKO kimi beynəlxalq təşkilatların diqqətini cəlb etməsi, şübhəsiz ki, universitetlərin muxtariyyətinin təmin edilməsinin zəruriliyinə işarə edir.

YUNESKO-nun ali təhsilli kadrların statusu ilə bağlı tövsiyəsində muxtariyyət: "Ali təhsil müəssisələrinin akademik tədqiqatları, fəaliyyət qaydaları, idarəetmə və digər fəaliyyətləri baxımından effektiv qərar qəbul etmək üçün zəruri olan özünüidarəetmə" kimi müəyyən edilir (Alpkaya, 2001). Ali təhsil müəssisələrinin muxtariyyəti və akademik azadlıq haqqında Lima bəyannaməsində isə anlayış belə izah olunur: "Muxtariyyət ali təhsil müəssisələrinin daxili fəaliyyəti, maliyyə işləri və idarə olunması ilə bağlı qərarların qəbul edilməsində, təhsil, tədqiqat və başqa əlaqəli fəaliyyətlərdə öz siyasətlərini formalaşdırmaqda digər qüvvələrdən asılı olmamasıdır" (Lima Bəyannaməsi, 2003).

İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı (OECD) tərəfindən 2003-cü ildə nəşr olunan, ali təhsil idarəçiliyinin dəyişən strukturunun və ömürboyu təhsil üçün davamlı strategiyaların müzakirə edildiyi "Təhsil siyasətinin təhlili" hesabatında universitetin muxtariyyəti səkkiz meyarın mövcudluğu ilə əlaqələndirilir (Ceran, 2013):

- Daşınmaz əmlaka və digər avadanlıqlara sahib olmaq;
- Ssuda ilə fond yaratmaq;
- Yaradılan resursları müstəqil şəkildə öz məqsədləri üçün xərcləyə bilmək;
- Akademik proqram və dərsin məzmununu müəyyən edə bilmək;
- Akademik heyətin işə qəbulu və işdən çıxarılması barədə qərar qəbul etmək;
- İşçilərin əmək haqqını müəyyən edə bilmək;
- Tələbə kvotalarını müəyyən edə bilmək;
- Tələbələrin ödəməli olduqları təhsil haqqını müəyyən edə bilmək;

Muxtariyyət anlayışı akademik aləmdə çox müzakirə edilən, ortaq fikrin əldə olunmadığı və hər kəsin özünə uyğun şərh etdiyi bir anlayışdır. Lakin "Təhsil siyasətinin təhlili" hesabatında universitet muxtariyyət meyarlarından, Lima bəyannaməsindən və YUNESKO-nun müvafiq tövsiyəsindən universitet muxtariyyətinin üç ölçüsünün olduğu qənaətinə gələ bilərik: maliyyə, akademik və inzibati muxtariyyətlər.

Akademik muxtariyyət tədqiqtaçıların elmi araşdırmalarını heç bir kənar təzyiqə məruz qalmadan sərbəst seçmək, həyata keçirmək və nəticələrini elan etmək azadlığı kimi müəyyən edilir. İnzibati muxtariyyətə sahib olan universiteti demokratik şəkildə öz üzvləri idarə edir .

İnzibati və akademik muxtariyyətin əsasını təşkil edən maliyyə muxtariyyəti (Feyzioğlu, 1981) təhsil müəssisələrinin onlara ayrılan resursları, büdcələrini, bir sözlə, xərclərini özlərinin idarə etmələri ilə yanaşı, müstəqil olaraq müxtəlif qanuni mənbələrdən maliyyə əldə etmək hüququna sahib olmaları deməkdir.

1990-cı illərdən başlayaraq inkişaf etmiş ölkələr ali təhsil müəssisələrinin muxtariyyətini xeyli inkişaf etdirib, məsələ ilə bağlı məqalələrin sayı da artıb. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununda təhsil müəssisəsinin muxtariyyətinin müvafiq icra hakimiyyəti orqanı tərəfindən dövlət təhsil müəssisəsinə verilən müstəqillik olduğu qeyd edilsə də, onun nələrdən ibarət olduğu məlum deyil. Azərbaycandakı pedaqoji mənbələri nəzərdən keçirərkən universitetlərin muxtariyyəti ilə bağlı hər hansı bir araşdırmaya rast gəlmədik və ölkəmizdə ali təhsil müəssisələri ilə bağlı daha çox pedaqoji məsələlərin tədqiqat obyektinə çevrildiyinin şahidi olduq. Lakin dünyanın innovativ pedaqoji mənbələrində muxtariyyətin universitet üçün aktual bir məsələ olduğu aydın şəkildə nəzərə alınır. Universitetlərin inkişaf etməsi, cəmiyyətin və dünyanın ehtiyaclarını ödəməsi üçün maliyyə, akademik və inzibati cəhətdən muxtar olmasına xüsusi diqqət yetirilir.

## AKADEMİK MUXTARİYYƏT

Akademik muxtariyyət universitetlərin daşıdığı vəzifə baxımından ön planda dayanır. Çünki o, əslində mahiyyət etibarı ilə özündə elmi yenilikləri ehtiva edir. Bu elmi yeniliklər elmi araşdırmalarda ən real nəticələrə imkan yaradan maksimum azadlıqla müəyyən olunur.

Pedaqoji mənbələrdə göstərildiyi kimi, akademik muxtariyyət elmi dərəcələrin əldə edilməsi, tədris proqramlarının təşkili, elmi tədqiqatların aparılması və yayılmasında sahib olunan azadlıq kimi başa düşülür (Öztürk, 2006). Akademik muxtariyyətə xarici təzyiqlərdən başqa, universitetin öz təşkilatı quruluşunun, eyni zamanda professor-müəllim heyətinin şəxsi konfliktlər, akademik qısqanclıq və ya ideoloji fərqliliklərə görə bir-birləri ilə mübarizəsi kimi davranışların da təsiri vardır (Büken, 2006; Aktan, 2008).

Bütün bunlar onu göstərir ki, akademik azadlıq elmi-tədqiqatların tematikasının müəyyənləşdirilməsi, əlaqələndirilməsi, tədqiqat işlərinin təşkili və aparılması, elmi kadrların hazırlanması və s. məsələlərindən ibarətdir.

Orta əsrlərdə Avropada qurulan universitetlər mövcud hüquq sistemindən kənarda özünü idarə edən qurumlar idi. Orta əsrlərdə universitetlərdə akademik azadlıq Berlin Universitetinin (1809) yaradıcılarından olan Vilhelm Von Humboldtun təşəbbüsləri ilə rəsmiləşdirib.

Vilhelm fon Humboldtun yaratdığı Berlin Universiteti modeli və müəyyənləşdirdiyi prinsiplər hələ də universitetlərə təsirini davam etdirməkdədir. Vilhelm fon Humboldtun fikrincə, universitetin əsas prinsiplərindən olan "Tədris etmə və öyrənmə azadlığı" "akademik muxtariyyət"dir. Bu prinsipə görə, Berlin Universiteti insan beyninin tam azad düşündüyü bir məkan olmalı, universitetdəki professorlar və tələbələr istər dini, istərsə də siyasi təsirə məruz qalmadan sərbəst şəkildə araşdırmalar apara və təhsil ala bilməlidirlər (Erdem, 2013).

XX əsrin sonlarına yaxın İngiltərədə qüvvəyə minmiş "Təhsil İslahatları Aktı"-nda da (1988) akademik muxtariyyətdən bəhs olunur və onun mahiyyətinə münasibət bildirilir: "Akademik muxtariyyət professor-müəllim heyətinin işlərini, imtiyazlarını itirmə riski olmadan, qanunvericiliyə əməl etmək şərti ilə ümumi qəbul edilmiş məsələləri yoxlamaq, sorğulamaq, mübahisəli olmayan yeni fikirlər irəli sürmək azadlığıdır" (Erdem, 2013).

Bütün bunlar o deməkdir ki, universitetlərin akademik muxtariyyəti zəuri bir pedaqoji anlayış kimi tarixi konteksdə müxtəlif zamanlarda təhsil mütəxəssislərinin diqqət mərkəzində dayanıb. Hətta ona mövzu azadlığı, yanaşma azadlığı, dil azadlığı kimi bir çox fərqli aspektlərdən yanaşılıb.

Mövzu azadlığı nədir? Adətən tədqiqat mövzuları əvvəlcədən müəyyən edilir və konkretləşdirilir. Bu proses müəyyən sifarişçi təşkilatlar və aparılmış tədqiqatların nəticələrinə əsasən müəyyən edilir. Mövzuların müəyyən olunmasında və onların daha kefiyyətli şəkildə tədqiqat obyektinə çevrilməsində həlledici amillərdən biri, əslində, tədqiqatçının arzusu və şəxsi təşəbbüsü hesab edilir. Təcrübə göstərir ki, tədqiqatçılar o zaman daha uğurlu və kefiyyətli araşdırmalar apara bilirlər ki, onlar mövzunu sərbəst seçirlər. Bu yanaşma, əslində, mövzunun seçilməsində azadlığın olması tələbinin vacib amil olduğunu göstərir. Tədqiqatçının mövzuya istənilən mövcud rakursdan yanaşması, eləcə də sərbəst yanaşma bacarığı nümayiş etdirməsi isə yanaşma azadlığıdır. Tədqiqatçının öz sərbəst linqvistik ifadə və üslubunu müəyyən etməsi də dil azadlığıdır.

Lima Bəyannaməsinin 1-ci maddəsində akademik muxtariyyətə "fərdi və ya kollektiv şəkildə tədqiqat, araşdırma, müzakirə aparmaq, yaratmaq, öyrətmək, izah etmək, bilik əldə etmək, biliyi çatdırmaq azadlığı" kimi tərif verilib. YUNESKO-nun Tövsiyəsinin 27-ci maddəsində isə akademik muxtariyyət tədris yanaşması ilə məhdudlaşdırılmayaraq tədqiqat aparmaq və onun nəticələrini yaymaq, dərc etmək, işlədikləri müəssisə haqqında sərbəst fikir bildirmək, institusional senzuradan azad olmaq, akademik orqanlarda (Elmi Şura və s.) iştirak etmək azadlığı olaraq ifadə edilir.

Amerika Universitet Professorları Assosiasiyasına görə, universitet müəllimlərinin malik

olmalı olduğu akademik azadlığın üç əsas şərti var (Buken, 2006):

- Tədqiqatlar aparmaq və nəticələri dərc etdirmək;
- Universitetdə dərs deyərkən nəyi və necə öyrədəcəyinə qərar vermək;
- Tədqiqat və düşüncələrinə görə institusional senzuraya, təzyiqə məruz qalmamaq.

Bütün bu deyilənlərdən belə nəticəyə gəlmək olar ki, akademik muxtariyyət universitetin xarici amillərdən azad ola bilməsi, tərkibində hansı fakültələrin açılmasıyla bağlı sərbəst qərar verməsi, eyni zamanda kim öyrədəcəyi, nə öyrədəcəyi, necə öyrədəcəyi, kimə öyrədəcəyi barədə müstəqil seçim etməsidir. Universitetlərin akademik proqramlarını, tədqiqat siyasətlərini professor-müəllim heyətinin iştirak etdiyi universitet şuraları tərəfindən müəyyən edilməsi akademik muxtariyyətin əsas şərtlərindən biridir. Bu gün dünyada akademik muxtariyyəti universitetin dəyişən siyasi şəraitdən təsirlənməsinin qarşısını alır. Bu o deməkdir ki, universitetdə təzyiq və göstəriş olmadan sərbəst şəkildə təhsil almaq və araşdırma aparmaq olar.

İnzibati muxtariyyət isə akademik muxtariyyətin təminatıdır.

## İNZİBATİ MUXTARİYYƏT

Bir universitetin idarəetmə tərzi o universitetin nə qədər muxtar olduğunu göstərən ən mühüm göstəricilərdən biridir. İnzibati muxtariyyət universitetin rektorlarını seçmək, professor-müəllim heyətini işə götürmək üsulunun öz idarəetmə orqanı tərəfindən universitet daxilindəki bütün tərəflərin iştirakı ilə sərbəst müəyyənləşdirməsidir. Bu mərhələdə universitetin "dövlət" ilə əlaqəsinin ölçüləri və sərhədləri mühüm amillərdən biridir.

İnzibati muxtariyyətin 3 mühüm şərti var (Aktan, 2008; Öztürk, 2006):

- İdarəetmə orqanlarının hakimiyyətə gəlişi və hakimiyyətdən gedişi yolları;
- Bu orqanların sərbəst şəkildə qərar qəbul etmək və həyata keçirmək səlahiyyəti;
- Universitetdəki bütün tərəflərin idarəetmədə iştirakı.

Universitetin inzibati muxtariyyəti – universitetlərin dövlət qurumu olduğu ölkələrdə siyasi hakimiyyət, universitetlərin özəl qurum olduğu ölkələrdə isə kapital qarşısında muxtariyyətinin olması, qanunlarla müəyyən edilmiş hədlər daxilində öz qaydalarını müəyyən etməsi, resursları barədə qərarvermək hüququna malik olması, akademik və qeyri-akademik işlərini öz orqanları vasitəsilə həyata keçirməsi deməkdir (Öztürk, 2006).

Deyilənlərdən bu nəticəyə gələ bilərik ki, inzibati muxtariyyət universitetin tərkibinə daxil olan bölmələrin öz qərarını bütün üzvlərin iştirak etdiyi qurumlarda müzakirə edərək qəbul etməsidir. İnzibati muxtariyyət üçün universitetlərdə qərar qəbuletmə səlahiyyətinin demokratik yolla seçilmiş şuralarda olması vacibdir. İnzibati muxtariyyət o demək deyil ki, dövlətin universitetə heç bir müdaxiləsi, ondan heç bir tələbi yoxdur. Universitetlər öz işlərini idarə etməkdə sərbəst olsalar da, onlara fəaliyyət hüququ verən dövlətdən və onun orqanlarından müəyyən qədər asılıdırlar. Dövlətin universitetin fəaliyyətinə müdaxiləsi nə qədər arzuolunmaz olsa da, biganəliyi də bir o qədər çox narahatçılıqlar yaradar.

## MALİYYƏ, AKADEMİK VƏ İNZİBATİ MUXTARİYYƏTİN MÜQAYİSƏSİ

Aparılan bir çox araşdırmalarda muxtariyyətin maliyyə, inzibati və akademik ölçülərinin hər üçü bir yerdə nəzərdən keçirilmədiyindən tədqiqatlar əhatəli deyil. Bu tədqiqatların ümumi cəhəti ondan ibarətdir ki, onlarda bir muxtariyyətin digərlərindən daha vacib olduğu sübut edilməyə çalışılır.

Universitetdə akademik muxtariyyətdən gözlənilən faydanın əldə edilməsi dövlət resurslarından səmərəli istifadə və bu istifadəni təmin edəcək sistemin ardıcıllığı ilə mümkündür. Bu səbəbdən bir çox tədqiqatlarda maliyyə muxtariyyətinin inzibati və akademik muxtariyyətin təminatı olması fikri ilə qarşılaşırıq.

Lakin Avropa Universitetlər Birliyinin Avropa ölkələri universitetlərinin muxtariyyəti ilə bağlı həyata keçirdiyi qiymətləndirməyə nəzər

**Cədvəl 1** Avropa ölkələri universitetlərinin muxtariyyəti

| Ölkələr | Maliyyə muxtariyyəti | Akademik muxtariyyət | İnzibati muxtariyyət |
|---|---|---|---|
| Latviya | 2 | 23 | 22 |
| Hollandiya | 4 | 22 | 13 |
| İtaliya | 7 | 18 | 16 |
| Portuqaliya | 8 | 20 | 7 |
| Finlandiya | 2 | 11 | 3 |

**Cədvəl 2** Avropa ölkələri universitetlərinin muxtariyyəti

| Ölkələr | Maliyyə muxtariyyəti | Akademik muxtariyyət | İnzibati muxtariyyət |
|---|---|---|---|
| Estoniya | 5 | 1 | 5 |
| İrlandiya | 13 | 3 | 11 |
| Norveç | 27 | 9 | 8 |

*Mənbə:* (https://eua.eu/issues/4:autonomy-and-governance.html)

saldıqda maliyyə muxtariyyətinə görə universitetləri ön sıralarda olan ölkələrin akademik muxtariyyət baxımından sonuncu yerdə olduğunu görürük (Cədvəl 1).

Eyni zamanda, universitetləri akademik muxtariyyətdə ön sıralarda olan bəzi ölkələrin maliyyə muxtariyyətlərinə görə sonuncu yerləri bölüşdüyünü müşahidə edirik (Cədvəl 2). Bu, maliyyə muxtariyyətinin akademik və inzibati muxtariyyətin əsasını təşkil etməsi fikrini şübhə altına alır.

Hesab edirik ki, bu ölkələrin universitetlərinin maliyyə, inzibati və akademik muxtariyyət baxımından tərtib etdikləri reytinqdə kəskin fərqlərin olmasının səbəbi muxtariyyətin müəyyən edilməsində istifadə olunan meyarlardan qaynaqlıdır.

Məsələn, inzibati muxtariyyət meyarlarından biri universitet rektorunun seçki yolu ilə təyin edilməsidir. Lakin dünyanın bəzi qabaqcıl universitetlərində rektor seçki yolu ilə təyin edilməsə də, bu universitetlərdə o, bir növ simvolik xarakter daşıyır. Belə universitetlərdə fakültələr müstəqil maliyyə resurslarına malik olmaqla yanaşı, onu müstəqil idarə etmək, qanuni mənbələrdən maliyyə əldə etmək hüququna malikdirlər. Qeyri-institusional strukturu olan universitetlərdə isə daha çox rektor işi ön plana çıxır, ona görə də digər inzibati bölmələr və kadrlar passiv məsuliyyət daşıyırlar. Bu səbəbdən də hesab edirik ki, rektorların təyin edilmə formasını inzibati muxtariyyət meyarı kimi qəbul etmək yalnış nəticələrə gətirib çıxara bilər.

Maliyyə muxtariyyətinin inzibati və akademik muxtariyyətin əsası olduğunu bildirən tədqiqatların əksinə olaraq, maliyyə müstəqilliyini təmin etmək zəminində universitetlərin bazarla qurduqları əlaqə nəticəsində muxtariyyət idealından getdikcə daha çox uzaqlaşaraq bazar iqtisadiyyatından aslı olduğunu iddia edən (məsələn, Özcan və Çakır, 2016) tədqiqatlara da rast gəlirik.

Bəzi araşdırmalarda isə universitet muxtariyyətinin əsasının akademik muxtariyyət olduğu iddia edilir. Dos. Dr. Hüseyin Korkut (1993) "Universitet muxtariyyəti" adlı məqaləsində universitet muxtariyyətinin maliyyə və akademik muxtariyyətdən ibarət olduğunu, akademik muxtariyyətdən danışarkən isə bəzi inzibati qərarları verərkən azad olmağın vacib olduğunu açıqlayır. Akademik muxtariyyəti izah edərkən Cevizci (2005) bildirir ki, "akademik muxtariyyət universitetlərdə çalışan professor-müəllim heyətinin universitetin, eyni zamanda kənar

səlahiyyətlilərin təsiri, təzyiqi, hədəsi olmadan, yalnız elmin universal prinsiplərinə sadiq qalaraq həqiqətləri yazmaq, ifadə etmək, öyrətmək tələbi və ya hüququ"dur. Dinler (2013) tədqiqatında yazır ki, universitetin professor-müəllim heyətinin həm də dövlət qulluqçusu olması fikri onların elmi azadlıqlarını məhdudlaşdırır, çünki onlar dövlətin rəsmi ideologiyasına bağlanmalı və dövlətə sədaqət kimi öhdəliklər daşımalıdırlar.

Ədəbiyyatda akademik və inzibati muxtariyyətin müxtəlif təriflərinin verildiyini və "akademik azadlıq, universitet muxtariyyəti, akademik muxtariyyət, elmi muxtariyyət, elm azadlığı" kimi bir çox təlqinedici anlayışların bir-birinin əvəzinə istifadə olunduğunu da müşahidə edirik.

## MÜZAKİRƏ, NƏTİCƏ VƏ TƏKLİFLƏR

Aparılan araşdırmalara nəzər saldıqda universitet muxtariyyətinin müxtəlif tərifləri ilə qarşılaşırıq. Sözügedən çaşqınlığın səbəbi akademik azadlıq və inzibati spesifikliyin kifayət qədər başa düşülməməsi, onların əhatə dairəsi və sərhədlərinin bəlli olmamasıdır. Mövcud tədqiqatların daha çox akademik və maliyyə muxtariyyətinə yönəldiyini görürük. Fikrimizcə, bunun səbəblərindən biri də akademik muxtariyyətin universitetin hüdudları çərçivəsində professor-müəllim heyətinin müstəqil fəaliyyət göstərmək səlahiyyəti kimi müəyyən edildiyi üçün inzibati muxtariyyət anlayışını da özündə ehtiva etməsidir. Yəni, universitetlərin inzibati muxtariyyət meyarından biri də universitetin akademik heyətinin onun idarə edilməsində iştirakı olduğu üçün akademik muxtariyyətin həm də inzibati muxtariyyət anlayışını özündə ehtiva edir. Başqa sözlə, universitetlərin inzibati heyəti professor-müəllim heyətidir. İnzibati heyətin əsas məqsədi akademik heyətin daha yaxşı işləməsinə töhfə verməkdir. Universitetin inzibati balansı akademik və inzibati muxtariyyət olduğu üçün bu iki anlayışı bir-birindən təcrid edilmiş şəkildə izah etmək mümkün deyil. Bundan əlavə, ali təhsildə inzibati muxtariyyətin tərifi ölkədən ölkəyə fərqli ola bilər. Başqa sözlə desək, zahirən sadə görünən inzibati muxtariyyətin müəyyən edilməsi çətin bir anlayışdır. Universitetin inzibati muxtariyyəti dövlətin qanunvericilik aktları, o cümlədən cəmiyyətin mədəniyyəti və tarixi ilə bağlı olduğundan, inzibati muxtariyyətin tərifi ilə bağlı ortaq fikir yoxdur. Universitetin inzibati muxtariyyətinin hüdudları qanunvericilik aktları ilə müəyyən olunduğundan, bunun dövlətin idarəetmə sistemindən asılı olduğunu deyə bilərik.

Akademik muxtariyyətlə bağlı verilən bütün tərifləri qısaca belə xülasə edə bilərik: akademik muxtariyyətin universitet üçün çox mühüm yeri var və universitetdəki professor-müəllim heyəti öz işlərini itirmək təhlükəsinə məruz qalmadan istədikləri mövzu üzərində tədqiqat aparmaq, fikirlərini sərbəst ifadə etmək, düşüncələrinə görə təzyiqlərə məruz qalmamaq, tədqiqatların nəticələrini dərc etmək, təhsil və təlim proqramlarını seçmək hüququna malik olması deməkdir. Akademik muxtariyyət qeyri-məhdud deyil. Akademik muxtariyyət etik qaydalara, akademik etikaya və qüvvədə olan qanunlara zidd davranışlara yol vermir. Akademik muxtariyyətə malik olmaq həm də dürüst, akademik dəyərlərə sadiq olmaq, etik davranmaq, elmi cəhətdən yalnış davranışların qarşısını almaq və elmin nəticələrinə görə məsuliyyətlə hərəkət etmək deməkdir. Deyə bilərik ki, akademik etika universitetin akademik muxtariyyət sərhədlərini müəyyən edir.

Universitetlərin təkcə təhsil fəaliyyətinə deyil, həm də dövlətin inkişaf strategiyasının hazırlanmasına töhfə verməsi gözləntisi yeni nəsil universitetlərin – təşəbbüskar universitetlərin yaranmasına gətirib çıxarır. Bu eyni zamanda universitet-sənaye əməkdaşlığını zəruri edir. Yeni nəsil universitetlərin ən mühüm hərəkətverici qüvvəsi universitet-sənaye əməkdaşlığının qurulmasıdır. Bir çox araşdırmalarda bu transformasiya universitetlərə yeni gəlir mənbələri təmin etmək imkanı verdiyi üçün universitet muxtariyyəti baxımından da müsbət qarşılanır. Universitetlərin maliyyə muxtariyyəti ilə bağlı araşdırmalarda maliyyə muxtariyyətinin inzibati və akademik muxtariyyətin əsasını təşkil etdiyi bildirilir. Başqa sözlə, maliyyə

muxtariyyəti olmayan universitetin inzibati və akademik muxtariyyəti ola bilməz. Bu səbəbdən bütün universitetlərin təşəbbüskar universitetlərə çevrilməsi fikri dəstəklənir.

Universitetlərin heç bir şəxs və ya qurumun təzyiqinə məruz qalmaması, siyasi alət kimi istifadə edilməməsi elmi və ictimai inkişaf baxımından böyük əhəmiyyətə malikdir. Universitetin missiyasının mövcud olması üçün universitet muxtariyyəti akademik, inzibati və maliyyə muxtariyyət münasibətləri kontekstində işlənməli və hər kəs tərəfindən qəbul edilən bir tərif verilməlidir. İnsan haqları beynəlxalq səviyyədə diqqət mərkəzində olduğu kimi, beynəlxalq aləmdə də universitet muxtariyyəti daim diqqət mərkəzində olmalıdır. Bu məqsədlə atılacaq ikinci addım universitet muxtariyyətini ölçən beynəlxalq mexanizmin yaradılması ola bilər.

**İstifadə edilmiş ədəbiyyat**


1. Aktan, C. (2008). Akademik özerklik. h ttp://www. canaktan. org/egitim/uni vers ite-reform/aka-ozerklik. htm. Erişim 27.10.2021
2. Alpkaya, G. (2001). "UNESCO'nun 1997 Tarihli Kararı Işığında Akademik Özgürlük", Cevat Geray'a Armağan, Ankara: Mülkiyeliler Birliği Yay, s. 229-244.
3. Büken, N.Ö. (2006). Türkiye örneğinde akademik dünya ve akademik etik. Hacettepe Tıp Dergisi, 37(3), 164-170.
4. Ceran, Y. (2013). Kamu İç Denetimi Açısından Üniversitelerde İç Denetim. Selçuk Üniversitesi Sosyal Bilimler Meslek Yüksek Okulu Dergisi, Cilt:16, Sayı:1, 3-16.
5. Cevizci, A. ( 2005). Felsefe sözlüğü, İstanbul: Pradigma Yay.
6. Dinler, V. (2013). Akademik özgürlüğün sınırı üzerine sorular. Muhafazakar Düşünce Dergisi, 9 (35), 239-261.
7. Erdem, A.R. (2013). Üniversite Özerkliği: Mali, Akademik ve Yönetsel Açıdan Yaklaşım. Yükseköğretim ve Bilim Dergisi, Cilt: 3, Sayı:2, 97-100.
8. Feyzioğlu, B. (1981). Üniversite Özerkliği. Maliye Araştırmaları Merkezi Konferansları, Sayı:128, 127-133.
9. Korkut, H. (1993). Üniversite Özerkliği. Eğitim ve Bilim, 17(88).
10. Lima Bildirgesi Akademik Özgürlük ve Yüksek Öğretim Kurumlarının Özerkliği (2003). Eğitim Bilim ve Toplum Dergisi, Cilt:1, Sayı http://www.egitimbilimtoplum.com.tr/index.php/ebt/article/view/36/54. Erişim Tarihi: 24.10.2021.
11. Özcan, D., & Çakır, H. (2016). Üniversite-Toplum, Devlet, Piyasa/Sermaye İlişkileri Bağlamında Üniversite Özerkliği . Yükseköğretim ve Bilim Dergisi, (1), 31-40.
12. Öztürk, S. (2006). Üniversite özerkliği göstergeleri üzerine bir değerlendirme. Eğitim Bilim ve Toplum, 4(16), 114-145.
13. Öztürk, S. (2006). Üniversitelerin yapısal ve işlevsel değişiminde üniversite özerkliğinin yeniden tanımlanması veya özerklik kavramı ve üniversite özerkliği, Üniversite ve Toplum, 6(4). Erişim: 27.10.2021, http://www.universite-toplum.org/text. php3?id=287
14. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı: Qanun, 2009. 108s.
15. UNESCO. (2008). 1997 recommendation concerning the status oh higher education teaching personnel. United Nations Educational, Scientific and Cultural Organization, Paris, France. Retrieved from http://unesdoc.unesco.org/images/0016/001604/160495e.pdf.
16. Avropa Universitetlər Birliyi (The European University Association) rəsmi internet səhifəsi. Erişim: 27.10.2021, https://eua.eu/issues/4:autonomy-and-governance.html

# VII SİNİFDƏ FİZİKADAN QÜVVƏYƏ AİD BƏZİ MÖVZULARIN TƏDRİSİNDƏ VİRTUAL LABORATORİYA İŞLƏRİNDƏN İSTİFADƏ TEXNOLOGİYASI

**CAVİD TAPDIQLI**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin Fizikanın tədrisi texnologiyası kafedrasının doktorantı. E-mail: cavidtapdiqli96@mail.ru
https://orcid.org/0000-0002-0941-6323

**Məqaləyə istinad:**
Tapdıqlı C. (2023). VII sinifdə fizikadan qüvvəyə aid bəzi mövzuların tədrisində virtual laboratoriya işlərindən istifadə texnologiyası. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 77–84

**Məqalə tarixçəsi**
Göndərilib: 14.12.2022
Qəbul edilib: 01.02.2023

**ANNOTASİYA**

Müasir innovasiyaların tətbiqi ilə təhsil sahəsində böyük inkişaf baş verib. Ən yeni informasiya texnologiyalarından və tədris vasitələrindən istifadə tədris prosesinin keyfiyyətinə mühüm təsir göstərir. Bunlardan biri də virtual laboratoriyalardır. Belə laboratoriyalar ənənəvi laboratoriya işləri üçün xarakterik olan cihaz və avadanlıqlardan fərqli olaraq böyük investisiya tələb etmir. Bəzən məktəblərdə laboratoriya işlərini yerinə yetirmək üçün lazım olan cihaz və avadanlıqların çatışmazlığı fizika fənninin tədrisinin keyfiyyətinə mənfi təsir göstərir. Bu problemi həll etmək üçün görülən işlərdən biri də elektron tədris alətlərindən intensiv istifadə edərək, virtual laboratoriya işlərinin tədrisini intensiv şəkildə həyata keçirməkdir. Tədqiqatın əsas məqsədi VII sinifdə təhsil alan şagirdləri fizika fənninin tədrisində istifadəsi məqsədəuyğun hesab olunan simulyasiyalarla tanış etmək üçün virtual laboratoriya işlərindən istifadə texnologiyasını göstərməkdir.

**Açar sözlər:** Virtual laboratoriya, simulyator, elastiki qüvvə, elektron tədris alətləri, istifadə texnologiyası.

# THE TECHNOLOGY OF USING VIRTUAL LABORATORY WORKS IN TEACHING SOME FORCE TOPICS IN PHYSICS FOR CLASS 7

**JAVID TAPDIGLI**
Doctoral student of the Physics Teaching Technology Department of the Azerbaijan State Pedagogical University. E-mail: cavidtapdiqli96@mail.ru
https://orcid.org/0000-0002-0941-6323

**To cite this article:**
Tapdigli J. (2023). The technology of using virtual laboratory works in teaching some force topics in physics for class 7. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 77–84

**ABSTRACT**

With the introduction of modern innovations, great development has taken place in the field of education. The use of the latest information technologies and educational tools has had a significant impact on the quality of the educational process. One such teaching tool is virtual laboratories. Unlike the expensive devices and equipment typical of traditional laboratory work, the virtual laboratory does not require a large investment. It is known that not all schools have the necessary devices and equipment to perform laboratory work. This deficiency harms the quality of physics teaching. One of the things we are doing in this direction is to intensively implement the teaching of virtual laboratory works by intensively using electronic teaching tools. The main purpose of the research is to familiarize students studying in the VII grade with simulations that are considered suitable for use in the teaching of physics and to show the technology of using virtual laboratory work.

**Keywords:** Virtual laboratory, simulator, elastic force, electronic teaching tools, use technology.

**Article history**
Received: 04.12.2022
Accepted: 01.02.2023

## GİRİŞ

Təhsildə müasir informasiya texnologiyalarının istifadəsi artıq yenilik deyil, bütün dünyada qəbul edilmiş reallıqıdır. Hazırda informasiya-kommunikasiya texnologiyalarından (İKT) səmərəli və məqsədyönlü istifadə tədris prosesinin keyfiyyətini yüksəltməyə, dərsi müasir, maraqlı və interaktiv etməyə imkan verir. Sinifdə kompüter texnologiyasından istifadə şagirdlər arasındakı ünsiyyəti əvəz edə bilməz, lakin öyrənilən mövzu ilə əlaqədar virtual laboratoriyalardan istifadə həm şagird-şagird, həm də şagird-müəllim arasında dayanıqlı münasibətlərin formalaşmasına imkan yaradacaq (İsmayılov, 2009). Virtual laboratoriyalardan istifadə zamanı didaktikanın əsas prinsiplərindən biri olan əyanilik prinsipinə riayət olunur. Beləliklə, şagirdlərin materialı optimal səviyyədə mənimsəməsini təmin edən, emosional qavrayışı artıran, şagirdlərdə tənqidi və yaradıcı düşüncəni inkişaf etdirən görmə qabiliyyəti formalaşır. Tədqiqat işində polşalı mühəndis Vladimir Vaskakın hazırladığı virtual laboratoriya proqramlarından[1] və ABŞ-ın Kolorado Universitetinin əməkdaşlarının hazırladığı PhET (University of Colorado Physics Education Technology) simulyasiyalarından istifadə edilib[2].

## MATERİAL VƏ METOD

Laboratoriya işinin virtual formada təqdimatı dərsi canlandırmağa, demonstrasiyalarla (əşya və hadisəni dinamikada, yeni dəyişmə və inkişaf halında nümayiş etdirən təlim metodu) əyaniləşdirməyə və bununla da təsəvvür edilməsi çətin olan hadisə və prosesləri müşahidə etməyə imkan yaradır. Dərsin virtual təşkili eyni zaman müddətində müxtəlif formalarda informasiya almağa imkan verir, müəllimin şagirdə emosional təsirini artırır (Tapdıqlı, Sadıqlı, 2021). Bu baxımdan, qeyd edilən tədris vahidi üzrə problemin həllinə nəzər yetirək.

[1] https://www.vascak.cz/physicsanimations.php

[2] https://phet.colorado.edu

**1. “Qüvvə” anlayışının formalaşdırılmasında virtual laboratoriyalardan istifadə.** Ümumtəhsil müəssisələrinin VII sinfində şagirdlər yeni bir fiziki kəmiyyətlə – “qüvvə” ilə tanış olurlar. Qüvvə vektorial fiziki kəmiyyət olduğundan onun ədədi qiyməti ilə yanaşı istiqamətindən də danışmaq vacibdir. Bu məqsədlə vektor anlayışının düzgün şəkildə tədrisinə ehtiyac vardır. Çünki şagirdlərin bir qismi vektorlarla bağlı məsələləri başa düşməkdə, biliklərini tətbiq etməkdə çətinlik çəkirlər. Bu çətinliyi virtual laboratoriya işlərindən istifadə edərək aradan qaldırmaq olar (Sharifov, 2022). Virtual laboratoriya proqramları şagirdlərdə vektorların istiqaməti və ədədi qiyməti ilə bağlı ilkin təsəvvürlərin yaradılmasında böyük rol oynayır. Vektorlarla bağlı aşağıdakı virtual laboratoriya işinə baxaq (şəkil 1).

1. Simulyatoru nümayiş etdirmək üçün internet vasitəsilə aşağıdakı linkə daxil olaq:

https://phet.colorado.edu/sims/html/vector-addition/latest/vector-addition_tr.html

2. Sadə hal üçün birölçülü koordinat sistemində eyni və əks istiqamətlərdə paralel yerləşmiş vektorları nəzərdən keçirək. Ekranın sağ hissəsindəki menyudan $\vec{a}$ və $\vec{b}$ vektorlarını mausun sol düyməsi ilə seçməklə koordinat sisteminə gətirək (şəkil 2).

3. Ekranda *X* oxu üzrə vektorları yerləşdirmək məqsədilə ekranın damalı xanalardan ibarət olmasını təmin edək. Hər bir damanın ölçüsü 10 mm-dir. Simulyatordan göründüyü kimi, vektorlar ədədi qiymətcə $\vec{a} = 5\ sm$ və $\vec{b} = 8\ sm$ qiymətlərini alır. Mausun sol düyməsi ilə vektorların uzunluğunu azaldıb-artırmaqla ədədi qiymətləri ixtiyari şəkildə dəyişdirmək mümkündür. Vektorların istiqamətləri eyni olduğundan bu vektorların əvəzləyicisinin modulu (ədədi qiyməti) onların cəminə bərabərdir, istiqaməti isə həmin vektorların yönəldiyi istiqamətdədir. Şəkil 2-dən göründüyü kimi, $\vec{a}$ və $\vec{b}$ vektorlarının əvəzləyicisi $\vec{s}$ vektorudur və ədədi qiyməti belədir:

$$\vec{s} = \vec{a} + \vec{b} = 5+8 = 13\ sm.$$

4. Simulyatordan istifadə edərək əks istiqamətdə yönəlmiş vektorlar üçün də onların əvəzləyicisini tapmaq mümkündür. Ekranda

**Şəkil 1** Vektorlara aid virtual laboratoriya işi




**Şəkil 2** Paralel və eyni istiqamətə yönəlmiş vektorların toplanması




mausun sol düyməsi ilə $\vec{a}$ vektorunun ölçüsünü kiçildərək istiqamətinin *X* oxunun əksinə doğru yönəlməsini təmin edək (şəkil 3).

Bir düz xətt üzrə əks istiqamətlərə yönəlmiş vektorların əvəzləyicisinin modulu onların modulları fərqinə bərabərdir, istiqaməti isə böyük qiymətə malik vektorun istiqamətindədir. Simulyatorda mausun sol düyməsi ilə vektorların uzunluğunu dəyişərək ədədi qiymətlərini uyğun olaraq $\vec{a}$ = 4 *sm* və $\vec{b}$ = 11 *sm* kimi təyin edək. Şəkil 3-də bu vektorların əvəzləyicisi olan $\vec{s}$ vektoru təsvir olunub. Bu vektorlar bir-birinə əks istiqamətdə yönəldikləri üçün onların əvəzləyicisi həmin vektorların fərqi şəklində tapılır: $\vec{s} = \vec{b} - \vec{a}$ = 11-4=7 sm.

Cismə eyni zamanda bir neçə qüvvə təsir göstərə bilir. Cismə təsir edən qüvvələrin ümumi təsirini hesablamaq məqsədilə əvəzləyici qüvvə anlayışından istifadə olunur. Qüvvə vektorial kəmiyyət olduğundan vektorların toplanılması və çıxılması zamanı istifadə etdiyimiz qaydaları qüvvə vektorlarının əvəzləyicisinin hesablanmasında da istifadə etmək olar. Bir düz xətt üzrə eyni istiqamətdə təsir edən qüvvələrin

**Şəkil 3** Paralel və əks istiqamətdə yönəlmiş vektorların çıxılması




əvəzləyicisinin modulu (ədədi qiyməti) bu qüvvələrin modulları cəminə bərabərdir, istiqaməti isə həmin qüvvələrin istiqamətindədir. Bir düz xətt üzrə əks istiqamətlərə təsir edən qüvvələrin əvəzləyicisinin modulu bu qüvvələrin modulları fərqinə bərabərdir, istiqaməti isə modulu böyük olan qüvvə istiqamətindədir.

**2. Cisimlər arasındakı qarşılıqlı təsirin əks təsirə bərabər olduğunu göstərən virtual laboratoriya işi.**

Bir-birilə qarşılıqlı təsirdə olan cisimlər bir-birinə müəyyən qüvvə ilə təsir göstərir. Bu istiqamətdə araşdırmalar aparan İ.Nyuton müəyyən etdi ki, belə qüvvələr cüt-cüt yaranır və ədədi qiymətcə bərabərdir. Nyutonun III qanununa görə, ixtiyari iki cismin qarşılıqlı təsir qüvvələri modulca bərabər, istiqamətcə əksdir:

$$\vec{F}_1 = -\vec{F}_2$$

Bu ifadədə $\vec{F}_1$ və $\vec{F}_2$ uyğun olaraq bir düz xətt boyunca yönələn təsir və əks-təsir qüvvələridir. Mənfi işarəsi bu qüvvələrin bir-birinə əks istiqamətə yönəldiyini göstərir.

Bəzən VII sinif şagirdləri təsir və əks təsir qüvvələrinin mahiyyətini başa düşməkdə çətinlik çəkirlər. Bu çətinliyi aradan qaldırmaq məqsədilə virtual modellər nümayiş etdirilə bilər.

Nyutonun üçüncü qanunu ilə bağlı aşağıdakı virtual laboratoriya işindən istifadə texnologiyasını nəzərdən keçirək.

1. Simulyasiyanı nümayiş etdimək üçün aşağıda verilmiş linkə daxil olaq:

https://www.vascak.cz/data/android/physicsatschool/template.php?s=mech_newton3&l=tr

2. Simulyatorda bir-birinə birləşdirilən 10 N-luq dinamometrlər əks olunub (şəkil 4). Dinamometrlərin göstərişlərini göy və qırmızı düymələr vasitəsilə dəyişdirmək mümkündür. Mausun sol düyməsi ilə göy düyməni sağa doğru hərəkət etdirərək sağda ikinci dinamometrin göstərişini 5 N-a qədər artıraq (şəkil 5).

3. Simulyatordan göründüyü kimi, ikinci dinamometrin göstərişi 5 N olan zaman birinci dinamometrin göstərişi də 5 N olur. İkinci halda birinci dinamometrin göstərişini dəyişərək 8 N-a çatdıraq (şəkil 6). Dinamometrlərdən hər hansı birinin göstərişini dəyişən zaman hər iki dinamometrdə göstərişlərin eyni olduğu müşahidə edilir.

Virtual laboratoriya işi Nyutonun üçüncü qanununu əyani olaraq şagirdlərə izah etmək üçün olduqca səmərəlidir. Simulyatordan istifadə edən şagirdlər bir-birinə birləşdirilmiş dinamometrləri əks istiqamətdə dartan zaman qüvvələrin ədədi qiymətcə bərabər olduğunu özləri müstəqil olaraq başa düşürlər.

**Şəkil 4/5/6** Dinanometrlərdən istifadə edərək Nyutonun III qanununun nümayişi




### 3. Elastiklik qüvvəsinin deformasiyanın ölçüsündən asılılığını göstərən virtual laboratoriya işi.

Xarici qüvvənin təsiri nəticəsində cismin forması müəyyən dəyişikliyə məruz qalır. Bu hadisəyə deformasiya deyilir. Deformasiyalar xarakterinə görə elastik və plastik olmaqla 2 cür olur. Xarici qüvvənin təsiri kəsildikdən sonra cisim yenidən əvvəlki vəziyyətinə qayıdırsa, bu elastik deformasiyadır. Xarici qüvvənin təsirindən sonra cisim əvvəlki vəziyyətinə qayıtmırsa, buna plastik deformasiya deyilir. Fərz edək ki, yay şaquli müstəviyə bərkidilib. Onu əlimizlə müstəviyə doğru sıxsaq, yayın dolaqları bir-birinə yaxınlaşar. Bu zaman yayda sıxılmaya müqavimət göstərən əks-təsir qüvvəsi yaranır. Əlimizi buraxan zaman bu qüvvə yayı əvvəlki vəziyyətinə qaytarmağa çalışır. Əlimizin yaya təsir qüvvəsi deformasiya etdirici qüvvə, yayın əks-təsir qüvvəsi isə elastiklik qüvvəsi adlanır. Elastiklik qüvvəsi cismin deformasiyası nəticəsində yaranan və onu əvvəlki vəziyyətə qaytarmağa çalışan qüvvədir. Şagirdlərə deformasiya nəticəsində elastiklik qüvvəsinin yaranmasını, onun hansı fiziki kəmiyyətlərdən asılı olmasını əyani olaraq izah etmək məqsədilə virtual laboratoriya işindən istifadə texnologiyasına baxaq.

1. Elastiklik qüvvəsinin təsiri ilə deformasiyanın nümayiş etdirməsi məqsədilə Phet simulyatoruna daxil olaq:

https://phet.colorado.edu/sims/html/hookes-law/latest/hookes-law_tr.html

2. Simulyatordan göründüyü kimi, simulyativ elastik yay tərpənməz dayağa bərkidilib. Elastik yayı deformasiya etdirərək uzatmaq və ya sıxmaq üçün uc hissəsində qırmızı rəngli düymə olan simulyativ tutqacdan istifadə edək (şəkil 7).

3. Ekranın sağ hissəsindəki cədvəldə yaya təsir edən elastiklik qüvvəsi qırmızı, həmin qüvvəyə əks istiqamətdə təsir edən qüvvə göy rənglə göstərilib (şəkil 7). Yayın deformasiyası zamanı deformasiyanın ölçüsü isə yaşıl rənglə işarə edilib.

4. İlk dəfə cismin deformasiyası zamanı yaranan qüvvənin uzanmadan asılılığını Huk müəyyən edib. Huk qanununa görə, cismin deformasiyası zamanı yaranan elastiklik qüvvəsi deformasiyanın ölçüsü ilə düz mütənasibdir:

$$F_{el} = -kx.$$

Simulyatorda göy rəngli düymə yayın sərtliyini (k), qırmızı rəngli düymə isə uzanmasını və ya qısalmasını dəyişdirmək üçündür.

5. Simulyatorda qırmızı düymə ilə yayı sağ və sol istiqamətlərdə hərəkət etdirməklə qüvvənin ədədi qiymətinin dəyişməsini izləyin. Yaşıl rəngli ox yayın uzanmasını və ya qısalmasını ədədi qiymətcə ekranda göstərir.

6. Ekranda göstərilən qiymətləri elastiklik qüvvəsinin düsturunda yerinə qoymaqla yayın uzanmasını hesablayın. Alınan nəticəni simulyatordakı nəticə ilə müqayisə edin.

**Şəkil 7** Elastiklik qüvvəsinə aid virtual laboratoriya işi




**4. Çəkisizlik halının nümayişinə aid virtual laboratoriya işi.**

Üfüqi elastiki lövhənin üzərinə çəki daşı qoyan zaman o, lövhənin səthinə ağırlıq qüvvəsinə bərabər qüvvə ilə perpendikulyar istiqamətdə təsir göstərir. Nəticədə, deformasiyaya məruz qalan lövhə də çəki daşına elastiklik qüvvəsi ilə əks-təsir göstərir. Bu elastiklik qüvvəsi səthin reaksiya qüvvəsi adlanır. Yük tərpənməz nöqtədən bağlanan sapdan asıldıqda heç bir deformasiya müşahidə edilmir. Əslində isə yük asqıya bərabər qüvvə ilə təsir edir, o da yükə elastiklik qüvvəsi ilə əks-təsir göstərir. Cismi Yer cəzb edir, lakin tərpənməz dayaq və asqı onun yerə düşməsinə mane olur, nəticədə, cisim onlara ağırlıq qüvvəsinə bərabər qüvvə ilə təsir göstərir. Yerin cazibəsi nəticəsində cismin dayağa və ya asqıya göstərdiyi təsir qüvvəsinə çəki deyilir. Çəkinin tətbiq nöqtəsi dayaq və ya asqıdadır. Dayaq üzərindəki cismin çəkisinin istiqaməti səthə perpendikulyardır. Dayaq və ya asqı olmadıqda çəki sıfra bərabər olur. Bu hal çəkisizlik adlanır. Çəkisizlik halının yaranmasını əyaniləşdirmək üçün aşağıdakı simulyatora nəzər yetirək.

1. Simulyatoru nümayiş etdirmək məqsədilə aşağıda verilmiş linkə daxil olaq:

https://www.vascak.cz/data/android/physicsatschool/template.php?s=gp_beztizny&l=tr

**Şəkil 8** Çəkisizlik halının nümayişinə aid virtual laboratoriya işi




2. Ekranda dayaqdan asılan iki dinamometr təsvir olunub (şəkil 8). Dinamometrlərin hər ikisinin göstərişlərini qeyd edin. Göründüyü kimi, dinamometrlərin göstərişləri 5 N-dur.

3. Mausun sol düyməsi ilə ekranın sağ hissəsindəki yaşıl düyməni basın və baş verən hadisəni müşahidə edin (şəkil 9). Dinamometrin dayaqdan ayrıldığı andakı göstərişini qeyd edin. Qırmızı düyməni basmaqla başlanğıc hala qayıdın və prosesi bir neçə dəfə təkrarlayın.

Şagirdlər simulyatordan istifadə zamanı sərbəst düşən dinamometrin göstərişinin sıfır olduğunu müşahidə edərək çəkisizlik halını daha yaxşı mənimsəmiş olurlar. Onlar dayaq

**Şəkil 9** Çəkisizlik halını nümayiş etdirən simulyator




və ya asqı olmadıqda çəkinin sıfra bərabər olmasını virtual laboratoriya işini müstəqil şəkildə yerinə yetirərək öyrənirlər.

## Nəticə

Virtual laboratoriya işləri təcrübələrin real fiziki hadisə və proseslərin müşahidəsi olmadan nümayişinə imkan verən proqram təminatıdır. Fizika dərslərinin məsafədən tədrisi zamanı fiziki hadisə və prosesləri nümayiş etdirmək məqsədilə virtual laboratoriyalardan istifadə zərurəti yaranır (İsmayılov, 2019). Simulyasiyalardan istifadə qısa müddət ərzində fiziki hadisə və prosesləri əyani olaraq nümayiş etdirməyə imkan verir (Sharifov, Maclsaac, 2021) . Virtual laboratoriyalar cihaz və avadanlıq olmadan dərsin müxtəlif mərhələlərində laboratoriya işlərini əvəz edən aparat-proqram kompleksi olmaqla aşağıdakı vəzifələri yerinə yetirir:

1. Əyanilik yaratmaqla təcrübəni ən incə detalları ilə nümayiş etdirməyə imkan verir;
2. Dərs prosesində eyni zaman müddətində bütün şagirdlərin eyni bir fiziki hadisə və prosesi müşahidə etməsinə imkan yaratmaqla təhsildə bərabərhüquqluluğu təmin edir;
3. Sinfə gətirilməsi mümkün olmayan cihaz və avadanlıqların iş prinspini demonstrasiyalar vasitəsilə nümayiş etdirir;
4. Laboratoriya işinin gedişində müəllimin şifahi şərhi ilə paralel olaraq fiziki hadisə və prosesin başvermə mexanizmini əks etdirir (İsmayılov, Tapdıqlı, 2019).

Yeni texnologiyaların inkişafı tədris prosesinin də müasir tələblərə uyğun təşkil edilməsi zərurətini yaradıb. Ona görə də fizikanın tədrisi prosesində yeni texnologiyaların tətbiq edilməsi vacibdir. Çünki yeni texnologiyaların tətbiqi şagirdlərin tədris prosesinə marağının artırması ilə yanaşı, həm də biliklərin daha əyani şəkildə dərk edilərək asan mənimsənilməsinə səbəb olacaqdır. Bu işdə, fizikanın tədrisi prosesində virtual laboratoriya işlərinin əhəmiyyəti tədqiq edilib (Gros, Kinshuk, Maina, 2016). Müəyyən edilib ki, virtual laboratoriya işləri ilə məşğul olarkən şagirdlərdə tədqiqatçılıq bacarığı formalaşır. Gözlə görünməsi mümkün olmayan fiziki proseslərin dərk edilməsi mümkün olur. Simulyatorlardan istifadə zəif nəticə göstərən şagirdlərin fizika dərslərinə marağını artırır.

### İstifadə edilmiş ədəbiyyat


1 Gros, B., Kinshuk, Maina, M. (2016). The Future of Ubiquitous Learning – Learning Designs for Emerging Pedagogies. Lecture Notes in Educational Technology. The Future of Ubiquitous Computing; Springer: Berlin/Heidelberg, Germany.
2 https://phet.colorado.edu/
3 https://www.vascak.cz/physicsanimations.php
4 İsmayılov, İ.N. (2009). Ümumtəhsil məktəblərində fizikanın tədrisində yeni informasiya texnologiyalarından istifadə üzrə işin sistemi. Bakı, 123 s.
5 İsmayılov, İ.N. (2019). Fizikanın tədrisi metodikasının müasir problemləri. Magistr hazırlığı üçün dərslik. Bakı, 75 s.
6 İsmayılov, İ.N., Tapdıqlı, C.V. (2021). Fizikanın tədrisində virtual laboratoriya işlərindən istifadənin bəzi məsələləri. Fizika, riyaziyyat və informatika tədrisi jurnalı, №4, səh. 7-17.
7 Sharifov, G.M. (2022). Effect of a virtual physics laboratory on students achievement in lyceum. International Journal on "Technical and Physical Problems of Engineering". №1, 190-195.
8 Sharifov, G.M., Maclsaac, D. (2021). Effectiveness of a simulated thermodynamics lab in a grade eight lyceum class. Journal Pendidikan Fisika Indonesia 17 (2), 133-140.
9 Tapdıqlı, C.V., Sadıqlı, A. (2021). Ümumtəhsil məktəblərində fizikadan laboratoriya işlərinin məsafədən tədrisinə dair. Pedaqogika jurnalı, №4, s. 71-78.

# EFFEKTİV TƏQDİMATIN LİNQVİSTİK, PSİXOLİNQVİSTİK MEYARLARI VƏ NİTQİN STRUKTURU

**ZABİTƏ TEYMURLU**
Filologiya üzrə fəlsəfə doktoru, Bakı Mühəndislik Universitetinin Azərbaycan dili və pedaqogika kafedrasının dosenti.
E-mail: zteymurlu@beu.edu.az | https://orcid.org/0000-0002-9625-5029

**JALƏ ZEYNALLI**
Filologiya üzrə fəlsəfə doktoru, Bakı Mühəndislik Universitetinin Azərbaycan dili və pedaqogika kafedrasının baş müəllimi.
E-mail: jzeynalli@beu.edu.az | https://orcid.org/0000-0001-5540-1168

**Məqaləyə istinad:**
Teymurlu Z., Zeynallı J. (2023). Effektiv təqdimatın linqvistik, psixolinqvistik meyarları və nitqin strukturu. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 85–96

**ANNOTASİYA**

Monoloji nitqin bir forması olan təşkil olunmuş nitq geniş auditoriyaya xidmət edən kommunikativ prosesdir. Bu prosesi linqvistik, struktur baxımdan düzgün tənzimləmək effektiv təqdimatın hazırlanmasında mühüm rol oynayır. Təqdimatın effektivliyini pozan məqamlardan biri də budur ki, insanlar bəzən fikirlərini çatdırmaqdan qorxur, bəzən isə düzgün çatdıra bilmirlər. Eyni zamanda hər hansı bir səbəbdən natiqin fikirlərinin dolaşıq olması informasiyanın ötürülməsində və anlaşılmasında problemlər yaradır. Bu problemlər də birbaşa nitq və psixikanın əlaqəsi ilə bağlıdır. Effektiv təqdimatın psixolinqvistik meyarlarını təşkil edən bu məqamlar da nitqin effektivliyini təmin edən önəmli faktorlardandır. Məqsədimiz məqalədə qeyd olunan effektin nitq meyarları haqqında maarifləndirmə işləri apararaq insanların dildən düzgün istifadəsini təmin etməkdir. Unutmamalıyıq ki, gələcəyimizin təminatı həm də gözəl, düzgün, səmimi, sağlam danışıqdan keçir. Məqalədə tələbələrin nitqində linqvistik xətaların aşkar edilməsi, bu xətaların düzəldilməsi və səbəblərinin müəyyənləşdirilməsindən bəhs olunub, eyni zamanda Azərbaycan Respublikasının Dövlət Dil Komissiyası yanında Monitorinq Mərkəzinin fəaliyyəti istiqamətində tapşırıqlar verilib və nəticələr göstərilib.

**Açar sözlər:** Effektiv təqdimat, linqvistik meyar, psixolinqvistik meyar, nitqin strukturu, ədəbi dil normaları.

**Məqalə tarixçəsi**
Göndərilib: 14.02.2023
Qəbul edilib: 09.03.2023

# LINGUISTIC AND PSYCHOLINGUISTIC CRITERIA OF AN EFFECTIVE PRESENTATION AND SPEECH STRUCTURE

**ZABITA TEYMURLU**
Ph.D. in Philology, Associate professor of Azerbaijani language and pedagogy department, Baku Engineering University.
E-mail: zteymurlu@beu.edu.az | https://orcid.org/0000-0002-9625-5029

**JALE ZEYNALLI**
Ph.D. in Philology, Senior lecturer of the Azerbaijan language and pedagogy department, Baku Engineering University.
E-mail: jzeynalli@beu.edu.az
https://orcid.org/0000-0001-5540-1168

**To cite this article:**
Teymurlu Z., Zeynalli J. (2023). Linguistic and psycholinguistic criteria of an effective presentation and speech structure. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 85–96

## ABSTRACT

Organized speech, which is a form of monologue speech, is a communicative process that serves a wide audience. Correctly adjusting this process from a linguistic and structural point of view plays an important role in preparing an effective presentation. One of the points that undermine the effectiveness of the presentation is that sometimes people are afraid to convey their ideas, and sometimes they cannot convey the idea properly. At the same time, confusion creates problems in the transmission and understanding of information. These problems are directly related to the relationship between speech and the psyche. These points, which make up the psycholinguistic criteria of effective presentation, are important factors that ensure the effectiveness of the speech. Our goal is to provide people with the correct use of language by raising awareness about the mentioned criteria of effective monologue speech. We must not forget that the guarantee of our bright future goes through beautiful, correct, sincere, and healthy conversation. The article talks about identifying language errors in the speech of students, correcting these errors, and identifying their causes, while tasks were given in the direction of the activities of the Monitoring Center under the State Language Commission of the Republic of Azerbaijan and the results were shown.

**Keywords:** Effective presentation, linguistic criteria, psycholinguistic criteria, speech structure, literary language norms.

**Article history**
Received: 14.02.2023
Accepted: 09.03.2023

## GİRİŞ

“Azərbaycan dilinin saflığının qorunması və dövlət dilindən istifadənin daha da təkmilləşdirilməsi ilə bağlı tədbirlər haqqında” Azərbaycan Respublikası Prezidentinin 2018-ci il 1 noyabr tarixli 323 nömrəli Fərmanının 1-ci və 4-cü hissələrinin icrası nəticəsində Nazirlər Kabinetinin Qərarı ilə Azərbaycan Respublikasının Dövlət Dil Komissiyası yanında Monitorinq Mərkəzi yaradılıb. Nizamnamədə qeyd olunduğu kimi, Monitorinq Mərkəzi ümumdövlət və ictimai əhəmiyyət daşıyan fəaliyyətlə məşğul olur, öz vəzifələrini yerinə yetirərkən və hüquqlarını həyata keçirərkən dövlət və yerli özünüidarəetmə orqanları, beynəlxalq və qeyri-hökumət təşkilatları, digər hüquqi və fiziki şəxslərlə qarşılıqlı əlaqədə fəaliyyət göstərir.

Apardığımız tədqiqat Monitorinq Mərkəzinin sadalanan fəaliyyət istiqamətlərini əhatə edir. Belə ki, araşdırmamızın məlumat bazasını “Azərbaycan dilində akademik və işgüzar kommunikasiya” fənninin tədrisi zamanı qeyri-ixtisas qruplarında təhsil alan tələbələrin şifahi və yazılı nitqlərindən topladığımız materiallar, eyni zamanda tələbələrə verilən tapşırıqlar əsasında televiziya və radioda yayılan verilişlərdə, çap və elektron kütləvi informasiya vasitələrində, reklam, elan və afişalarda, küçə adlarında onların aşkar etdiyi nitq qüsurları təşkil edir.

Tədqiqat işinin məqsədi effektiv monoloji nitq qurmaq bacarığının formalaşdırılmasından ibarətdir. Bu işin yerinə yetirilməsi üçün isə effektiv nitqin yuxarıda qeyd olunan 3 meyarı müəyyənləşdirilir:

1. Azərbaycan dilinin fonetik, leksik-semantik, qrammatik normalarına riayət olunmasının vacibliyini önə çıxaran linqvistik meyar;

2. Nitqin psixika ilə əlaqəsi fonunda üzə çıxan nitq problemlərinin aradan qaldırılması üçün psixoloji sağlamlığın əhəmiyyətini göstərən psixolinqvistik meyar;

3. Nitqin planlı təşkil olunmasını təmin edən önəmli faktorlardan biri olan nitq strukturu.

“Monoloji nitqin əsas məqsədi nitqin əsas kommunikativ növlərindən (təsvir, təsdiqləmə, fikir söyləmə, səciyyələndirmə) istifadə etməklə hər hansı bir məzmunu başqasına çatdırmaqdır. Bu nitq proqramlaşdırılmış, təşkil olunmuş nitqdir. Belə ki, danışan deyəcəklərini əvvəlcədən düşünür, eyni zamanda ifadə edəcəyi fikrin həcmini bilir. Bundan başqa, ifadə edəcəyi fikrin xarakterini müəyyənləşdirir, auditoriyaya müraciət formasını dəqiqləşdirir. Hansı materialları deyəcəyini, müsahibinin və müsahiblərinin səviyyəsini, deyəcəklərinin onlara necə təsir edəcəyini təsəvvüründə qabaqcadan canlandırır” (Xəlilov, 2021).

Qeyd olunduğu kimi, təqdimatın hazırlanması planlaşdırılmış prosesdir. Bu proses əvvəlcədən təşkil olunur. Yəni mövzu seçilir, mövzu ilə əlaqədar ədəbiyyatlar nəzərdən keçirilir; lazımi material və faktlar toplanılır; mövzu üçün plan tərtib edilir; mövzunun həcmi, əhatə dairəsi təyin edilir; fikrin ardıcıllığına nail olmaq üçün bəzi qeydlər aparılır; material sistemləşdirilir; mövzunun məzmunu dərindən öyrənilir; əlverişli ifadə tərzi müəyyənləşdirilir. Tələbənin təqdimatı məhz monoloji nitqə nümunədir. Bu məqamda tələbənin dinləyicisi müəllimi və öz qrup yoldaşlarıdır. Müəllim əvvəlcədən elan etdiyi meyarlara əsasən tələbənin çıxışını dəyərləndirir. Tələbənin çıxışı zamanı nəzərə almalı olduğu meyarlar bunlardır: 1. Norma; 2. Üslub; 3. Sürət; 4. Bədən dili; 5. Nitqə qoyulan tələblər; 6. Səs tonu və intonasiya; 7. Nitqin strukturu; 8. Əyanilik; 9. Auditoriya ilə əlaqə; 10. Arqumentlər və əsaslandırma.

Çıxış zamanı mövzu qısa, aydın və tam şəkildə əks olunmalı, əsas məqamlar vurğulanmalı, mətn lazımsız sözlərlə yüklənməməlidir. Yaxşı təqdimat yığcam olmalı və mövzunu əhatə etməlidir. Natiq tələb olunan məlumatları çatdırmaq potensialına malik olmalı, pozitiv bədən dilindən istifadə edərək əsas məqamları qarşı tərəfə ötürə bilməlidir. “Nitqdə vurğulanan əsas məqamların sayı az olmalıdır. Çıxışın həcmindən asılı olmayaraq, bunların sayının üçdən çox olmaması məsləhət görülür. Çünki auditoriyanın diqqəti və yaddaşı çox məhduddur və hətta ən parlaq çıxışdan belə, yadda saxlana biləcək 2-3 əsas fikir olacaq. Məqsəd bu olmalıdır ki, auditoriyanın yaddaşında məhz sizin istədiyiniz fikirlər qalsın” (Bayramov, 2016).

İstənilən məlumatı çatdırmaq üçün natiq diaqramlar, şəkillər, qrafiklər, cədvəllər, xəritələr və s. kimi əyani vasitələrdən daha çox istifadə etməlidir. Hər bir slayd yalnız məhdud və vacib məlumatları ehtiva etməlidir.

## EFFEKTİV TƏQDİMATDA NİTQİN STRUKTURU

Düzgün tərtib edilmiş mətn, bir növ, naviqator rolunu oynayır. Natiq uğurlu çıxış etmək istəyirsə, nitqini əvvəlcədən müəyyənləşdirilmiş plan əsasında qurmalıdır. Həmin plan nitqin strukturudur. Effektiv təqdimatın hazırlanmasında nitqin strukturunun düzgün təşkili vacib şərtdir. Nitqin strukturunun düzgün qurulmaması dinləyicilərdə fikir dolaşıqlığı yarada bilər. Buna görə də natiq topladığı məlumatları düzgün çatdırmaq üçün bir plan tərtib etməlidir. Bu plan əsasında monoloji nitqə keçid edilir. Nitqin strukturunun qurulmasında üç komponent əsas rol oynayır: Giriş, əsas hissə və nəticə.

***Giriş***

Nitqin strukturunun qurulmasında giriş əsas rol oynayır. Auditoriyanın diqqətini sual verərək, əsas məqamları vurğulayaraq, sitat gətirərək, mövzu ilə əlaqəli əhvalat danışaraq cəlb edə bilərik. Məsələn:

1. Mövzu: *Gənc və yaşlı nəsil qarşıdurması.*

Sual: *Gənclər dünəni bəyənmir, yoxsa yaşlılar bu günü?*

2. Mövzu: *Dinləmə mədəniyyəti.*

Sitat: *Filosof Plutarx deyib: "Dinləməyi öyrənsən, istənilən həmsöhbətdən fayda götürə bilərsən".*

3. Mövzu: *Sosial şəbəkələrdəki üslub və norma pozuntusu.*

Əsas məqamlar: Sözlərin tələffüz şəklinə uyğun yazılması; durğu işarələrindən istifadə olunmaması; Azərbaycan dili klaviaturasından istifadə edilməməsi; qeyri-normativ qısaltmalardan istifadə; üslubların yanlış inteqrasiyası.

4. Mövzu: *Zamanın idarə olunması.*

Sitat: *"Əgər lazımsız işlərə vaxt qalırsa, deməli, hansısa vacib işlərə vaxt çatmayacaq" (Əl Farabi).*

5. Mövzu: *Dilimin ucundakı kəlmələr.*

Sitat: *Söz var ki, gəlib keçər; söz var ki, dəlib keçər...*

Verilən nümunələr şifahi təqdimatların giriş hissəsindən götürülüb. Gördüyümüz kimi, təqdimatın giriş hissəsində mövzu ilə əlaqəli əsas məqamları qeyd edərək, sual verərək, sitat gətirərək diqqət çəkməyə çalışılır və bu şəkildə mövzunun əhəmiyyəti vurğulanır.

Nitq prosesində girişin düzgün təşkili effektiv təqdimatın edilməsində vacib məqamdır.

***Əsas hissə***

Əsas hissə girişdə əks olunan fikirlərin ətraflı izahıdır. Bu hissədə statistik məlumatlar, tarixi faktlar, fikirləri təsdiqləmək üçün istifadə etdiyiniz araşdırmalardan nümunələr və ya tədqiqat nəticələri verilə bilər. Bunlar da fikrin təsdiqini göstərən ünsürlərdir. Əsas hissədə mövzu haqqında məlumatlar əsaslandırılmış şəkildə verilməlidir. Ancaq bu şəkildə auditoriyanı inandıra bilərsiniz. Bu hissədə, əsasən, problem qoyulur və həlli yolları göstərilir. Məsələn:

1. Mövzu: *Gənc və yaşlı nəsil qarşıdurması.*

Problem: *Nəsillər özləri həll edə bilmədikləri problemləri özlərindən sonra gələnlərin üzərinə yıxmağa meyilli olurlar...*

Həlli yolları: *Vəziyyəti idarə etmək öz əlimizdədir. Əvvəlcə dinləməyi, sonra başa düşməyi, bəzən susmağı, bəzən bağışlamağı və ən əsası güzəştə getməyi bacarmalıyıq!*

2. Mövzu: *Dinləmə mədəniyyəti.*

Problem: *İnsanlar hansı hallarda qarşı tərəfi dinləmirlər?*

Həlli yolları: *Kobud olmayın; nitqin strukturunu düzgün qurun; səmimi olun; səsləndirilən fikirlərə görə məsuliyyət daşıyın; öyrədici səs tonu ilə danışmayın; qərəzli münasibət göstərməyin; həmsöhbətinizin üzərində üstünlük nümayiş etdirməyin.*

3. Mövzu: *Vaxtın idarə olunması.*

Problem: *Vaxt dördnala çapan at kimidir: əgər sənin xeyrinə işləməsini istəyirsənsə, onu yüyənləməyi bacarmalısan.*

Həlli yolları: *1. Gündəlik tutun; 2. Həyatımız ən xırda hadisələrdən ibarətdir, onlara diqqət*

*yetirin; 3.Yorulmusunuzsa, istirahətdən imtina etməyin; 4. Ən mühüm işləri qeyd edin, oxşar tapşırıqları qruplaşdırın; 5. Səhərlər ən xoşagəlməz və mürəkkəb işləri yerinə yetirin; 6. Axşamlar zaman ayırıb, gün ərzində etdikləriniz haqqında yazın.*

4. Mövzu: *Uğura gedən yol.*

Problem: *Uğura gedən yolda qarşımıza çıxa biləcək çətinliklər.*

Həlli yolları: *1. Həmişə çəkindiyiniz və verməkdən qorxduğunuz qərarı verməlisiniz; 2. Yatmaq tələbatdır, lakin adətən oyandığınız vaxtdan daha tez oyanmalı olacaqsınız; 3. Bir işdən yayınmaq nə qədər cazibədar olursa olsun, heç vaxt üstünlük olmamalı və sizi narahat etməlidir; 4. Səhvlərinizdən nəticə çıxarmalısınız; 5. Öhdəsindən gəldiyiniz bütün bu çətinliklər sizi formalaşdırır. Orta statistik həyatla uğurlu bir həyatı fərqli edən bunlardır; 6. Çətin olanı seçin; 7. Nə qədər güclü və bacarıqlı olduğunuzu görüb nəticəyə heyran qalacaqsınız.*

5. Mövzu: *Sosial şəbəkələrdə üslub və norma pozuntusu.*

Problem: *Sosial şəbəkələrdə məişət üslubunun üstünlük təşkil etməsi və ədəbi dil normalarının tələblərinə riayət olunmaması.*

Həlli yolları: *Azərbaycan ədəbi dili və üslub normalarına bələd olmaq.*

Problemin həlli yolları göstərilərkən Azərbaycan Respublikasının Dövlət Dil Komissiyası yanında Monitorinq Mərkəzinin nəşrləri kimi etibarlı mənbələrdən istifadə etmək lazımdır.

"Etibarlı mənbə kimi insan (mütəxəssis, alim, ictimai xadim, şirkətin rəhbəri), təşkilat (araşdırma mərkəzi, universitet, beynəlxalq qeyri-hökumət təşkilatı) və ya yazılı material (elmi məqalə, araşdırmanın nəticələri, şirkətin hesabatı) götürülə bilər" (Bayramov, 2016).

***Yekun hissə***

Bu hissə giriş və əsas hissədə verilən məlumatların yekunu istiqamətində olmalıdır. Sonda əsaslandırdığınız fikrə təkan olaraq mövzu ilə bağlı mövqe bildirilməlidir. Unutmamalıyıq ki, yekun hissə bir çox hallarda auditoriyanın təqdimat haqqında qərarına təsir edəcək.

1. Mövzu: *Gənc və yaşlı nəsil qarşıdurması.*

Giriş: *Gənclər dünəni bəyənmir, yoxsa yaşlılar bu günü?*

Problem: *Nəsillər özləri həll edə bilmədikləri problemləri özlərindən sonra gələnlərin üzərinə yıxmağa meyilli olurlar...*

Problemin həlli: *Vəziyyəti idarə etmək öz əlimizdədir. Əvvəlcə dinləməyi, sonra başa düşməyi, bəzən susmağı, bəzən bağışlamağı və ən əsası güzəştə getməyi bacarmalıyıq!!!*

Yekun: *Bir gün sən də qocalacaqsan!*

2. Mövzu: *Dinləmə mədəniyyəti.*

Giriş: *Filosof Plutarx deyib: "Dinləməyi öyrənsən, istənilən həmsöhbətdən fayda götürə bilərsən".*

Problem: *İnsanlar hansı hallarda qarşı tərəfi dinləmirlər?*

Həlli yolları: *Kobud olmayın; nitqin strukturunu düzgün qurun; səmimi olun; səsləndirilən sözlərə görə məsuliyyət daşıyın; öyrədici səs tonu ilə danışmayın; qərəzli münasibət göstərməyin; həmsöhbətinizin üzərində üstünlük nümayiş etdirməyin; inandırıcı olun.*

Yekun hissə: *Bir çox hallarda dinləmək bacarığı danışmaq bacarığından daha üstündür. Dinləyin və faydalanın.*

3. Mövzu: *Vaxtın idarə olunması.*

Problem: *Vaxt dördnala çapan at kimidir: əgər sənin xeyrinə işləməsini istəyirsənsə, onu yüyənləməyi bacarmalısan.*

Həlli yolları: *1. Gündəlik tutun; 2. Həyatımız ən xırda hadisələrdən ibarətdir, onlara diqqət yetirin; 3. Yorulmusunuzsa, istirahətdən imtina etməyin; 4. Ən mühüm işləri qeyd edin, oxşar tapşırıqları qruplaşdırın; 5. Səhərlər ən xoşagəlməz və mürəkkəb işləri yerinə yetirin; 6. Axşamlar zaman ayırıb, gün ərzində nə etdiyiniz haqqında yazın.*

Yekun: *Zamanın keçməyini gözləmə, zamanı keç.*

4. Mövzu: *Uğura gedən yol.*

Problem: *Uğura gedən yolda qarşımıza çıxa biləcək çətinliklər.*

Həlli yolları: *1. Həmişə çəkindiyiniz və verməkdən qorxduğunuz qərarı verməlisiniz; 2. Yatmaq tələbatdır, lakin adətən oyandığınız vaxtdan daha tez oyanmalı olacaqsınız; 3. Bir işdən yayınmaq nə qədər cazibədar olursa olsun, heç*

*vaxt üstünlük olmamalı və sizi narahat etməlidir; 4. Səhvlərinizdən nəticə çıxarmalısınız; 5. Öhdəsindən gəldiyiniz bütün bu çətinliklər sizi formalaşdırır. Orta statistik həyatla uğurlu bir həyatı fərqli edən bunlardır; 6. Çətin olanı seçin; 7. Nə qədər güclü və bacarıqlı olduğunuzu görüb nəticəyə heyran qalacaqsınız.*

Yekun hissə: *Uğura aparan yol zəhmətdən keçir.*

5. Mövzu: *Sosial şəbəkələrdə üslub və norma pozuntusu.*

Problem: *Sosial şəbəkələrdə məişət üslubundan istifadə edilməsi.*

Həlli yolları: *Azərbaycan ədəbi dil normalarına bələd olmaq.*

Yekun hissə: *Azərbaycan Respublikasının dövlət dilinin tətbiqinə kompleks qaydada nəzarət edilməlidir.*

Nəticə olaraq demək olar ki, effektiv təqdimatın hazırlanmasında əsas meyar nitqin strukturunun düzgün qurulmasıdır. Nitqin strukturu 3 əsas hissədən ibarətdir: Giriş – mövzunun qısa xülasəsi; 2. Əsas hissə – problemin əsaslandırılmış həlli yolları; 3. Yekun hissə – məntiqi qənaət.

## EFFEKTİV TƏQDİMATIN LİNQVİSTİK MEYARI

Təqdimatın effektivliyini təmin edən meyarlardan biri də şifahi və yazılı nitq prosesinin linqvistik göstəricilərinin keyfiyyətli olmasıdır. Linqvistik meyarlar dedikdə,

- nitqə qoyulan başlıca tələblər: nitqin aydınlığı, yığcamlığı, rabitəliliyi, münasibliyi, təmizliyi, orijinallığı və s.;
- ədəbi dilin normaları: fonetik (orfoepik və orfoqrafik), leksik, qrammatik (morfoloji və sintaktik) normalar;
- nitq prosesində ədəbi dilin funksional üslublarının düzgün müəyyənləşdirilməsi nəzərdə tutulur.

Araşdırma əsasında tələbələrin şifahi və yazılı nitqindəki qüsurlar yuxarıda qeyd olunan linqvistik meyarları əhatə edir və fonetik, leksik, qrammatik norma pozuntuları kimi təqdim olunur. Hər bir normanın tələbləri və onların pozulduğu hallara nümunələr əsasında nəzər yetirək:

***Fonetik norma***

Başqa sözlə desək, ədəbi dilin səs sistemini öyrənən norma olan fonetik normanın tələbləri orfoepiya və orfoqrafiya qaydalarını tənzimləyir.

Orfoepiya qaydaları – səslərin düzgün tələffüz qaydalarıdır:

- sözlərin ədəbi dilin tələffüz qaydasına uyğun şəkildə tələffüzü, yəni yazılış və deyiliş arasındakı fərqlərin formalaşdırdığı səs dəyişmələri;
- səslərin sözlərdə ahəng qanununa uyğun düzülüşü, yəni sait və samitlərin ahənginin qanunauyğun şəkildə tənzimlənməsi ilə düzgün tələffüzü;
- şəkilçilərin sözlərə ahəng qanununa uyğun artırılması fonunda sözlərin düzgün tələffüzü;
- şəkilçilərin, samit və saitlərin düzgün, ədəbi tələffüz normalarına, əsasən, tələffüzü, söz və şəkilçi arasındakı münasibətlərdə səs dəyişmələri;
- ixtisar və qısaltmaların, vurğunun tələffüz qaydası.

Orfoepik normanın tələblərinin ən çox rast gəlinən pozulma hallarına əldə etdiyimiz nümunələr əsasında diqqət yetirək:

1. Yazılış və deyiliş arasındakı fərqlərin formalaşdırdığı səs dəyişmələrinin orfoepiya qaydasına əsasən düzgün tələffüz edilməməsi.

Bu məqamda aşkar edilmiş fonetik norma pozuntularına misal olaraq *[istiyirəm]* əvəzinə *[istəyirəm]*, *[payeziya]* əvəzinə *[poyeziya]*, *[pazitiv]* əvəzinə *[pozitiv]*, *[prases]* əvəzinə *[proses]*, *[fanetik]* əvəzinə *[fonetik]* yanlış tələffüz nümunələrini gətirmək olar. Bu qəbildən olan norma pozuntularının səbəbi bəzi insanların kitab üslubunda – hərfi üslubda danışmağa meyilli olmasıdır.

Professor N.Əhmədli məsələyə münasibətini bu şəkildə bildirir: "Bəzilərinə elə gəlir ki, kitab cümlələri ilə danışmaq, sözü yazıldığı kimi tələffüz etmək yüksək savadlılıq əlamətidir. Əslində isə belə deyil. Yazının öz qaydaları olduğu kimi, danışığın da öz normaları var və onlara əməl etmək hamının borcudur" (Əhmədli, 2017).

"Kitab üslubunda danışanlar, oxuyanlar sözlərin yazılışını, hərf tərkibini əsas götürür və belə başa düşürlər ki, sözlər nə cür yazılırsa, elə də tələffüz edilməlidir. Belə deyiliş ədəbi tələffüz baxımından qüsurlu sayılır. Natiq bu qəbildən olan, yəni orfoepiyası orfoqrafiyasından fərqlənən söz və qrammatik formaları ədəbi tələffüz qaydasında söyləməli və ya oxumalıdır" (Abdullayev, 2015).

2. Vurğunun tələffüz qaydasının pozulduğu hallar.

Orfoepik normanın əsas tələblərindən biri də aksentuasiya, yəni vurğunun düzgün qoyulması məsələsidir. Nitqlərdə vurğu ilə bağlı pozuntu halına ən çox aşağıdakı halda rast gəlinib:

*[Neqati`v]* əvəzinə *[ne`qativ], [poziti`v]* əvəzinə *[po`zitiv], [allergi`ya]* əvəzinə *[alle`rgiya], [İngi`ltərə]* əvəzinə *[İngiltə`rə]* və s.

Bu kimi hallara daha çox ingilis dilində təhsil alan qeyri-ixtisas qruplarındakı tələbələrin dilində rast gəlinir. Belə ki, [ne`qativ], [po`zitiv] kimi tələffüz qaydası əcnəbi dilə məxsus tələffüz qaydasıdır.

Alınma sözlərin dilimizə keçməsində vasitəçi olan dillərin və yaxud da sadəcə hər hansı bir dilin tələffüz qaydasının təsirinə məruz qalmaq da orfoepik norma ilə bağlı pozulma hallarına səbəb olur. Məsələn, *[İngi`ltərə]* əvəzinə *[İngiltə`rə], [filan]* əvəzinə *[falan]* tələffüzünə türk dili istifadəçilərinin və dinləyicilərinin, [stəkan] əvəzinə [stakan] tələffüzünə rus dilinin təsirindən qurtara bilməyən təbəqənin dilində rast gəlinir.

Ə. Dəmirçizadə tələffüzü müxtəlif orfoepik üslublar adı altında sistemləşdirir və qeyd olunan orfoepik qüsurlu nümunələrə bənzər nümunələri sərbəst üslubun əcnəbilik çalarlığı, yəni başqa dillərə xas olan çalarlıqlar adı altında təsnif edir (Dəmirçizadə, 2007).

Bu kimi hallara milli teleradio məkanında da tez-tez təsadüf olunur: Rus dilində tərkibində *"ц (ts)"* olan ümumi isimlər azərbaycanca *s* ilə *(цирк – sirk; лицей -lisey; абзац -abzas),* xüsusi isimlərdə isə sözün əvvəlində *s (Циалковский – Sialkovski),* ortasında və sonunda isə *ts* ilə yazılır və deyilir: *Кузнецов – Kuznetsov; Муромец – Muromets.* Televerilişlərdən nümunələr: "İctimai təşkilat və siyasi partiyalardan olan müşahidəçilərin qeydiyyat *protsesi* başa çatıb"; "Yeni il münasibəti ilə *tsirkdə* təşkil olunmuş tamaşa uşaqların xoşuna gəlmişdir". Əslində, *[prases]* və *[sirk]* deyilməli idi. Rus dili vasitəsilə dilimizə keçmiş və ruscada *"ь"* işarəsi ilə müşayiət edilən, yəni yumşaq tələffüz olunan samitlər Azərbaycan dilində sözün ortasında yumşaq, sonunda isə sərt deyilir: *пальто – pal(ь)to, роль – rol.* Demək olar, bütün aparıcılar və verilişlərdə iştirak edən aktyorlar bu cür sözlərin sonunu da yumşaldırlar: "Mənə bu *rol(ь)* həvalə olunanda məsuliyyətini yaxşı dərk edirdim"; *"Ansambl(ь) qostrol(ь)dan* təzəcə qayıdıb" (Əhmədli, 2017).

3. Fonetik dialektizmlərdən istifadə.

Müxtəlif şivələrin daşıyıcıları olan tələbələrin nitqində dialekt tələffüzünə təsadüf olunur:

- *Nəyə – neyə, həyəcanlanmaq – heyecanlanmaq, çəkmə – çekmə, dəyirman – degirman, inək – ineg, ələk – əleg* və s. Bu hal şimal-şərq ləhcəsinin səciyyəvi xüsusiyyətlərindəndir və sözün birinci və ikinci hecalarında açıq *"ə"* saitinin yarımqapalı *"e"* saitinə keçidi əsnasında müşahidə olunur (Əzizov, 2016).
- *işdemeg, yeməg, üreg, kiçig, ineg* və s. – *k>g; g* keçidi də şimal-şərq şivələrinin xarakterik xüsusiyyətidir. Bu şivələrdə çoxhecalı sözlərin sonunda *"g"* səsinin tələffüzü geniş yayılıb (Məmmədli, 2019).
- Qərb ləhcəsinin səciyyəvi xüsusiyyətlərindən olan mən, sən əvəzliklərinin yönlük halda mañə, sañə formasında işlənməsi. Ümumiyyətlə, bəzi tələbələrin nitqində əvəzliklərin müxtəlif formalarına təsadüf edilir: *mañə, sañə, maə̃, səə, həylə, belənçik, eləncig, budey, odey və s.*
- *Xalx, bayax/bəyağ və s.– q>x; q>ğ* dəyişməsi qərb, cənub və şimal qərb şivələrində üstünlük təşkil edir (Məmmədli, 2019).
- Sözün əvvəlinə *"i"* səsinin artımı hadisəsi: *istəkan//iskan//istikan, ispirt* və s.
- Sözün birinci hecasında yarımqapalı *"e"* saitinin açıq *"ə"* saitinə keçidi: *deyil>dəyil, yenə>gənə* və s. *E>ə* dəyişməsi Azərbaycan dilinin cənub şivələrində geniş yayılıb (Əzizov, 2016).

• Dialekt fonetikasının səciyyəvi xüsusiyyətlərindən olan *"ı"* və *"i"* saitlərinin düşməsi: hamsı, yadma, danşır, qarşığ, həmşə, yarsı, çalşır və s. (Məmmədli, 2019).

• Qərb bölgəsindən olan tələbələrin nitqində *c>j* əvəzlənməsinə təsadüf edilir: *goja, bajı, balaja, gedəjəm* və s.

• Söz ortasında və sonunda *"g"* səsinin işlənməsi: *ignə, dügi, gög* və s. Bu hadisə şimal-şərq ləhcəsinə xas fonetik xüsusiyyətdir (Məmmədli, 2019).

• Dialektlərdə *"-gıl, -gil"* əmr şəkilçilərinə ancaq *"-qınan, -ginən"* mürəkkəb şəkilçilərin tərkibində rast gəlinir: *gəlginən, görginən* və s. (Şirəliyev, 2008). Tələbələrin nitqində yazginən şəklində istifadəyə təsadüf edilib.

• *Gəlif, gedif* və s. – Azərbaycan dili dialektlərinin qərb ləhcəsində və Zaqatala, Qax dialektlərində nəqli keçmiş zaman *-ıf* şəkilçisi ilə ifadə olunur (Məmmədli, 2019).

Sözlərin dialekt tələffüzünü Ə.Dəmirçizadə sərbəst üslubun şivəçilik çaları (Dəmirçizadə, 2007), N.Abdullayev isə dialekt xüsusiyyətli tələffüz tərzi adlandırır (Abdullayev, 2015).

10-cu sinfin Azərbaycan dili dərsliyində də tələffüz səhvləri mövzusuna yer ayrılıb. Filologiya elmləri doktoru, professor İsmayıl Məmmədli "Füyuzat" jurnalında dərc etdirdiyi məqaləsində tələffüz səhvlərini dialekt tələffüzü və orfoqrafik tələffüz adı altında qruplaşdırır (Hacıyev, Bektaşi, Hüseynova, 2022). Müxtəlif mənbələrdə fərqli adlarla adlandırılmasına baxmayaraq dialektlərdən istifadə ədəbi dil üçün xarakterik deyil.

4. Elvari xarakterli tələffüz üslubu.

Ədəbi dil üçün xarakterik olmayan digər bir üslub da N.Abdullayevin adi üslub, Ə. Dəmirçizadənin sərbəst üslub adlandırdığı elvari xarakterli tələffüz üslubudur.

Şivəyə nisbətən ədəbi dilə daha yaxın olsa da, ədəbi dilə xarakterik olmayan elvari üslubda tələffüz olunan sözlərə nümunə olaraq: hasant, gə gedəy, mə`mçün, siznən, məniynən və s. kimi sözləri göstərmək olar.

### *Leksik norma*

Ədəbi dilin leksik normasının əsas şərti fikrin ifadəsi üçün sözlərin məna incəlikləri nəzərə alınaraq, birbaşa tələb olunan sözün, ifadənin dəqiq seçilib işlədilməsidir. Eyni zamanda ədəbi dildə istifadəsi məqbul sayılmayan sözlərdən (loru sözlər, varvarizmlər, vulqar sözlər, dialektlər, jarqonlar, arqolar, köhnəlmiş sözlər və s.) istifadə, nitqə verilən başlıca tələblərə (dəqiqlik, düzgünlük, aydınlıq, təmizlik, orijinallıq və s) riayət olunmaması, nitqdə uzunçuluğa, yersiz təkrarlara yol verilməsi halları da ədəbi dilin leksik normasını pozan hallardandır.

Tələbələrin nitqindəki təqdimat zamanı ədəbi dilin leksik normasını pozan hallar düzgün qarşılığı verilərək aşağıdakı şəkildə sistemləşdirilib:

1. Fikrin ifadəsi üçün sözlərin məna incəlikləri nəzərə alınmadan yanlış, qeyri-dəqiq ifadələrin seçilib istifadə olunması:

*Həyatın fərqli cürə pəncərələri var – Həyata fərqli rakurslardan baxmaq olar.*

*Çiynində həyatın yükləri mövcuddur – Çiyinlərində həyatın ağır yüklərini daşıyır.*

*Dəyişməyə qeyrət (cəhd) edirəm.*

*Həyata pozitiv cəhətdən baxın ("cəhətdən" sözü artıqdır).*

*Bunun yaxşı bir xəbəri (tərəfi) də var – İşin müsbət tərəfi bundan ibarətdir ki...*

*Pozitiv aura bəxş etmək – pozitiv enerji vermək, xoş əhval-ruhiyyə bəxş etmək*

*Fərman verilmişdir – Qərar qəbul edilmiş və fərman imzalanmışdır.*

*Dilin dövlət səviyyəsində qorunmasını təkmilləşdirdi – Dilin saflığının qorunması və dövlət dilindən istifadənin təkmilləşdirilməsi*

*Yuxarı (yüksək/ali) rütbə*

*Laçını götürdük (işğaldan azad etdik)*

*Kəndlər bir-bir gedəndə (işğal olunanda).*

Nümunələrin düzgün qarşılıqları verilərkən onların ifadə etdiyi mənalara söz birləşməsi, cümlə daxilində yanaşılıb. Kontekst içində Azərbaycan dilinə spesifik formada fərqli şəkildə də ifadə etmək mümkündür. Məsələn:

*Bu yaş kiçik – /az/ görünə bilər, amma... – Yaşın az olmasına baxmayaraq...*

*Məsələlərə detallı girməyib – /yanaşmayıb/ – Məsələləri təfərrüatlı izah etməyib.*

2. Tələbələrin çıxış zamanı istifadə etdiyi varvarizmlər də diqqət çəkən məqamlardandır:

*Stipendiya – təqaüd; Uje – artıq; Delavoy – işgüzar; Vsyo – bu qədər, kifayətdir, yetərlidir, bəsdir; Plyus – üstəgəl / əlavə olaraq; Prosto – sadəcə; Starosta – sinif nümayəndəsi.*

Gənclər bəzi məlumatları Türkiyə türkcəsində olan qaynaqlardan araşdırdıqlarına görə çıxış zamanı həmin dilə xas olan sözlərdən istifadə halları müşahidə edilir:

*Baxış açısı – baxış bucağı; Merak etmək – maraq göstərmək; Yarqılamaq – mühakimə etmək; Acımaq – yazığı gəlmək, ürəyi yanmaq, halına yanmaq; Çoğunluq – çoxluq, əksəriyyət; Qeyret etmək – səy göstərmək; Yansıyır – əks olunur; Yaşam şəraiti – həyat şəraiti.*

3. Leksik normanın pozulduğu hallardan biri də nitqi ağırlaşdıran yersiz təkrarlardır: *imtahan müddəti zamanı, fəaliyyət fəallaşdı, həyat fəaliyyətini həyata keçirtmək, daha bir kitab daha* kimi uzunçuluğa yol açan yersiz ifadələrə tələbələrin nitqində rast gəlinir.

4. Arqolar – məhdud təbəqə təşkil edən insanlar arasında istifadə olunan bəzi sözlər bu gün yeni nəslə məxsus xüsusi leksika formalaşdırır. Bu kimi sözlər ədəbi dil normalarını pozur: *Görüldü atmaq – mesajı oxuyub cavab verməmək. Trollamaq – qalmaqal yaratmaq, süni gündəm yaratmaq, sataşmaq, söz atmaq və s.*

### *Qrammatik norma*

Ədəbi dilin qrammatik norması sözlər və cümlələr arasındakı əlaqələrin nitqdə düzgün qurulmasını tələb edir. Bu tələbin pozulduğu hallara aiddir:

- Adlara və feil köklərinə artırılan şəkilçilərin ardıcıllığının pozulması;
- Sözün tərkibində heç bir funksiyası olmayan artıq şəkilçilərin istifadəsi;
- Müəyyən miqdar və qeyri-müəyyən saylardan sonra gələn isimlərin cəmdə işlədilməsi;
- Bir cümlədə və ya mətni təşkil edən cümlələrdə zaman uzlaşmasının pozulması, yəni müxtəlif zaman formaları işlədilərək nitqin aydınlığını pozan qeyri-sabit zamanın mövcudluğu;
- Bir cümlədə iki inkar göstəricisinin olması;
- Yanaşma, idarə və uzlaşma əlaqələrinin pozulması.

Qrammatik norma özlüyündə morfoloji və sintaktik normalara ayrılır. "Morfologiya və sintaksis dilin qrammatik quruluşundan bəhs etsə də, dilin leksik-qrammatik mənalarına, morfoloji əlamətlərinə, sintaktik formalarına görə özünəməxsus əlamət və xüsusiyyətləri-qrammatik məfhumların mühüm və ümumi əlamətlərinin norması vardır" (Saytların monitorinqi ilə bağlı hesabat, 2021).

### *Morfoloji norma*

Qeyd olunan qrammatik normaların tələbələrin nitqində ən çox rast gəlinən pozulma hallarına nümunələr əsasında diqqət yetirək:

1. Sözün tərkibində heç bir funksiyası olmayan artıq şəkilçilərin istifadəsi:

Tələbələrin nitqlərində müşahidə olunan *sakitçilik, xoşbəxtçilik, öhdəçilik, müsəlmançılıq* kimi sözlərin tərkibindəki *–çi* şəkilçisinin funksiyası yoxdur, sözlərin ancaq zahirən dəyişməyinə xidmət edir. Nə digər sözlərlə əlaqələndirici funksiyası, nə də kök-şəkilçi münasibətində rolu var. Eləcə də, *"pəncərəni açan zamanı"*, *"insanların hər yalanlarında"* nümunələrində *"zamanı"* sözündəki artıq *"–ı"* və "yalanlarında" sözündəki *"–lar"* şəkilçilərinin istifadəsi də dilin morfoloji normasını pozur.

2. Feil köklərinə artırılan şəkilçilərin ardıcıllığının pozulması: danışarlardı, deyərlərdi.

3. Müəyyən miqdar və qeyri-müəyyən saylardan sonra gələn isimlərin cəmdə işlədilməsi: *Heç bir insanlar, iki mərhələlərdən keçmişdir, bir neçə qruplara bölünür, anlaşıqlı bir cümlələrdən, belə bir ifadələr, bir neçə məsələlər, fərqli bir xüsusiyyətlər.*

### *Sintaktik norma*

"Sintaktik norma "fikrin maddi dil cildinə salınması qaydaları"dır; sintaktik quruluş sözlərin söz birləşməsi və cümlə şəklində, cümlələrin mətn şəklində əlaqələnməsi qaydalarının məcmusu və sistemidir" (Saytların monitorinqi ilə bağlı hesabat, 2021).

1. Bəzən sözlər arasındakı idarə əlaqəsini təmin edən şəkilçilər ya ixtisar olunur, ya artıq yazılır, ya da dəyişdirilir. Bu zaman idarə itir və nitqin strukturu pozulur: *rus bölməsi (ndə)*

*oxuyur, fırıldaq yolla (rdan) istifadə edərək, sözdən xoşuma (xoşum) gəlir (söz xoşuma gəlir).*

2. Nitq kommunikasiyasında sözlər müəyyən düzülüş qaydasına malik olmalıdır: mübtəda cümlənin əvvəlində, xəbər sonunda, təyin isim və isimlə ifadə olunan üzvdən əvvəl, tamamlıq ismi və feili xəbərin, zərflik xəbər, xəbər qrupunun əvvəlində işlənir (Abdullayev, 2015). Bu ardıcıllığın pozulması isə cümlənin mənasının anlaşılmasında çətinlik törədir, nitqin aydınlığına, səlisliyinə xələl gətirir: *izah edəcəyim bundan sonra mövzu, öyrənməyi başqalarının fikirlərini bacarmalıyıq və s.*

3. Uzlaşma əlaqəsinin pozulma halları: *həmin günlər gözləyirlər, hamı insanları qüsurlu olaraq qəbul etməlidirlər və s.*

## EFFEKTİV TƏQDİMATIN PSİXOLİNQVİSTİK MEYARI

Effektiv təqdimatın psixolinqvistik meyarı dedikdə, nitqlə psixikada gedən proseslərin əlaqəsi fonunda nitqin keyfiyyətinin, effektivliyinin dəyərləndirilməsi nəzərdə tutulur. Bu mənada istər verbal, istərsə də qeyri-verbal ünsiyyət zamanı qurduğumuz nitq və nümayiş etdirdiyimiz davranışlar bizim daxili dünyamızdan, psixikamızda gedən proseslərdən xəbər verir. Yəni nitq və psixika bir bütündür.

İnsanların nitqindəki psixoloji prosesləri öyrənmək psixolinqvistikanın vəzifəsidir. Bu istiqamətdə apardığı araşdırmalarında professor F.Veysəlli məsələyə bu şəkildə münasibət bildirir: “Psixoloqların insanın dil davranışlarını müşahidə etməsi nəticəsində məlum olur ki, bu müşahidələr həm praktik, həm də elmi-nəzəri problemlərin müəyyənləşdirilməsi, düzgün danışıq vərdişlərinin aşılanması, dillə, sözlə və sözsüz (verbal və nonverbal) ünsiyyətin müəyyənləşməsi və s. psixolinqvistikanın inkişafına təkan verən amillərdir” (Veysəlli, 2007).

A.Babayev də ritorika ilə psixologiyanın bağlılığını bu şəkildə əsaslandırır: “İnsan düşünəndə və danışanda onun bütün beyin qabığı fəaliyyətdə olur. Bu prosesdə nitq mərkəzi xüsusi fəaliyyətdə olmalıdır ki, səs siqnallarını analiz edərək onu mənalandıra bilsin. Bu proses həm dinləmə, həm də danışma zamanı fəal sürətdə davam edir.İnsanın danışıq zamanı hansı psixi prosesin təsiri altında olması həlledici rola malikdir. Əgər ritor müsbət emosiyaların təsiri altındadırsa, onda onun psixolinqvistik mexanizmi açıq olur, nəticəcədə nitqi gözəl olur. Əksinə, mənfi emosiyaların təsiri altında olduqda psixolinqvistik mexanizm sanki bağlı olur. Bu vaxt adam bildiyini də danışa bilmir” (Babayev, 2011).

Firudin bəy Köçərli nitqlə psixikanın əlaqəli olmasını, nitqin aydınlığını təfəkkürün düzgün işləməsi, fikrin düzgünlüyü ilə əlaqələndirərək əsaslandırır: “Bizim yəqinimizdir ki, dili dolaşıq şəxsin fikri də dolaşıqdır. Doğru və salamat fikirli adamların kəlamı həmişə aydın, açıq və düzgün olur” – deyirdi (Abdullayev, 2015).

Deyilənləri əsas götürərək, təqdimat prosesində tələbələrin nitqinin keyfiyyətinin aşağı olmasının səbəblərindən birinin onların psixoloji vəziyyəti ilə əlaqəli olduğu aşkarlandı. Belə ki, tələbə nə qədər mövzuya hakim olsa da, nitqin struktur prinsiplərinə və linqvistik meyalarına nə qədər riayət etsə də, əgər psixoloji problemləri varsa, bu, mütləq onun nitqində əks olunur. Məsələn, yaşadığı mənfi hadisələr nəticəsində aldığı travmalar onlarda sosial fobiya, özgüvən problemi, apatiya, utancaqlıq, müxtlif xarakterli qorxular və s. formalaşdırır. Bu da birbaşa onların nitqlərində təzahür edir.

Problemlər, əsasən, özgüvən, özdəyər, özsevginin olmamasından qaynaqlanır. Sevgi, qayğı əskikliyindən əziyyət çəkən fərdlər uşaqlıqdan ailəsi, müəllimləri, yaxın ətrafı tərəfindən sevgi görmədikləri üçün onlarda özgüvən əskikliyi formalaşır. Çünki sevgi görməyən, emosional və fiziki şiddət görən fərd özünü sevgiyə layiq bilmir, sevməyi və sevgi verməyi bacarmır, bu da ətrafla konfliktlərə və özgüvənsizliyə yol açır. Özgüvəni olmayan bir fərd isə auditoriya qarşısında söz deməyə çəkinir, gülüş obyekti olmaqdan qorxur, həyəcanlanır və s.

Tələbələr təqdimat zamanı həyəcanlarını cilovlamağı bacarmadıqları üçün biliklərini təqdim edə bilmirlər. Həyəcan nitqin sürətinin artmasında, unutqanlıqda, fikir dolaşıqlığında, mətnin məntiqi ardıcıllığının pozulmasında

və s. özünü göstərir. Həyəcanın təməlində duran özgüvənsizlik fərddə "birdən bacarmaram", "uğurlu ola bilməyəcəm" kimi avtomatik fikirlər formalaşdırır. Bu da nitqin keyfiyyətinə xələl gətirir.

Bəzən tələbələr təqdimatlarını yüksək səviyyədə hazırlayıb yüksək göstəricilər qazanmaq üçün səy göstərmirlər. Bu hal onların işə məsuliyyətlə yanaşmamasından, etinasızlığından, minimumla kifayətlənmək və s. kimi xüsusiyyətlərindən qaynaqlanır. Bunun müxtəlif səbəbləri ola bilər. Belə ki, istər uşaqlıq dövründə, istərsə də həyatın digər mərhələlərində ətrafdan özünə qarşı etinasızlıq görüb psixoloji zərbə alan bir tələbədə özünə, öz fəaliyyətinə qarşı etinasızlıq formalaşa bilir. Etinasızlıq isə fərdin özgüvənini sarsıdaraq yüksək deyil, minimum göstəricilərlə kifayətlənməsinə gətirib çıxara bilər.

Bu kimi problemlərin çoxşaxəli səbəblərindən geniş danışmaq olar. Məqsədimiz əsas təşkil edən psixoloji məqamları önə çıxararaq psixi sağlamlığın nitqin keyfiyyətindəki önəmini irəli sürmək, təqdimatın effektivliyindəki əhəmiyyətli rolunu vurğulamaqla müəllim və valideynlərə bu işin ciddiyyətini aşılayaraq məsuliyyətini dərk etmələrini təmin etmək, eyni zamanda tələbələrə öz həyat keyfiyyətinin məsuliyyətini ətrafa yükləmədən öz boyunlarına çəkərək sağlam addımlar atmağa təşviq etməkdir.

Nəticə olaraq qeyd etmək istərdik ki, effektiv təqdimatın qeyd olunan hər üç meyarı nitqin keyfiyyətində bərabər şəkildə əhəmiyyət kəsb edir və hər üç istiqamətdə maarifləndirmə işləri aparmaq zərurətini doğurur. Zərurət isə ehtiyacdan yaranır. Belə ki, bütün cəmiyyətlərdə olduğu kimi, bizim cəmiyyətdə də ana dilinin saflığının qorunması və təkmilləşdirilməsi istiqamətində faydalı işlər görən sağlam fərdlərə, gözəl natiqlərə hər zaman ehtiyac vardır.

Aparılan araşdırma istər ali təhsil müəssisələrində "Akademik və işgüzar kommunikasiya" fənninin, istərsə də orta məktəblərdə "Azərbaycan dili" fənninin tədrisi zamanı praktiki əhəmiyyətli material kimi istifadə oluna bilər. Araşdırmanın aparılmasını zəruri edən məqamlardan biri də tələbələrin yazılı və şifahi nitqlərində aşkar olunan, orta məktəb proqramının müəyyən materiallarını mənimsəmədiklərini əks etdirən qüsurlardır. Araşdırma materialının orta məktəblər üçün xüsusi əhəmiyyəti də məhz bundan ibarətdir ki, məktəb dövründə şagirdlərin nitqinin təkmilləşdirilməsi prosesində araşdırmada qeyd olunan meyarlar istiqamətində daha ciddi işlər aparılsa, məktəb dövrünü başa vurub ali təhsil ocağında təhsilə başlayan gənclər daha gözəl nitq qabiliyyətinə malik, daha sağlam dil istifadəçisi kimi geniş ictimaiyyətə faydalı olarlar.

**İstifadə edilmiş ədəbiyyat**


1. Abdullayev, N. (2015). Nitq mədəniyyətinin əsasları. Bakı: "MBM" nəşriyyatı.
2. Azərbaycan dilinin dialektoloji lüğəti. (2007). Bakı: "Şərq-Qərb" nəşriyyatı.
3. Azərbaycan dilinin orfoqrafiya lüğəti. (2021). Bakı: "Elm" nəşriyyatı.
4. Azərbaycan Respublikasının Dövlət Dil Komissiyası yanında Monitorinq Mərkəzi. https://monitorinqmerkezi.az/
5. Babayev, A. (2011). Azərbaycan dili və nitq mədəniyyəti. Bakı: "Elm və təhsil" nəşriyyatı.
6. Bayramov, R. (2016). Sözünə güvən. Bakı: "Parlaq İmzalar MMC" nəşriyyatı.
7. Dəmirçizadə, Ə. (2007). Müasir Azərbaycan dili. Fonetika, Orfoepiya, Orfoqrafiya. Bakı.
8. Dublajlar və Azərbaycan dili. (2022). Bakı:"Elm və təhsil" nəşriyyatı.
9. Elbrus, Ə.İ. (2016). Azərbaycan dilinin tarixi dialektologiyası: Dialekt sisteminin təşəkkülü və inkişafı. Dərs vəsaiti. 2-ci nəşri. Bakı: "Elm və təhsil" nəşriyyatı.
10. Əhmədli, N. (2017). Milli teleradio məkanında ədəbi dil normalarına necə əməl olunur? "Xalq qəzeti", 25 noyabr.
11. Hacıyev, T., Bektaşi, S., Hüseynova, Y. (2022). Azərbaycan dili-10(dərslik). Bakı: "Şərq-Qərb" nəşriyyatı.
12. Həsənzadə, N., Pənahova, G., Abbasov, Ə. (2016). Azərbaycan dili və nitq mədəniyyəti (dərslik). Bakı: "Ekoprint" nəşriyyatı.

[13] Xəlilov, B. (2021). Azərbaycan dilində işgüzar və akademik kommunikasiya. Bakı: "Adiloğlu" nəşriyyatı.
[14] Qəzetlərin dili monitorinq aynasında. (2022). Bakı: "Elm və təhsil" nəşriyyatı.
[15] Məhərrəm, M. (2019). Azərbaycan dialektologiyası (dərslik). Bakı: "Zərdabi LTD".
[16] Məmmədli, N. (2021). Azərbaycan dilində işgüzar və akademik kommunikasiya (dərslik). Bakı: "Elm və təhsil".
[17] Nəzəroğlu, C. (2022). Danışığınla həyatı qazan. III nəşr. Bakı: "Qanun" nəşriyyatı.
[18] Radioların dili monitorinq aynasında. (2022). Bakı: "Elm və təhsil".
[19] Saytların monitorinqi ilə bağlı hesabat. (2021). Bakı: "Elm və təhsil".
[20] Şirəliyev, M. (2008). Azərbaycan dialektologiyasının əsasları. Bakı: "Şərq-Qərb".
[21] Veysəlli, F. (2007). Dil. Bakı: "Təhsil NPM".

# AZƏRBAYCAN UŞAQ ŞEİRİNDƏ HEYDƏR ƏLİYEV OBRAZI: TARİXİ GERÇƏKLİYİN BƏDİİ İNİKASI

**AYGÜN BAĞIRLI**
Filologiya üzrə fəlsəfə doktoru, dosent, AMEA Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun elmi katibi. E-mail: aygunbagir77@gmail.com
https://orcid.org/0000-0001-9887-7713

**Məqaləyə istinad:**
Bağırlı A. (2023). Azərbaycan uşaq şeirində Heydər Əliyev obrazı: tarixi gerçəkliyin bədii inikası. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 97–102

**Məqalə tarixçəsi**
Göndərilib: 12.01.2023
Qəbul edilib: 24.02.2023

## ANNOTASİYA

Tarixi şəxsiyyətləri öyrənmək, tədqiq etmək təkcə tarix elminin deyil, həm də bədii ədəbiyyatın vəzifəsidir. Ədəbiyyat tarixin meydana çıxardığı şəxsiyyətlərin bədii obrazını yaratmaqla, eyni zamanda dünən, bu gün və sabah arasında ünsiyyət körpüsü qurur. Tarixin və onu yaradanların ədəbiyyat vasitəsi ilə təbliğ olunması, böyük şəxsiyyətlərin, filosof və sərkərdələrin, söz və düşüncə adamlarının bədii təqdimatı tarixi həqiqətlərin öyrənilməsində, yaşananlardan dərs çıxarılmasında əhəmiyyətli rol oynayır. Bu şəxsiyyətlərin bədii surəti nə qədər monumental yaradılarsa, onlar öz xalqının milli obrazını, sahib olduğu dəyərləri bir o qədər aydın əks etdirmiş olarlar. Bunu Heydər Əliyev obrazının Azərbaycan ədəbiyyatında yaradılan nümunəsində daha aydın dərk edə, tarixi həqiqətlərin bədii gerçəkliyə çevrilməsinin böyük fəlsəfi-estetik dəyərli məsələ olduğunu görə bilərik. Ümummilli liderin uşaq poeziyasındakı obrazına diqqət yetirsək, göz önündə xilaskar, varlığı ümid və nicat vəd edən, Azərbaycanın özünəqədərki milli dövlətçilik, idarəçilik təcrübəsini təkcə həmfikirlərinə deyil, həm də opponentlərinə qəbul etdirən bir şəxsiyyət, xalqının qəhrəmanı, müdrik şəxsiyyət canlanır. Məqalədə Heydər Əliyevin obrazına daha çox poeziyada rast gəlindiyi vurğulanır. Ulu Öndər haqqında uşaqlar üçün yazılan saysız-hesabsız şeirlərdən bəzi nümunələr verilir.

**Açar sözlər:** Azərbaycan ədəbiyyatı, Ulu Öndər Heydər Əliyev, uşaq şeiri, bədii obraz.

# THE IMAGE OF HEYDAR ALIYEV IN AZERBAIJANI CHILDREN'S POETRY: ARTISTIC VISION OF HISTORICAL REALITY

**AYGUN BAGIRLI**
PhD in Philology, Associate Professor, Scientific Secretary of the Institute of Literature named after Nizami Ganjavi. E-mail: aygunbagir77@gmail.com
https://orcid.org/0000-0001-9887-7713

**To cite this article:**
Bagirli A. (2023). The image of Heydar Aliyev in Azerbaijani children's poetry: artistic vision of historical reality. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 97–102

**ABSTRACT**

The study of historical figures and investigation of their activities is the duty of scientific history and at the same time a debt of fiction. Literature, by creating the images of figures grown up in history builds a bridge of communication between the past, present, and future. The fate of people, their spiritual past, and the various figures that emerged at different stages of time, not only need to be studied by history and historians but also require the light of fiction. Literature, besides clarifying the dark layers of the past, has also a responsibility to create artistic images of its historical figures. One such historical figure is Heydar Aliyev, the national leader of the Azerbaijani people. Taking a look at the image of Heydar Aliyev in children's literature we can see a savior whose presence is a promise of hope and prosperity and is also the hero of his people, a wise leader, and a father of the nation who does not only demonstrate and reaffirm Azerbaijan's own national statehood and governance practices to his compatibles, but also to his opponents. The image of Heydar Aliyev is often observed in poetry. Rafik Yusifoglu's "Statue of the Leader", "Great Leader", Zahid Khalil's "Heydar Bridge", "Bulag", "Hand", Nabi Khazri's "Miracle of Will", Bahlul Atakhanli's "Heydar Son of the World", Ilgar Daglaroglu's "Heydar Baba", Alamdar Guluzade's portrayal of "Heydar Father, Leader Father" and the hundreds of unnamed poems illuminate the portrait of the Great Leader in various ways. The paper includes a detailed analysis of the artistic samples dedicated to the national leader Heydar Aliyev.

**Keywords:** Azerbaijan literature, National Leader Heydar Aliyev, children's poems, artistic image.

**Article history**
Received: 12.01.2023
Accepted: 24.02.2023

Tarixin elmi araşdırmaya ehtiyacı olduğu qədər "bədii tədqiqata" da tələbatı vardır. Çünki xalqın taleyi, mənəvi keçmişi və tarixi şəxsiyyətlərinin bədii ədəbiyyatda tərənnümü tarixçilərin araşdırmalarından az əhəmiyyət kəsb etmir. Bədii fikrin tarixi keçmişdən bəhs etməsi böyük zərurətdən doğur. Ədəbiyyat keçmişin qaranlıq qatlarını aydınlatmaqla yanaşı, onun tarixi şəxsiyyətlərinin bədii obrazını yaratmağa da borcludur. Bu amil həm də ədəbiyyatın bu gün və sabahla bağlılığını şərtləndirir.

Nəzəri-estetik prinsiplərdə tarixi şəxsiyyətlərin həyatına müraciətin vacibliyi bir neçə amillə şərtləndirilir. Ən əsası isə odur ki, tarix və onu yaradanlar ədəbiyyat vasitəsi ilə təbliğ olunur, böyük şəxsiyyətlərin, filosof və sərkərdələrin, söz və düşüncə adamlarının bədii təqdimi tarixin öyrənilməsində, yaşananlardan ibrət alınmasında əhəmiyyətli rol oynayır. Bu şəxsiyyətlərin bədii surəti nə qədər monumental yaradılarsa, onlar öz xalqlarının milli obrazını, sahib olduğu dəyərləri o qədər aydın əks etdirmiş olarlar. Epoxaların, baş verən hadisələrin, təbəddülatların dərki prosesində bədii tarixin rolu elmi tarixin əhəmiyyətindən heç də az deyil və buna görə də tarixi həqiqətlərin bədii gerçəkliyə çevrilməsi böyük fəlsəfi-estetik dəyəri olan məsələ hesab edilir.

Heydər Əliyevin uşaq poeziyasındakı obrazına diqqət yetirsək, o, xilaskar, varlığı ümid və nicat vəd edən, Azərbaycanın özünəqədərki milli dövlətçilik, idarəçilik təcrübəsini təkcə həmfikirlərinə deyil, həm də opponentlərinə qəbul etdirən bir şəxsiyyət, xalqının qəhrəmanı, müdrik lider, ulu öndər kimi görünür. Heydər Əliyevin obrazına daha çox poeziyada rast gəlirik. Ulu Öndər haqqında uşaqlar üçün saysız-hesabsız şeirlər yazılıb. Nəbi Xəzrinin "İradə möcüzəsi", Valeh Mirzənin "Ruhu canımızdadır", Şövkət Məmmədbəylinin "Yaşayacaqdır", Uğurlu Xəlilovun "Biri günəş, biri Heydər", Xıdır Alovlunun "Vətənləşən vətəndaş", Aygün Balın "Heydərin davamçısı gərək ki, Heydər olsun", Bəhlul Ataxanlının "Dünyanın Heydər oğlu", İlqar Dağlaroğlunun "Heydər baba", Aynur Hüseynovanın "Körpələr babası sən, Heydər baba", Səmid Mövsümovun "Qayəsi nur, özü də nur", Samir Səyyadoğlunun "Haqqımızdır öyünmək", Əkbər Qoşalının "Ümidsiz ha deyilik", Ələmdar Quluzadənin "Heydər baba, öndər baba", Rafiq Yusifoğlunun "Rəhbərin heykəli", "Ulu öndər", Nəriman Hüseynin "Nur övladı", Fərid Ağamirzəyevin "Heydər baba", Oqtay Zəngilanlının "Ulu Heydər", "Millət atası", "Bir millət, iki dövlət" və başqa bu mövzuda yazılmış şeirlərdə Ulu Öndərin bədii portretinə müxtəlif rakurslardan işıq salınır.

Bu şeirlərdə maraqlı dilemmalara diqqət yetirilməsi olduqca vacibdir. Həmin bədii nümunələrdə Heydər Əliyevdən həm tarixin və zamanın yetirdiyi şəxsiyyət, həm də tarixin özünü yaradan, onu idarə edən, yönləndirən ümummilli lider kimi bəhs olunur: elə söykənən, elin söykəndiyi, yol açan, özü yol olan, xalqdan güc alan, xalqın güc aldığı, genetik yaddaşın, tarixi təcrübənin yetirdiyi və özü nümunəyə, məktəbə çevrilən, vətənin həm əsgəri, həm generalı... Bu dilemmaları bəzən eyni şeirdə, bəzən də ayrı-ayrı, tam fərqli nümunələrdə görmək mümkündür:

*Çağdaş Azərbaycan ölməz əsəri,*
*Vətənə məhəbbət tək amalıydı.*
*Heydər öz yurdunun sadiq əsgəri,*
*Türkün ən qüdrətli generalıydı.*
(Vahid Əziz)

*Qəlbini bürüyüb Azərbaycana,*
*Qəlbinə bürüyüb Azərbaycanı.*
(Məstan Günər)

*Sən tarixi yaza-yaza*
*Özün də tarix oldun.*
(Rafael Hüseynov)

*Sən haqqa arxalandın,*
*Haqq sənə arxa durdu.*
(Dursun Musayeva)

Zahid Xəlilin Ulu Öndərə həsr etdiyi silsilə şeirlərində – ("Oxu, Surxay", "Bulaq", "O gecə", "Əl", "Heydər körpüsü", "Azərbaycan xiyabanı", "Uçaq", "Dağlar") Vətənin bütün övladlarını öz balası kimi sevən, onlara qayğı və diqqət

göstərən, uğurlarından fərəhlənən, qürur duyan bir el babası kimi söz açılır. Müəllif el atasının adı verilən park və xiyabanlardan, bulaqlardan danışır, onların əsrarəngizliyinin və gözəlliyinin sirrini adları ilə əlaqələndirir. Şair üçün Babadağdan da uca, buludlardan yuxarı bir zirvə olan milli öndərin saldığı yol – Heydər yolu kiçik oxuculara örnək göstərilir. “O gecə” şeirində 90-cı illərin əvvəllərində millətin taleyüklü məsələsinin həllində el dəstəyinə ehtiyac duyulanda bir çağırışı ilə xalqı meydana toplayan liderin sözünün, səsinin qüdrətindən, müdrik addımlarından bəhs olunur. “Əl” şeirində əllərini bayrağa, məşələ döndərib el üçün yol göstərən, bir hərəkəti ilə dünyanı ayağa qaldıra bilən, “Yumulsa zindan, açılsa yaraşıqlı olan”, əzəmətli, mayaka bənzər bir əldən bəhs olunur.

“Heydər körpüsü” şeirində Kür çayının göy sinəsində salınan bir körpünün adını haqlı olaraq onun adından aldığı qeyd olunur. Balacaların dilindən deyilir ki, axı Heydər baba da körpülər qurur. Gecələr yatmayıb işləməklə gündüzlə gecənin, Azərbaycanla uzaq-uzaq ellərin arasında körpü salındığını deyən kiçik oxucu böyük inamla nə vaxtsa Aya, ulduza uzanan körpülərin də qurulacağına ümid bəsləyir.

Başqa bir şeirdə şair Heydər baba ilə Azərbaycanı eyniləşdirir:

*Əl edirlər uşaqlar,*
*Heydər baba, can baba,*
*Ey Azərbaycan baba,*
*Nə yorul, usan, baba!*

Gülzar İbrahimova, əsasən, nağıllar yazsa da, redaktoru olduğu “Sehrli xalat” jurnalında onun “Heydər babamız oldu”, “Ulu Öndər”, “Heydər babanın nəsihətləri” (İbrahimova, 2015) adlı şeirlərinə də rast gəlinir. Bu şeirlərdə müəllif kiçiklərin hər ilin gözəl yazında yığışıb el atasına al-əlvan çiçəklərdən çələng toxuduqlarını, şən nəğmələr oxumaqla onu yad etdiklərini, müdrik babalarının nəsihətlərinə daim əməl etməyə çalışdıqlarını diqqətə çatdırır.

Heydər Əliyevə istedadlı, tanınmış şairlərlə yanaşı uşaqlar da səmimi, hiss və duyğularını ifadə edən şeirlər həsr edib. Bu şeirlərin poetik qəhrəmanı uşaq dünyasından görünən Heydər Əliyevdir. Ulu Öndərin nəvəsi Leyla Əliyevanın “Mənim babam” şeiri bunların hamısından fərqlidir, çünki digər şeirlərdə müəlliflər öz qəhrəmanlarını böyüklərin söhbətlərindən, onun haqqında danışılanlardan, gördüyü işlərdən, televiziyadan, tədbirlərdən tanıyıblarsa, bu şeirdəki təəssürat qəhrəmanı ilə daimi ünsiyyətdən, baba-nəvə münasibətindən, sıx müşahidələrdən yaranıb:

*Mənim babam gözəl insan,*
*Sevimlidir, mehribandır.*
*Yüz il, min il yaşayasan -*
*Desəm ona, yenə azdır.*
*İnsan var ki, qəlbi qara,*
*Bəd əməli, bəd niyyəti.*

*Onlar hara, babam hara...*
*Bir insandır ədalətli,*
*Öz xalqına sədaqətli,*
*Mənim babam.*
*Kömək edər, əl uzadar,*
*Dara düşsə bircə adam.*
*Bax, belə bir ömür yaşar.*
*Mənim məğrur,*
*Mənim əziz Heydər babam!*
(Əliyeva, 2008)

Qeyd etmək lazımdır ki, həqiqəti əks etdirən bu sadə və səmimi sözlər bir evin yox, bütöv elin babasına ünvanlanıb və bu kəlmələri ona doğma nəvəsinin timsalında minlərlə mənəvi övladı deyir.

Heydər Əliyevə yazılan yüzlərlə şeirin əksəriyyətində ona “Heydər baba”, bəzən “el atası” xitabı ünvanlanıb. Amma xalq şairi Mirvarid Dilbazinin Ulu Öndərə həsr etdiyi şeirləri və “oğul” xitabı bir ananın səsi, xeyir-duası kimi duyulur:

*Cavidi vətənə gətirən oğul,*
*Onu öz xalqına yetirən oğul,*
*Xalqının misilsiz qayğılarını,*
*Öz çiyni üstünə götürən oğul,*
*Var olsun bu oğul qeyrətin sənin!*

*Tarix nə üz görür, nə rüşvət alır...*
*Tarixdə tarixi həqiqət qalır.*
*Adın həqiqətlə birgə ucalır,*
*Xalqına xidmətdir – şöhrətin sənin...*
(Dilbazi, 2004)

“Aqil mötəbər”, “ağlı ümman”, “ər oğlu ər” kimi tərif etdiyi böyük liderin bacara bildiyi, öhdəsindən gəldiyi çətin işləri, xalq üçün etdiklərini, tökülən qanların qarşısını kəsməsini, Azərbaycanı yadların cızdığı xəritəyə uyğun bölünməkdən qurtarmasını, Cavidi uzaq Sibirdən vətənə gətirməsini, S.Vurğunun, C.Cabbarlının ev muzeylərinin açılmasını, Vaqif üçün tikilən məqbərəni bir-bir xatırladan Mirvarid Dilbazi silsilə şeirlərini bu dəyərli ana sözü ilə bitirir:

*Canında canımız, qanında qanımız olan oğul!*
*Dünya qarşısına çıxan mərdim,*
*Sənə bir çələng hörərdim.*
*El məhəbbətindən olardı çiçəkləri*
*Zaman soldurmayır,*
*El qoyduğu çələngləri...*
(Dilbazi, 2004)

Şeirin arxitektonikası sanki Burla xatunun əsrlərdən süzülüb gələn səsini xatırladır.

Rafael Hüseynovun Ulu Öndərə həsr etdiyi şeirləri içərisində “Sədaqət dərsi”, “Sən tarixi yaradan”, “Arzun” (Hüseynov, 2009) şeirləri Heydər Əliyevin bədii portretini əks etdirmək baxımından uşaqlar üçün də uğurlu nümunələrdir. Həmin poetik mətnlərdə ümummilli liderdən bir məktəb, bir örnək kimi bəhs olunur. Vəfa, ləyaqət, sədaqət dərsi verən bu məktəb həm də çətinliklər qarşısında mətanətli, dəyanətli olmağı, arzulara çatmaq uğrunda əzmkarlığı öyrədir. Həmin bədii nümunələrdə poetik qəhrəmandan dönə-dönə oxunmalı kitab kimi danışılır. Bu kitabda “bir qəhrəmanın yenilməzlik hekayəti”, “sadədən sadə insanın dahi olmaq şücaəti” yazılıb. Müəllif sonda bu məktəbdə ən ali dərsin– məhəbbət dərsinin olduğunu xüsusi vurğulayır. Fikrimizcə, bu məhəbbət vətənə, çevrəsinə, xalqına, onu sevənlərə, ona ümid edənlərə bəslənən məhəbbətdir.

Rafael Hüseynovun şeirlərində Ulu Öndər “millətin bələdçisi”, “nurlu mayak”, “tarixi yönəldən”, “uzağı görən memar”, “qalib gəlib, qalib gedən”, “xalqın könül dəftərində adı başda dayanan” kimi bədii təyin və ifadələrlə vəsf olunur.

Dursun Musayevanın “Hələ çiynimizdədir uğurlu əlin sənin” şeiri də uğurlu poetik nümunələrdəndir. Müəllif qəhrəmanının həyatını dastanlara sığmayan hünər salnaməsi, tarix dərsi hesab edir. Onun fikrincə, bu ululuğun səbəbi Heydər Əliyevin haqqa və xalqa arxalanmasında idi.

*Haqqını yaşatdığın*
*Millət yaşadır səni.*
*Pillə-pillə ucaldıb, kərpic-kərpic qurduğun,*
*Bu ölkə, bu məmləkət, məmləkət boyda sevgi,*
*Dünya dolusu şöhrət, hörmət yaşadır səni.*
*Sənsiz keçən günlərin, hər ayında, günündə,*
*Hər kəsin həyatında, hər nəfərin ömründə,*
*Görünür yerin sənin.*
*Hələ çiynimizdədir*
*Uğurlu əlin sənin.*
(Musayeva, 2008)

Əkbər Qoşalı ümummilli liderin anım günləri ərəfəsində yazdığı şeiri (Qoşalı, 2013) qəmli notlarla başlasa da, sonda – “İzin ilə yürüyürük, Ümidsiz ha deyilik” – deyə təsəlli yeri tapır.

Ələmdar Quluzadənin şeirində (Quluzadə, 2010) isə qəhrəman bu dünyanın yaddaşına Azərbaycan yaza bildiyi, vətən torpağında “Heydər baba” boyda dağ, tarix qarşısında başı uca, üzü ağ olduğu üçün öyülür.

Heydər Əliyevin uşaq ədəbiyyatında yaradılan obrazı güclü və suveren dövlət qurmağı bacaran, Azərbaycanın əbədiliyini təmin edən, vətənə tuşlanan zərbələrə sinə gərən, soydaşlarının qayğısını şəxsi problemi hesab edən “Heydər baba” kimi görünür. Bundan sonra da enerjisini tarixdən alan və gələcəyə ötürən ümummilli liderin həyat salnaməsini əks etdirən yüksək ideyaya malik, mənəvi-estetik dəyəri çox güclü olan, uşaqların yaş və qavrama səviyyəsinə uyğun bədii əsərlər yazılacaqdır. Həmin əsərlər, şübhəsiz, təhsilalanların bədii ədəbiyyatda, mütaliəyə marağını artıracaq, məntiqi təfəkkürünü

zənginləşdirəcək, vətənpərvərlik tərbiyəsinin aşılanmasında mühüm rol oynayacaq, onların azərbaycançılıq ruhunda böyüməsi üçün motivasiya yaradacaq, onları milli-mənəvi dəyərlərə sadiq vətəndaş kimi formalaşmağa sövq edəcəkdir.

**İstifadə edilmiş ədəbiyyat**


[1] Dilbazi, M. (2004). Seçilmiş Əsərləri. Bakı, Lider nəşriyyatı.
[2] Əliyeva, L. (2008). Mənim babam. Günəşə qovuşmaq istəyirəm mən! Bakı, Çinar-Çap nəşriyyatı.
[3] Hüseynov, R. (2009). Sədaqət dərsi. Xalq qəzeti. 8 may 2009.
[4] İbrahimova, G. (2015). Şeirlər. Sehirli dünya, № 39, səh.14-15.
[5] Qoşalı, Ə. (2013). Ümidsiz ha deyilik. Yeni Azərbaycan, 9 may.
[6] Quluzadə, Ə. (2010). Heydər baba, öndər baba. Savalan, 7-13 may.
[7] Musayeva, D. (2008). Hələ çiynimizdədir uğurlu əlin sənin. Mədəniyyət, 6 dekabr.

# *TUYUĞ:* JANRIN TƏŞƏKKÜLÜ, TƏKAMÜLÜ VƏ KLASSİK POEZİYADA MÖVQEYİ

**YAQUB BABAYEV**
Filologiya elmləri doktoru, professor, ADPU.
E-mail: ymbabayev@hotmail.com
https://orcid.org/0000-0002-4738-9426

**Məqaləyə istinad:**
Babayev Y. (2023). Tuyuğ: janrın təşəkkülü, təkamülü və klassik poeziyada mövqeyi. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 103–112

**ANNOTASİYA**

Məqalədə tuyuğ janrının təşəkkülündən, inkişafından və klassik türkdilli poeziyadakı mövqeyindən söhbət açılır. Göstərilir ki, əruz vəznində olsa da, tuyuğ türkdilli poeziyanın janrıdır. O, təxminən XII-XIII əsrlərdə təşəkkül taparaq formalaşıb. Biz artıq XIV əsrdə türkdilli poeziyada onun yetkin nümunələrinin yarandığını görürük. Qazi Bürhanəddinin tuyuğları bunu aydın şəkildə sübut edir. Sonrakı əsrlərdə də həm Azərbaycan, həm də Orta Asiya türklərində tuyuğun mükəmməl nümunələrinin yarandığını görürük. Tuyuğ əruz vəznindədir. Türk dilləri isə daha çox heca vəznli şeirin ölçülərinə uyğun gəlir. Məqalədə əruz vəznində yaranan tuyuğun türk şeiri ilə üzləşmədə yaratdığı çətinliklərə də toxunulur. Həmçinin onun musiqi ilə əlaqəsindən danışılır. Məqalədə janrın forma xüsusiyyətləri, qafiyə sistemi, rübai janrı ilə oxşar və fərqli cəhətləri də izah edilir. Çağatay türkcəsində janrın gözəl nümunələrinin yarandığı nəzərə çatdırılır. "Tuyuğ" sözünün mənası aydınlaşdırılır.

**Açar sözlər:** Tuyuğ janrının təşəkkülü, klassik türkdilli poeziya, Azərbaycan və Orta Asiya ədəbiyyatı, Qazi Bürhanəddinin yaradıcılığı, heca və qafiyə sistemi.

**Məqalə tarixçəsi**
Göndərilib: 19.08.2022
Qəbul edilib: 11.01.2023

# *TUYUG:* THE FORMATION OF THE GENRE, ITS EVOLUTION AND POSITION IN CLASSICAL POETRY

**YAGUB BABAYEV**
Doctor of philological sciences, professor of ASPU.
E-mail: ymbabayev@hotmail.com
https://orcid.org/0000-0002-4738-9426

**To cite this article:**
Babayev Y. (2023). Tuyug: The formation of the genre, its evolution and position in classical poetry. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 103–112

**ABSTRACT**

The article discusses the formation, the development and the position of the tuyug genre in classical Turkic-speaking poetry. It differs that, despite the fact that tuyug is in aruz rhythm, it is also genre of Turkic poetry. It was formed about the 12th–13th centuries. We already find its perfect examples in Turkic speaking poetry in the 14th century. Gazi Burhaneddin's tuyugs clearly prove the fact. In following centuries, both in Turks of the Azerbaijani and Central Asian turks quite perfect samples of tuyug were created. As it is mentioned above, Tuyug is in the Aruz rhythm. Whereas poetry in the Turkic language is mostly created in the syllabic verse. Therefore, the article touches upon the difficulties that arise while composing the tuyug created in aruz rthytm and the Turkish poem. Including the article deals with the connection of tuyug verse with music. In addition, the article explains the form features of this genre, its rhyme system, common and distinctive features of the tuyug with the rubai genre. It is also noted that in Chagatai Turkic the good samples of tuyug genre have been created. The meaning of the word "tuyug" is explained in the article.

**Key words:** The formation of tuyug genre, classical Turkic-speaking poetry, Azerbaijani and Central Asian literature, Gazi Burhaneddin's creativity, syllable and rhyme system.

**Article history**
Received: 19.08.2022
Accepted: 11.01.2023

## GİRİŞ

Orta əsrlər şərq poeziyası mövzu, məzmun, ideya, obrazlar aləmi, sənətkarlıq və s. baxımından zəngin olduğu kimi janr etibarı ilə də əlvandır. Bu dövrdə bədii ədəbiyyat meydanında işlənən poetik janrlardan biri də tuyuğdur. Yazılı ədəbiyyatda başqa çoxsaylı janrlardan fərqli olaraq tuyuğ yalnız türkdilli poeziyaya mənsubdur. Başqa sözlə desək, o, türk poetik xəzinəsi üçün milli janr statusundadır. Ərəbdilli və farsdilli orta əsrlər şərq poeziyasında bu janra təsadüf edilmir.

## TUYUĞ JANRININ TƏŞƏKKÜLÜ VƏ İNKİŞAF XÜSUSİYYƏTLƏRİ

Türkdilli bədii təfəkkür sərvətləri içərisində tuyuğun ilk çoxsaylı nümunələrinə XIV əsr Azərbaycan şairi Qazi Bürhanəddinin yaradıcılığında rast gəlirik. Bu janr barəsində ilk nəzəri fikir söyləyən qələm sahibi isə türkdilli poeziyanın qüdrətli nümayəndələrindən Əlişir Nəvaidir. XV əsrdə yaşamış özbək şairi özünün "Mizanül-Övzan" ("Vəznlərin tərəzisi") adlı ədəbi-nəzəri risaləsində yazır: "Yenə Türk ulusu, xüsusilə, çağatay xalqı arasında yayılmış vəznlərdir ki, onlar mahnılarını o vəzn ilə yazıb məclislərdə söyləyirlər. Biri iki beytdən ibarət tuyuğdur. Səy edilir, təcnis ilə deyilsin. Onun vəzni rəməli-müsəddəsi-məqsurdur". Bu şəkildədir:

*Ya Rəb, ol şəhdü şəkər, ya ləbmüdür,*
*Ya məgər şəhdü şəkər yaləbmüdür,*
fA'ilAtün fA'ilAtün fA'ilAn
*Canimə peyvəstə navək atqali,*
*Ğəmzə oqin qaşiğə yaləbmüdür.*
fA'ilAtün fA'ilAtün fA'ilAn (Nəvai, 2006).

Şeirin müasir Azərbaycan dilinə çevirməsi belədir: "Ya rəb, o bal şəkər və ya dodaqmıdır, yoxsa bal və şəkər yalamışmıdır?, Canıma dalbadal ox atmaq üçün qəmzə oxunu qaşına yay etmişdir" (Nəvai, 2006).

Özbək şairinin verdiyi bu yığcam, lakin son dərəcə dəyərli ədəbi-nəzəri məlumatda diqqəti cəlb edən bir neçə cəhət vardır: *Birincisi,* tuyuğ bir poetik janr kimi türk qövmləri, xüsusilə də, çağatay türkləri arasında yayılıb; *İkincisi,* bu bədii formada olan şeirlər mahnı şəklində məclislərdə söylənilir, yəni müəyyən havacatla məclislərdə oxunmaqdan ötrü yazılır; *Üçüncüsü,* həcmi iki beytdən ibarət olur; *Dördüncüsü,* şeirin cinaslı qafiyələrlə yazılmasına səy göstərilir, ancaq bu əlamət mütləq xarakter daşımır. Nəvainin verdiyi nümunədə də hər üç misradakı həmqafiyə sözlər cinaslıdır; *Beşincisi,* tuyuğ əruz vəzninin rəməli-müsəddəsi-məqsur ölçüsündə yazılır.

Beləliklə, Ə.Nəvai janrın həm işlənmə məkanını, həm də əsas əlamətlərini konkret şəkildə izah edir. O, eyni zamanda türkdilli poeziyada tuyuğdan başqa işlənən ***qoşuq, cəngi, arazvari, məhəbbətnamə, müstəzad*** kimi milli şeir şəkilləri barədə də qiymətli məlumat verir.

Ə.Nəvai "Mühakimətül-lüğəteyn" əsərində də qısaca şəkildə tuyuğdan danışır. Onun "əcəmdə" (farsdilli poeziyada) olmadığını söyləyir. Bir nümunə olaraq 1, 2 və 3-cü misraları cinas qafiyələrdən ibarət bir tuyuğ verir (Nevai, 1941).

Şeyx Əhməd Tərozidə 1436-1437-ci illərdə qələmə aldığı "Fünun əl-bəlağə" ("Bəlağət elmləri") əsərində tuyuğun bir poetik forma kimi "türk şairlərinin ixtirası" olduğunu nəzərə çatdırır.

Daha sonrakı dövrdə, yəni XVI yüzilliyin ilk rübündə haqqında söhbət açdığımız poetik forma barədə bilgi verən müəllif Zəhirəddin Məhəmməd Babur şah (1483-1530) olub. Böyük moğol hökmdarı, alim və şair olan Babur əruz vəzninə həsr etdiyi "Müxtəsər" adlı poetika risaləsini 1522-ci ildə tamamlayıb.Türkdilli ədəbi-nəzəri fikirdə əruz vəzninə dair səviyyəli və diqqətəlayiq poetika kitablarından olan bu əsərdə Babur tuyuğdan danışarkan onun türkdilli şeirin janrı olduğunu qeyd edir və göstərir ki,: "...Moğol xanları və türk səlaitinin məcalisində tuyuğun kop iştiharı (çox şöhrəti – *Y.B.*) var..." (Babur, 1971). Tuyuğun vəzni və həcmi barədə yığcam bilgi verən müəllif qafiyə tipinə görə onun 7 forması olduğunu söyləyir: *1.**aaba*** şəklində qafiyələnib hər üç misradakı həmqafiyə sözlər cinas olur; *2.**abcb*** şəklində qafiyələnib

iki həmqafiyə misradakı qafiyələr cinas olur; *3.**aaba*** şəklində qafiyələnib əvvəlki iki həmqafiyə misradakı həmqafiyə sözlər cinas olur; *4.**abcb*** şəklində qafiyələnir və həmqafiyə olan misralar cinassız olur. *5.**aaaa*** şəklində qafiyələnir və hər dörd misradakı həmqafiyə sözlər cinas yaradır. *6.**aaba*** şəklində qafiyələnib tam cinaslı və rədifli olur; *7.**aaba*** şəklində qafiyələnir, hər üç həmqafiyə misra cinaslı olub haciblə işlənir.

Z.M.Baburun risaləsində göstərilən bəndlərdən 5, 6 və 7-cisinə aid misallar müəllifin öz qələminə məxsusdur (Babur, 1971; Stebleva, 1970).

XVI-XIX yüzilliklərə aid məxəz və mənbələrdə tuyuğla bağlı elə bir məlumatla rastlaşmırıq. Daha doğrusu, janra münasibətdə bir sükut dövrü hökm sürür. XIX əsrin lap sonları və XX əsrin ilk illərindən janra münasibət yenidən fəallaşır. Sanki belə bir şeir şəklinin varlığı yenidən yada düşür. XX əsr boyunca E.Gibb, A.N.Samoyloviç, M.F.Köprülüzadə, N.S. Banarlı, İ.V.Stebleva, B.Vəlixocayev, X.Q.Koroqlı, A.Bağırov, T.Kərimov, B.Həsənli və s. kimi ingilis, rus, türk, özbək və Azərbaycan filoloqları tuyuğla əlaqəli mətbu elmi araşdırmalar aparırlar (Gibb, 1900; Samoylovich, 1917; Samoylovich, 1917; Samoylovich, 1927; Köprülüzadə, 1934; Köprülü, 1966; Banarlı, 1998; Stebleva, 1970; Vəlixocayev, 1973; Korogly, 1980; Bağırov, 1980; Bagirov, 1983; Kərimov, 1989; Həsənli, 2000).

Adlarını zikr etdiyimiz alimlərin haqqında danışdığımız janrla bağlı dəyərli məqalələri mövcuddur. Bundan əlavə ədəbiyyat nəzəriyyəsinə aid kitablarda, tuyuğ yazan sənətkarların yaradıcılığına aid tədqiqatlarda da bu poeziya şəkli haqqında bu və ya digər həcmdə (əslində bir və ya bir neçə abzas həcmində ) məlumatlara, elmi-nəzəri izahatlara rast gələ bilərik. Ancaq aparılan araşdırmalar nə qədər geniş olsa da, məqalə həcmini aşmır. Yalnız A.Bağırov bu sahədə dissertasiya səviyyəsində elmi araşdırma aparıb. Ümumiyyətlə, tuyuğ barədə geniş, əhatəli və monoqrafik məlumatlara ciddi ehtiyac vardır.

Tuyuğ barədə türk alimi M.F.Köprülünün araşdırmaları və fikirləri daha əhatəli, maraqlı və dəyərlidir. Alimin rəyinə görə tuyuğ bir şeir şəkli kimi öz mənşəyini türk folklorundakı cinaslı xalq ***manilərindən*** və ***qoşuqlardan*** götürüb. Formalaşma prosesində fars poeziyasına məxsus fəhləviyatların (rübai tipində şeirlər) da ona müəyyən təsiri olub. Bu tipli dördlüklər əruzla yazılıb və onlara musiqi bəstələnib, həmin şeir-mahnılar məclislərdə müəyyən havacatla oxunub. M.F.Köprülüzadə öz mülahizələrində başqa faktlarla yanaşı, həm də XIV-XV əsrlərdə ömür sürmüş böyük musiqiçi, musiqişünas və şair Əbdülqadir Marağayinin musiqi nəzəriyyəsi ilə bağlı risalələrindəki fikirlərinə istinad edir. Belə ki, Ə.Marağayi musiqi nəzəriyyəsinə dair son dərəcə dəyərli və səviyyəli risalələrində göstərir ki, İraqda yaşayan türklər rəməli-müsəddəsi-məqsur ölçüsündə olan bir sıra dördlükləri "mötədil" adlanan musiqi havacatına uyğunlaşdırıb ifa edirlər. Bu dördlükləri türklər "qoşuq" adlandırırlar. Ancaq maraqlıdır ki, Ə. Marağayinin "qoşuq" deyə həmin musiqi havasına aid təqdim etdiyi bədii nümunələr əslində qoşuq yox, cinassız tuyuğlardır.

Ə.Nəvai və Z.M.Baburun əruz haqqında risaləsindən bəlli olur ki, qoşuq əruzun rəməli-müsəmməri-məxfuz ( _ ._ _/_._ _ /_._ _/_._ ), tuyuğ isə rəməli-müsəddəsi-məqsur ( _ ._ _/_. _ _ /_._ ) qəlibinə uyğun gəlir. Fərq burasındadır ki, qoşuqda rəməlin bir təfiləsi ( _._ _ ) tuyuğa nisbətən artıqdır. Bununla belə hər iki şeir şəkli demək olar ki, uyğun melodiyalarda ifa edilib (Stebleva, 1970).

M.F.Köprülü rübailərin də tuyuğun bir poetik şəkil kimi formalaşmasına təsirini qəbul edir. Onu da əlavə edək ki, türk aliminin söylədiyi fikirlərin, gəldiyi qənaətlərin bəzilərinə biz ondan daha əvvəl A.N.Samoyloviçin araşdırmalarında da rast gəlirik (Samoylovich, 1917; Samoylovich, 1927).

Ümumiyyətlə, tuyuğun türkdilli poeziyanın bir janrı kimi mənşəyi, təşəkkülü və təkamülü ilə bağlı aşağıdakı qənaətə gəlmək mümkündür. Bu qənaəti söyləmək və əsaslandırmaqdan ötrü iki mühüm qaynağa, faktiki və nəzəri mənbəyə istinad etmək olar: 1. Janrın özünün nəşət, təkamül və formalaşma yolunu, prosesini ədəbi-tarixi baxımdan izləmək; 2. Aparılan araşdırmaları, deyilən elmi-nəzəri qənaətləri ümumiləşdirmək.

Məlum həqiqətdir ki, tarixin lap dərin çağlarından türkdilli poeziyada dördlüklər bir poetik forma kimi həmişə aparıcı mövqedə olub. Əlbəttə, bu formada şifahi və yazılı ədəbiyyatda yaradılan bədii nümunələrin heca və qafiyə sistemi çeşidli səciyyə daşıyıb. Türkdilli poeziyada ta qədimlərdən dilin təbiəti, xarakteri ilə əlaqəli heca vəznli şeirin hakim mövqedə olduğu da bəllidir. Biz bu fikri söyləyərkən orta əsrlərdəki yazılı ədəbiyyatımızı deyil, folklor janrlarını nəzərdə tuturuq. XI əsrə qədər türkdilli şifahi ədəbi arenada, yəni xalq şeirində heca vəzni aparıcı mövqedə idi. Amma tədricən əruz vəzni milli dildə yaranan poetik meydana qədəm qoyur, milli bədii təfəkkür sahiblərini məşğul etməyə başlayırdı. XI-XII əsrlərdə yazılı ədəbiyyatda türk dillərində ərsəyə gələn poeziya örnəkləri bunu aydın şəkildə sübut edir. Arxaik türk şeirinin işlək şəkillərindən olan ***qoşuq*** və ***mani*** də dördlük formasında yazılıb. Türk xalqlarının möhtəşəm ortaq abidəsi sayılan“Divani-lüğat-it türk”də də milli şeir şəkli kimi qoşuqdan söhbət açılır. Mahmud Kaşğari bu istilah barədə belə bir məlumat verir: Koşuğ – şeir, qəsidə. Bu beytdə də işlənib.

*Tərkən katun kutınqa*
*Təğür məndin koşuğ,*
*Ayğıl: sizinq tapuğçı*
*Ötnür yenqi tapuğ.*
*(Ülyahəzrət tərkən xatuna*
*Çatdır məndən şeir,*
*De ki, sizin xidmətçi*
*Yeni əmrə müntəzir)* (Kaşğari, 2006).

Göründüyü kimi, filoloq alim qoşuğa nümunə də verir. “Divani-lüğat-it türk”ün XI əsrdə meydana gəldiyini nəzərə alsaq, deyə bilərik ki, o dövrdə qoşuq işlək poetik janrlardan biri olub. Onu da əlavə edək ki, istər ***“qoşuq”,*** istərsə də son əsrlərdə aşıq poeziyasında ən populyar şeir şəkillərindən olan ***“qoşma” “qoş+maq”*** feilindəndir. Yəni bir misra digərinə qoşulub beyti, bəndi və bütöv şeiri əmələ gətirir.

Doğrudur, “Divani-lüğat-it türk”də mani barədə bilgi yoxdur. Lakin Yusif Xas Hacib Balasaqunlunun (1017-1077) Orta Asiya türkcəsində qələmə aldığı məşhur “Qutadqu-bilik” poemasında 173-ə qədər dördlük vardır və bunların əksəriyyəti mani tipli nəzm örnəkləridir. Bu dördlüklərdən danışarkan N.S.Banarlı haqlı olaraq yazır: “Ancak Yusif Has Hacibin eserine bir milli zevk hatirası halinde ilave ettdigi ***dördlük-manilərdir*** ki, Kutadqu Biligi bir taraftan islamiyyetten önceki Türk şiir ananesine bağlamaktadır. Metin arasında yeri geldikce ve söz düşürülerek söylenen bu maniler 173 tanedir. Bunların türk halk manilerinden farkı, daha çok, vezin bakımındandır” (Banarlı, 1998). “Qutadqu bilik”dəki mani tipli dördlüklərin əksəriyyəti 11 hecalı misralardan ibarətdir. Ancaq burada əruzun elementləri də yox deyil. Bəzilərində cinassız, bəzilərində isə cinaslı qafiyələr işlədilib. Deməli, XI yüzillikdə manilər də türk şeirinin çevik janrlarından biri idi. Həm də bu janr folklorda mühüm mövqe tutmaqla yazılı ədəbiyyata da öz təsirini göstərirdi.

XI əsrdə tuyuğ hələ bir şeir şəkli kimi formalaşmamışdı. Əgər formalaşsaydı, yəni, mövcud olsaydı, bu, türk dillərinin lüğət tərkibinə son dərəcə həssas, ayıq və diqqətlə yanaşan M.Kaşğarinin diqqətindən yayınmazdı. Belə ki, alimin ensiklopedik dilçilik lüğətində tuyuğ barədə bir şeir şəkli (istilahı) kimi heç bir bilgi verilmir. Doğrudur, burada “tuyuk” sözü var. Ancaq bu söz “hisli – paslı, qapalı, canı sıxılmış” mənalarında işlədilir (Kaşğari, 2006).

***Manilər*** forma-şəkil, həcm və qafiyə sistemi etibarı ilə tuyuğla ciddi oxşarlıq təşkil edir. Məsələn, Y. Balasaqunlunun aşağıdakı mani tipli dördlüyünə nəzər salaq:

*Bu dünya işi kör oyun, ol oyun,*
*Oyunka katılma, nerek bu oyun.*
*İdin yarlığı kıl özin kullukı,*
*Kalı kılmasa, sən anuk tut boyun*
(Banarlı, 1998)
*(Bu dünya işi oyundur, oyun*
*Oyuna qatılma, nəyinə gərəkdir bu oyun.*
*Tanrının yarlığına uy, öz kulluğunu bil,*
*Əgər belə etməsən, boynunun getməsinə hazır ol.)*

On bir hecalı bu manidə qafiyələnmə sistemi aaba (tuyuğlardakı mütəhərrik qafiyələnmə sistemlərindən 1-cisi) şəklindədir. 1-ci və 2-ci

misralardakı "oyun" sözləri cinas qafiyələrdir. Həmin söz burada "oyun oynamaq, rəqs etmək, hiylə ilə iş görmək" və s. mənalarda işlənib.

Yuxarıda dediyimiz kimi XI yüzillikdə tuyuğ hələ poeziya məkanına qədəm basmayıb, mövcud deyildir. Müşahidələr və faktlar göstərir ki, onun müstəqil bir janr kimi ***təşəkkül, təkamül və formalaşma dövrü XII-XIV əsrlərin payına düşür.*** Janrın ilkin nəşət qaynağı, poetik forma kimi qida mənbəyi türk folklorundakı milli şeir şəkilləri – ***dördlüklər,*** xüsusilə də, ***qoşuq*** və ***manilər*** olub. Ancaq bu şeir şəkilləri heca vəznində idi. Türklər tarixən farslarla və ərəblərlə qonşuluqda yaşayıb, müəyyən ədəbi-mədəni ünsiyyət və əlaqədə olub. İslam dini yayıldıqdan sonra bu əlaqə daha da sıxlaşdı, qarşılıqlı təsir daha da gücləndi. Bir sıra ədəbi hadisə, proses və əlamətlərin sintezi baş verdi: Heca vəznli türkdilli şeir şəkilləri əruz vəznli ərəb və fars poeziyasının forma, janr və qəlibləri ilə üzləşdi. İstər-istəməz məqbul görünən bir sıra əlamətləri, xüsusiyyətləri qəbul etməli oldu. Belə bir qarşılaşma, ədəbi əlaqə və təsir türkdilli poeziyada bəzi yeni bədii formaların yaranmasına da səbəb oldu.Tuyuğ da həmin prosesin məhsulu kimi nəşət tapıb formalaşdı. Yəni tuyuğun həcmi, şəkli əlamətləri, qafiyələnmə sistemi türkdilli poeziyada mövcud idi. Bu əlamətləri o, milli dildən, onun poetik atmosferindən götürürdü. Amma həmin formada ərsəyə gələn şeirlər sözün müsbət mənasında "əruzlaşmaya" məruz qaldıqda yeni keyfiyyət qazandı. Belə bir əlamət yeni poetik şəklin təşəkkülünə yol açdı. Onu mümkün və zəruri etdi. Təbii ki, bu tipli şeirlərin müəyyən məxsusi melodiya əsasında musiqi ilə ifa edilməsi də həmin formada yaranan poetik məhsulların poetik janra çevrilməsinə imkan yaratdı. Deyilən bu prosesə təkan verən digər mühüm bir amil də var idi. Bu, fars poeziyasında rübai janrı idi. Rübailər də həcminə, qafiyələnmə sisteminə görə tuyuğlarla ciddi oxşarlıq təşkil edir, hətta ilk çağlarda onunla qarışıq salınırdı (Burada bu iki janrın forma və şəkli əlamətlərini diqqət mərkəzində saxlamalı olduğumuzdan onların mövzu, məzmun, ideya və məcazlar sistemi baxımından oxşarlığına toxunmuruq. Çünki janrın müəyyənliyi daha çox forma, şəkil, zahiri əlamət və göstəricilərlə əlaqədardır). Təbii ki, əruz vəznində yazılan rübailər də tuyuğun müstəqil bir janr kimi formalaşmasına öz töhfəsini verib.

Fikrimizcə, XIV yüzilliyin ikinci yarısında artıq tuyuğun müstəqil bir poetik şəkil-janr kimi formalaşması başa çatıb. Q.Bürhanəddinin tuyuğlarının mükəmməlliyi (vəzn baxımından müəyyən naqisliklər olsa da) bunu aydın şəkildə sübut edir. Bu zaman artıq ***mani, rübai*** və ***tuyuğun*** da poetik sərhədləri tam şəkildə elitar ədəbi fikrə bəlli idi. Bunu İ.Nəsiminin iki tuyuğunda işlətdiyi əruz qəlibləri də aydın şəkildə sübut edir.

Maraqlı və diqqətəlayiq cəhətdir ki, əruz vəzninin bir sıra bəhrlərində, bu bəhrlərin müxtəlif növlərində (bəzən onlarla növündə) çoxlu sayda şeirlər yazan Nəsimi heç vaxt qələmə aldığı şeirin bəhrinə və janrına işarə etmir, onu söyləmir. Halbuki iki tuyuğunda o, son misra yerində (4-cü misra) bədii nümunənin qəlibini (fA'ilAtün fA'ilAtün fA'ilAt) də verir. Həmin tuyuğlar bunlardır:

*Ey üzün ayəti ənvari-sifat,*
*Zülfü xalın sureyi-vəlmürsəlat.*
*Ayağın tozuna dəyməz kainat,*
*Failatün, failatün, failat*
*Ey xətin Xızrü ləbin abi-həyat,*
*Ənbərin zülfün şəbi qədrü bərat.*
*Mehrü mah istər camalından zəkat,*
*Failatün, failatün, failat* (Nəsimi, 1973).

Əlbəttə, Azərbaycan şairinin başqa janrdakı poetik örnəklərdə deyil, yalnız tuyuğlarında əruz vəzninin konkret qəlibini verməsi, onu xüsusi olaraq nəzərə çatdırması məqsədli xarakter daşıyırdı. Bununla şair ***mani, rübai*** və ***tuyuğ*** arasındakı əsas fərqin nədən ibarət olduğunu bəyan edir, bunların arasındakı sərhədi müəyyənləşdirir, bir növ bu məsələ ilə bağlı fikir ixtilaflarına, mübahisələrə aydınlıq gətirmək məqsədi izləyirdi.

Beləliklə, bu ***üç janr (mani, rübai, tuyuğ)*** arasındakı fərq bundan ibarətdir: ***Manilər heca vəznində olur; Rübailər həzəc bəhrində yazılır; Tuyuğ isə rəməl bəhrində, daha dəqiq, rəməli-müsəddəsi-məqsurda qələmə alınır.***

Bundan əlavə tuyuğun Azərbaycan folklorunun qədim janrlarından olan bayatılarla da oxşarlığı vardır. Bir termin kimi adının qədim oğuz tayfa birliyi olan "Bayat"dan götürüldüyü güman edilən bayatılar həcmcə 4 misradan ibarət olub, aaba şəklində qafiyələnir. Heca vəznində yazılan (bu, onun əsas forma-şəkil elementlərindən biridir) bayatılarda hər misra, bir qayda olaraq, yeddi hecadan ibarət olur.

Onu da xüsusi olaraq vurğulamaq lazım gəlir ki, ümumiyyətlə, türk dilli xalq şeirində misraların dördlüklər halında qruplaşması şeirin forma-struktur əlaməti üçün aparıcı haldır. Xalq poeziyamızın qoşma, gəraylı, təcnis, bayatı, nəğmə (bir çox nəğmə və mahnılar) və s. kimi işlək janrları bunu aydın şəkildə sübut edir.

Qədim türk şeirində dördlüklər, əsasən, aşağıdakı qafiyələnmə sisteminə malik olmuşdur: *aaab, aaba; abcb; aaaa* və s. Bəzi hallarda isə misralarda qafiyə işlədilməyib, poetik nümunə, ritm və ahəng əsasında bədii məziyyət kəsb edib.

Tuyuğun zaman baxımından öz mənşəyini XII əsrdən götürməsini həmin əsrin böyük təriqət şairi Əhməd Yəsəvinin yaradıcılığı da sübut edir. Biz onun yaradıcılığında tuyuğun dəyərli nümunələrinə rast gəlirik. Məsələn:

*Duymasa sir məğnədin, adəm demə,*
*Sən anı surət görüb məhrəm demə,*
*Dəm bu dəmdir, özgə dəmni dəm demə,*
*Dünyadan biğəm gedərsən, ğəm demə*
(Usmanov, 1984).

Beləliklə, türkdilli poeziyanın inkişaf tarixində tuyuğun ilk nümunələrinə XII əsrdə Ə.Yəsəvinin, onun ilk çoxsaylı örnəklərinə isə XIV yüzillikdə Q.Bürhanəddinin yaradıcılığında rast gəlirik.

***"Rübai"*** ərəb sözüdür, lakin ərəb poeziyasında bu janrın nümunələrinə təsadüf edilmir. O, fars şeirinə məxsusdur. İlk nümunələrinə fars poeziyasının qüdrətli nümayəndələrindən Rudəkinin yaradıcılığında rast gəlinir. Qafiyələnmə sistemi *aaba* şəklindədir. Bəzən *aaaa* şəklində də qafiyələnir və buna ***"təranə"*** deyirlər. Rübai ***həzəc*** bəhrinin ***"rübai vəzni"*** adlanan xüsusi bir növündə (həmin növün müxtəlif variantlarında) qələmə alınır. Ə. Cəfər "rübai həzəci"ni Azərbaycan şeirində həzəc bəhrinin XIII növünə aid edir (Cəfər, 1977).

Rübaidən fərqli olaraq tuyuğ əruz vəzninin ***rəməl*** bəhrində, daha konkret şəkildə desək, bu bəhrində ***rəməli-müsəddəsi-məqsur*** növündə olur. Deyilən növün 3 variantında tuyuğlara rast gəlmək mümkündür. Həmin variantlardan *fA'ilAtün fA'ilAtün fA'ilün* qəlibində olanlar daha çox işlənir və kəmiyyətcə üstünlük təşkil edir. I variantın əsas göstəricisi odur ki, bütün misralar uzun hecalarla bitir.

Ə. Nəvainin aşağıdakı cinaslı tuyuğunda olduğu kimi:

*Sındı könğlüm şisəsi ğəm taşıdin,*
*Kan sırayet kıldı içü taşıdin,*
*Korkaram sen hem vəfasızlar tigin,*
*Bolmağay sen içki küfrü taşıdin*
(Banarlı, 1998).
*(Könlüm şişəsi qəm daşından qırıldı,*
*İçinə və çölünə qan yayıldı.*
*Qorxuram ki, sən də vəfasızlar kimi*
*İçi küfr və çölü din olmayasan).*

Növün II variantında misralar qısa heca ilə bitir. Bu variantın qəlibi *fA'ilAtün, fA'ilatün, fA'ilü* şəklindədir. Əmir Teymurun törəmələrindən olan Sultan İskəndər Şirazinin bu gözəl cinasla bəzədilmiş tuyuğu həmin qəlibdə qələmə alınıb:

*Tolun ayğa nisbət iytüm yarumu,*
*Ol hacaletdin kim oltı yarumu,*
*Tanrı-muyının zəkatın min birey,*
*Ya Mısırnı, Ya Halebni, ya Rumu*
(Banarlı, 1998).
*(Yarımı ayın on dördünə bənzətdim,*
*Ay səni görüb xəcalətdən yarım oldu.*
*Əgər onun saçının bir telinin zəkatını mən versəm,*
*Ya Misiri, ya Hələbi, ya da Rumu verməliyəm).*

Onu da əlavə edək ki, Azərbaycan şairlərində (Q.Bürhanəddində, İ.Nəsimidə, Xətaidə) hər iki növə aid nümunələr, əsasən, cinassız qafiyələrlə müşayiət olunur.

Növün III variantını fərqləndirən yeganə əlamət odur ki, misralar ikiqat uzun hecalarla bitir. III variantın qəlibi *fA'ilatün fA'ilAtün fA'ilAt (fA'ilan)* şəklindədir.

İ. Nəsiminin aşağıdakı tuyuğu növün bu variantındadır:

*Ey sacın dövründə məstur afitab,*
*Vey üzün aləmdə məşhur afitab,*
*Utanır hüsnündən, ey hur, afitab,*
*Səndən oldu məstü məxmur afitab*
(Nəsimi, 1973).

Rübai ilə tuyuğun qarışıq salınması XX əsrdə Bakıda Nəsimi və Xətai şeirlərinin nəşri zamanı müəyyən yanlışlığa yol açıb. Məsələn: Nəsiminin əsərlərinin S.Mümtaz nəşrində (1928) "Rübailər" adı ilə verilən 165 dördlüyün hamısı tuyuğdur. Bunu ciddi qüsur hesab edən əruzşünas alim Ə.Cəfər yazır: "Bizim bu vaxta qədər rübai dediyimiz Nəsimi dördlükləri rübai deyilmiş. Rübainin mənşəcə əruzla əlaqəsi yoxdur". Əruz ərəblərin, rübai isə farslarındır. Rübai xüsusi vəznə malik ayrıca janr və şeir şəklidir ki, özünəməxsus təfilələri və qəlibləri vardır. Əgər biz Nəsiminin bu 165 tuyuğunu rübai adlandırsaq, farsca yazılmış əsl rübailərini necə adlandırarıq?" (Nəsimi, 1973). Ümumiyyətlə, Nəsiminin əsərlərinin sonrakı nəşrlərində də "Rübailər" kimi təqdim edilən dördlüklərinin əksəriyyəti tuyuğdur. Ş.İ.Xətainin də 10-a qədər tuyuğu şairin əsərlərinin 1966-cı il (I cild) və bəzi sonrakı nəşrlərində yanlış olaraq rübai kimi verilib.

Öz mənşəyini heca vəznli milli şeir şəkillərindən (dördlüklərdən) götürən tuyuğ türk dilinə yad olan əruzla üzləşmədə, təbii olaraq müəyyən çətinliklərə, vəzn əngəllərinə rast gəlib, əruzun "poetik qazanında" asanlıqla həll olmayıb. Füzulinin dili ilə desək, Azərbaycan və ümumiyyətlə, türkdilli şairlər başqa janrlarda olduğu kimi milli dildə tuyuğ şəklində də "nəzmi-nazik" (zərif şeir) yaratmaqdan ötrü vəzn "düşvarını" asanlaşdırmağın ciddi əziyyətinə qatlaşmalı olub. Təsadüfi deyil ki, yaradıcılığında bu janra xüsusi önəm verən, onun xeyli nümunələrini yaradan Q. Bürhanəddinin tuyuğları nə qədər mükəmməl, nə qədər dolğun, məzmunlu və üstün sənətkarlıq səviyyəsinə malik olsa da, vəzn xətalarından xali deyil. Həm də bu xətalar xeyli çoxdur. F. Köprülüyə görə, tuyuğ səciyyə etibarı ilə nə qədər millidirsə, bir o qədər də "gəlmə"dir. Yəni o, heca vəznli dördlüklər qədər milli sayıla bilməz: "Bu nəzm şəkli sırf türkcəyə məxsus olmaqla bərabər, məsələn, varsağı dərəcədə milli bir şəkil sayılmaz; çünki əruz vəzni ilədir. Mr. Gibb "Osmanlı şeiri tarixində tuyuğu 11 hecalı milli bir nəzm tərziədd etməklə çox yanılıyor" (Köprülü, 1966).

Tuyuğun vəzn özəlliyində büruzə verən qüsurlar, əsasən, imalə və zihaflarda özünü göstərir. Türk dillərində uzun və qısa səslər, hecalar olmadığından tuyuğda işlənən bəzi sözlərdə səslər və ya hecalar vəznin məcburi tələblərinə görə uzadılmalı, yaxud qısaldılmalı olur. Halbuki həmin səs, yaxud heca adi halda adi qaydada tələffüz edilir. Məsələn, "iki" sözündə uzun heca yoxdur. Ancaq Qazi Bürhanəddinin aşağıdakı tuyuğunda 3-cü misradakı "iki" sözündə "i" səsi məcburən uzun tələffüz olunmalıdır:

*Əzəldə həq nə yazmış isə bolur,*
*Göz nəni ki, gərəcək isə görür*
*İki aləmdə həqə sığınmışuz,*
*Toxtamış nə ola, ya axsax Temur*
(Bürhanəddin, 1988).

fA'ilatün , fA'ilAtün, fA'ilün.

Qafiyə tuyuğun vacib poetik elementlərindən biridir. Qafiyə quruluşuna görə tuyuğlar üç cür ola bilər: *aaba; aaaa; abcb.* Sonuncu variant kifayət qədər az işlənir və Azərbaycan şairləri, demək olar ki, bu formadan istifadə etməyiblər. Q.Bürhanəddin və Ş.İ.Xətainin tuyuğlarının əksəriyyəti *aaba* şəklində qafiyələnir.

İ.Nəsimi isə qafiyələnmədə ikinci varianta daha çox meyil edib. Onun 1973-cü ildə çap olunan "Seçilmiş əsərlər"inə daxil edilib (əvvəlcə dediyimiz kimi burada "Rübailər və tuyuğlar" bölməsində verilən bütün rübailər əslində tuyuğdur) 330 tuyuğdan 44-ü aaba, 286-sı isə aaaa şəklində qafiyələnir.

Q. Bürhanəddindən – aaba:

*Dünyada gerçək aşiq qanı, qanı,*
*Aşiq isən gözünün qanı qanı?*
*Hər aşiq məşuq içün baş oynarsa,*
*Bən aşiqün yoluna canı, canı!*
(Bürhanəddin, 1988)

İ.Nəsimidən – aaaa:

*Favü zadü lamə düşdü könlümüz,*
*Kəbəvü ehramə düşdü könlümüz*
*Sünbülün tək damə düşdü könlümüz.*
*Arizuyi-kamə düşdü könlümüz*
(Nəsimi, 1973).

Nəsiminin bir çox tuyuğlarında, o cümlədən bu nümunədə həmqafiyə sözlərdən sonra bütün misralarda rədiflər işlədilir.

Tuyuğda həmqafiyə sözlər həm cinaslı, həm də cinassız ola bilər. Cinaslı qafiyələrdən istifadə etmək Azərbaycan şairlərinin yaradıcılığı üçün səciyyəvi deyil. Xətainin, ümumiyyətlə, cinaslı tuyuğu yoxdur. Q. Bürhanəddin və İ.Nəsiminin isə hər birinin bu tipdə cəmi bir neçə tuyuğu vardır. Həmin cinaslı tuyuğlarda isə yalnız iki misra (1-ci və 2-ci misralar) cinaslı olur. Yuxarıda Q.Bürhanəddindən verdiyimiz nümunədə 1-ci və 2-ci misralardakı “qanı” sözü cinas məqamında işlənib (1-ci misrada sual əvəzliyi – *qanı?, – hanı?;* 2-ci misrada isim – *“qan”+* mənsubiyyət şəkilçisi “ı”).

Lakin çağatay türkcəsində yazan Orta Asiya şairləri tuyuğlarda cinaslı qafiyələrdən daha çox yararlanıblar. Həm də çox vaxt onların şeirlərində bütün misralardakı həmqafiyə sözlər cinas məqamında işlənir. Bu mənada onlar tuyuğun həqiqətən, gözəl, cazibədar nümunələrini yarada biliblər.

***Lütfinin, Sultan İskəndər Şirazinin, Hacı Akca Kəndinin, Ə.Nəvainin, Ətainin, Z.M.Baburun*** yaradıcılığında cinaslı tuyuğların kifayət qədər mükəmməl örnəkləri ilə qarşılaşırıq. Yuxarıda biz cinaslı tuyuğların yüksək sənətkarlıqla qələmə alınmış nümunələri ilə tanış olduq. Tuyuğ milli bir janr kimi türk şairlərinin yaradıcılığında, əsasən, XIV–XVI yüzilliklərdə dəbdə olub, sonrakı əsrlərdə işləklikdən qalıb. Bu şeir şəklinə, əsas etibarı ilə, həmin əsərlərin Azərbaycan və Orta Asiya şairlərinin poetik irsində rast gəlirik. Osmanlı şairləri isə bir poeziya janrı kimi, demək olar ki, ona müraciət etməyiblər.

“Tuyuğ ” istilahının lüğəvi mənası ilə bağlı fikirlər müxtəlifdir. N.S.Banarlı onun “imalı və cinaslı şeir” anlamında işləndiyini söyləyir (Banarlı, 1998). Digər fikrə görə bu istilah ***“duymaq”*** sözündən olub ***“duyulan, hiss edilən bir şey haqqında söylənən şeir”*** mənasını verir. Üçüncü fikrə görə bu poetika termini ***“toy”*** (toy, şənlik) sözü ilə ***“uq”*** leksik şəkilçisindən (*ıq*[4] – isim düzəldən leksik şəkilçidir) düzəlib ***“toyda, şənlikdə, məclisdə oxunan şeir, nəğmə”*** anlamında işlənib.

Üçüncü fikir həqiqətə daha yaxın görünür. Çünki Ə.Marağayi bu tipli şeirlərin ilk çağlarda müəyyən melodiya ilə şənliklərdə, məclislərdə mahnı kimi oxunduğunu söyləyir. Deməli, bu istilah da özünün ilk məna və nəşət qaynağını oradan götürə bilər.

## NƏTİCƏ

Mövzu dairəsinə, ideya çalarlarına gəldikdə tuyuğlar mövzu və ideya baxımından əlvan və rəngarəngdir: ictimai, fəlsəfi, əxlaqi, dini mətləb və ideyalar, didaktika, öyüd-nəsihət, eşq və məhəbbətin, igidlik və ərənliyin tərənnümü, həyat və varlığın müəyyən məsələlərinə konkret münasibət və s. tuyuğların ideya-mövzu qalereyasına daxildir. Bu janra aid bədii örnəklərdə həm dünyəvi, həm dini, həm də sufiyanə-hürufiyanə, irfani mətləblərin ifadə olunduğunu görürük. Azərbaycan ədəbiyyatında Q.Bürhanəddinin tuyuğlarında dünyəvi motivlər, əxlaqi-didaktik fikir, eşqin, qazilik və ərənliyin tərənnümü aparıcıdır. İ.Nəsimidə sufi-hürufi görüşlər janrın əsas mövzu və ideya axarını təşkil edir. Ş.İ.Xətainin tuyuğları isə, əsasən, dini mövzuda olub imamətlə, şiə-qızılbaş ideyalarının təbliği ilə bağlıdır. Hökmdar şairin aşağıdakı tuyuğu deyilən fikrin aydın poetik sübutudur:

*Mən Hüseyni məzhəbəm, şahın qulu,*
*Yəni kim, mənidir, Allahın qulu.*
*Ey Xətai, padişah olmaz kişi,*
*Olmayınca uş bu dərgahın qulu*
(Xətai, 2005).

Tuyuğların mövzu dairəsi, ideya xətləri, sənətkarlıq və dil-üslub xüsusiyyətləri ayrıca məsələlər olduğundan burada bu barədə danışmağa ehtiyac görmürük. Çünki bunlar ayrıca, həm də məxsusi araşdırma tələb edir.

Ümumiyyətlə, tuyuğlar gərəkli bədii-mənəvi sərvət kimi istər türkdilli poeziyanın, istərsə də konkret olaraq Azərbaycan ədəbi xəzinəsinin zənginləşməsində əhəmiyyətli rol oynayıb, həmin xəzinənin qiymətli söz inciləri kimi bu gün də öz dəyərini itirməyib.

**İstifadə edilmiş ədəbiyyat**


1 Babur, Z.M. (1971). Müxtəsər. Daşkənd.
2 Bagirov, A. (1983). Tuyug v tyurkoyazychnoy poezii. Aftoref.kand. dis., Tashkent.
3 Bağırov, A. (1982). Tuyuğ haqqında bəzi mülahizələr. Azərbaycan SSR EA-nın xəbərləri (ədəb, dil və inc. ser.). № 3, s. 50-53.
4 Banarlı, N.S. (1998). Resimli türk edebiyyatı tarihi. I c. İstanbul, s. 202-203.
5 Bürhanəddin, Q. (1988). Divan. Bakı.
6 Cəfər, Ə. (1977). Əruzun nəzəri əsasları və Azərbaycan əruzu. Bakı.
7 Gibb, E. (1900). A History of Ottoman Poetry. London, Vol. 1., s.90.
8 Həsənli, B.Q. (2000). Bürhanəddin yaradıcılığının tədrisi."Azərbaycan dili və ədəbiyyatı tədrisi"jurnalı, № 2.
9 Xətai, Ş.İ. (2005). Əsərləri. Bakı.
10 Kaşğari, M. (2006). Divanü lüğat-it-türk. I c.; IV c. Bakı.
11 Kərimov, T. (1989). "Klassik Azərbaycan ədəbiyyatında tuyuğ və rübai janrı" . Azərbaycan ədəbiyyatının tarixi poetikası" (məqal. məc.) I kitab, Bakı, s. 66-83.
12 Korogly, K.G. (1980). «Transoformatsiya zhanra tuyug. Tipologiya i vzaimosvyazi fol"klora naradov SSSR». M:, str. 192-207.
13 Köprülü, F. (1966). Edebiyat araştırmaları. Türk tarih kurumu basımevi. Ankara, s. 210-211.
14 Köprülüzadə, M.F. (1934). "Türk klasik edebiyatında hususi nazım şekilleri". Tuyuğ – Türk dili ve edebiyatı hakkında araştırmalar. İstanbul. s. 204-256.
15 Melioranskiy, T.I. (1895). Otryvki iz divana Akhmeda Burkhan-yed-dina Sivasskogo . «Vostochnyye zametki» spv. str. 131-152.
16 Nevai, A. (1941). Mühakemetü'l-lüğateyn. Ankara.
17 Nəsimi, İ. (1973). Məqalələr məcmuəsi. Bakı.
18 Nəsimi, İ. (1973). Seçilmiş əsərləri. Bakı.
19 Nəvai, Ə. (2006). Mizanül-Övzan (çağataycadan çevirəni, qeydlərin və şərhlərin müəllifi: Quliyev T.) Bakı, Nurlan.
20 Samoylovich, A.N. (1917). Chetverostishiya – tuyugi Nevai. S.B. «Musul'manskiy mir», vyp: 1, Petrograd, str. 10-22.
21 Samoylovich, A.N. (1917). Cobraniye stikhotvoreniy imperatora Babura. Petrograd, str. 187-188.
22 Samoylovich, A.N. (1927). Khivinskiye tuyugi XIX v., DAN-V, str.43-44.
23 Stebleva, I.V. (1970). K voprosu o proiskhozhdenii zhanra tuyug. Sb. «Tyurkologicheskiy sbornik» M:, str. 136-147.
24 Usmanov, K. (1984). Drevniye istoki tyurkskogo stikha. Kazan', 1984.
25 Vəlixocayev, B. (1973). Əlişir Nəvai və onun uzdaşları təlqinində tuyuğ. "Ədəbi miras" məc., Daşkənd, № 3, s. 148-151.

# NİZAMİ GƏNCƏVİ YARADICILIĞINDA TƏLİM-TƏRBİYƏ, ƏXLAQİ-DİDAKTİK MƏSƏLƏLƏR VƏ ƏNƏNƏ PROBLEMLƏRİ

**ÜLKƏR BAXŞİYEVA**
Filologiya üzrə fəlsəfə doktoru, ADPU-nun filologiya fakültəsinin ədəbiyyatın tədrisi texnologiyası kafedrasının baş müəllimi.
E-mail: ulker.baxsiyeva@mail.ru
https://orcid.org/0000-0002-5994-2356

**Məqaləyə istinad:**
Baxşiyeva Ü. (2023). Nizami Gəncəvi yaradıcılığında təlim-tərbiyə, əxlaqi-didaktik məsələlər və ənənə problemləri. *Azərbaycan məktəbi.* № 1 (702), səh. 113–118

**Məqalə tarixçəsi**
Göndərilib: 20.02.2023
Qəbul edilib: 10.03.2023

**ANNOTASİYA**

Nizami Gəncəvi yaradıcılığında təlim-tərbiyə və əxlaqi-didaktik məsələlərin bədii-fəlsəfi ifadəsi xüsusi yer tutur. Böyük mütəfəkkir bu məsələlərə Şərq əxlaqi dəyərləri və türk epik düşüncə tipində yanaşıb. Məqalədə Nizami yaradıcılığı üçün xarakterik olan bu məsələlər təhlil olunub. Təhlil prosesində Nizami yaradıcılığının məzmun və ideya xəttini təşkil edən əxlaqi-tərbiyəvi nümunələrə istinad olunub. Nizami sənətində milli-mənəvi ideyaların humanizm fəlsəfəsinə xidmət etdiyi göstərilir. Məqalədə Nizami yaradıcılığının qayəsini təşkil edən humanizm və kamil insan fəlsəfəsinin mahiyyəti və onun tərbiyə məqamlarındakı rolu araşdırılıb. Şairin fikrincə, insan öz ağlı, zəkası, yüksək əxlaqi keyfiyyətləri ilə bu yüksəkliyə ucala bilər. Məqalədə düzgün təlim və tərbiyə üsullarının insan xarakterində müsbət keyfiyyətlərin formalaşmasındakı rolundan da bəhs olunub.

**Açar sözlər:** Nizami yaradıcılığı, əxlaqi-didaktik məsələlər, təhsilverici funksiya, inkişafetdirici funksiya, təlim üsulları.

# EDUCATION, MORAL AND DIDACTIC ISSUES AND PROBLEMS OF TRADITION IN THE CREATIVITY OF NIZAMI GANJAVI

**ULKER BAKSHIYEVA**
PhD in philology, senior teacher of the literature teaching technology department of Azerbaijan State Pedagogical University.
E-mail: ulker.baxsiyeva@mail.ru
https://orcid.org/0000-0002-5994-2356

**To cite this article:**
Bakshiyeva U. (2023). Education, moral and didactic issues and problems of tradition in the creativity of Nizami Ganjavi. *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 113–118

**ABSTRACT**

The artistic-philosophical expression of educational and moral didactic issues occupies a special place in Nizami Ganjavi's creativity. Nizami approached these issues in the style of Eastern moral values and Turkish epic thought. In the article, these issues characteristic of Nizami's creativity were analyzed. In the process of analysis, examples with moral and educational content that make up the content and idea line of Nizami's creativity were referred to. It is shown that national-spiritual ideas serve the philosophy of humanism in Nizami's art. The article examines the essence of humanism and the perfect human philosophy, which is the essence of Nizami's creativity, and its role in educational moments. According to the poet, a person can rise to this height with his mind, intelligence, and high moral qualities. The role of correct training and upbringing methods in the formation of positive qualities in human character was discussed in the article.

**Keywords:** Nizami creativity, moral-didactic issues, educational function, developmental function, training methods.

**Article history**
Received: 20.02.2023
Accepted: 10.03.2023

## GİRİŞ

Nizaminin əsərlərinin əsas ideyasını təşkil edən əxlaqi-tərbiyəvi məqamlar uşaq mütaliə nümunəsi kimi onların təlim-tərbiyəsində çox mühüm əhəmiyyət kəsb edir. Şairin əsərlərinin məzmun və ideya xəttində tərbiyənin bir çox növləri, xüsusilə də əqli tərbiyə üstünlük təşkil edir. N.Gəncəvi müasir elmi pedaqogikadan səkkiz əsr əvvəl göstərib ki, əqli tərbiyənin başlıca vasitəsi təlimdir. Şairə görə, təlim dərin bilikləri mənimsətməklə əqli zənginləşdirir, insanın əxlaqını saflaşdırır, onun mənəviyyatını yüksəldir. Nizami ağıl tərbiyəsi ilə tərbiyənin digər tərkib hissələri, xüsusilə, əxlaq tərbiyəsi arasında sıx qarşılıqlı əlaqəni aydın görüb və ona görə də yaradıcılığında tərbiyə ilə bağlı məqamlara həssas yanaşıb. Bu cəhəti xüsusi vurğulayan M.Cəfər yazır: "Nizaminin fikrincə, insan ağıl-kamalı təcrübə vasitəsilə və təlim-tərbiyə yolu ilə əldə edir" (Cəfər, 2003).

Nizamiyə görə, dünyada mövcud olan hər şeyi yalnız ağlın gücü ilə dərk etmək mümkündür. İnsanın ağlının formalaşmasında elmin, təhsilin mühüm rolu vardır. Ağıl tərbiyəsinin başlıca vəzifəsi zəngin elmi dünyagörüşünə sahib, bütün elmlərin sirlərinə dərindən bələd olan, hər şeyi kamil bilən insan yetişdirməkdir. Bunun üçün insan davamlı oxuyub öyrənməlidir. Bu, insanın mənən kamilləşməsinə, mənəvi-əxlaqi keyfiyyətlərlə zənginləşməsinə səbəb olan əsas amillərdəndir. Nizaminin "Sirlər xəzinəsi" poemasında uşaq mütaliə nümunəsi kimi dəyərləndirilən "Yaralı bir uşağın dastanı" hekayəsində ağılın insan həyatında mühüm rol oynamasından bəhs olunur. Bir neçə uşaq birlikdə oynayarkən onlardan biri yıxılaraq əzilir. Yoldaşları onu quyuya atmağı təklif edirlər. Lakin həmin uşaqla yaxşı münasibəti olmayan bir nəfər yoldaşlarının məsləhətinə qulaq asmır, öz ağlına güvənərək yaralanmış uşağın atasına bu xəbəri çatdırır.

*Ciddiləşib, üz tutdu öz arxadaşlarına,*
*– Örtmək olmaz bu işi! – dedi yoldaşlarına.*
*Məndən görərlər. Məni düşmən bilirlər ona,*
*Büdrəyənin suçunu yükləyərlər boynuma.*
*– Qoy gəlib çarə qılsın! – Yürüdü zirək oğlan,*
*Uşağın atasına xəbər apardı əlan*
(Gəncəvi, 2004).

Nizami bu hekayədə əsas ideya xətti kimi ağlın üstünlüyünü təbliğ edib. Şairə görə insan ağlı, cəsarəti sayəsində hər çətinlikdən üzü ağ çıxa bilər.

*Kimin ki xilqətində hikmət cövhəri vardır,*
*Hər şeyə çarə tapır, həmişə üz ağardır.*
*Göylər vuran düyünü, soruş, yerdə kim açar?*
*Ayağını göylərə cəsarətlə basanlar.*

Əsərdən görürük ki, uşaq ağlı sayəsində həm özünü, həm də yoldaşını çətinlikdən xilas etmiş olur.

## TƏDQİQAT

"Xəmsə"yə daxil olan bütün poemaların baş qəhrəmanları yalnız yüksək təhsili, təlimi və tərbiyəsi sayəsində inkişaf edərək bir şəxsiyyət kimi formalaşır, kamillik zirvəsinə yüksələ bilir. Nizamiyə görə, kamil insanın formalaşmasında elmin, təhsilin, biliklərə yiyələnməyin böyük rolu vardır.

Şairin bədii-fəlsəfi düşüncəsinə görə insan öz sənətinin peşəkarı, bilicisi olmalıdır.

O, təlim və tərbiyənin insanın formalaşmasında mühüm rol oynadığını hələ XII əsrdə vurğulayıb, təlimin mahiyyəti, əhəmiyyəti, təşkili formaları, bu prosesdə müəllimin rolu, şagird-müəllim, şagird-şagird, müəllim-valideyn, valideyn-şagird əməkdaşlığı və s. haqqında çox dəyərli fikirlər irəli sürüb. Şərq ədəbiyyatında, eləcə də pedaqoji fikir tarixində ilk dəfə olaraq, məhz Nizami Gəncəvi təlimin təhsilləndirici funksiyası ilə yanaşı, onun tərbiyələndirici və inkişafetdirici funksiyalarının öyrənmə prosesində xüsusi əhəmiyyət daşıdığını bu funksiyaların daha aktual olduğu indiki dövrdən təxminən səkkiz yüz il əvvəl öz poemalarında qeyd edib. Məlum olduğu kimi bilik, bacarıq və vərdişlərin formalaşdırılmasında təlimin təhsilverici funksiyası xüsusi əhəmiyyətə malikdir. Çünki bu funksiya biliklərin tamlığını,

sistemliliyini və dərk edilməsini təmin edir. Bacarıqlar müvafiq mövzular üzrə mənimsənilmiş biliklər əsasında yerinə yetirilən kompleks tədbirlər kimi başa düşülür. Təlim prosesində qazanılan bilik və bacarıqlar təkrar fəaliyyətlər nəticəsində möhkəmlənirsə o, vərdişə çevrilir. Oxu və yazı, dərsliklərlə işləmək səriştəsinin formalaşması da qazanılan vərdişlərin səviyyəsindən asılıdır.

Tərbiyəedici funksiya təlim prosesində şagirdlərin dünyagörüşünün, əxlaqi və estetik təsəvvürünün, fəaliyyət motivlərinin formalaşmasına kömək edir. Öyrətmək həm də tərbiyə etmək olduğundan bu obyektiv qanunauyğunluq təlimin mahiyyəti ilə bağlı vəzifədir. Ən əsas əhəmiyyəti isə öyrənilən materialın məzmununda olan tərbiyəvi ünsürlərin müəyyən edilməsi və onların təhsilalanlara çatdırılması ilə xarakterizə olunur. Deməli, keçilən mövzunun tərbiyəvi məqsədini müəyyənləşdirmək və onu şagirdlərə mənimsətmək vacib amillərdən hesab olunmalıdır. Digər tərəfdən, hər bir mövzu planlaşdırılarkən onun təhsilləndirici vəzifəsi ilə yanaşı, tərbiyələndirici vəzifəsi də nəzərə alınmalıdır. Buna nail olmaq daha çox müəllimin pedaqoji ustalığından asılıdır. Tədris olunan fənlər, o cümlədən ədəbiyyat tərbiyəedici məzmun baxımından geniş imkanlara malikdir.

İnkişafetdirici təlim dedikdə, təhsilalanların intellektual inkişafına səbəb ola biləcək potensial imkanlardan maksimum səviyyədə istifadə edilməsi, onların əqli cəhətdən inkişafının təmin olunması, emosional və iradi keyfiyyətlərinin, təşəbbüskarlıq imkanlarının artırılmasına zəmin yaradan əlverişli təlim mühiti başa düşülür. İnkişafetdirici təlimə nail olunması üçün tədris, şagirdlərin yaş və bilik səviyyəsinə uyğun təşkil olunmalı, öyrənmə prosesinin nəticəyönlülüyü təmin edilməli, biliyi təcrübədə tətbiq etmək, özünütəhsil, özünütərbiyə və özünütəkmilləşdirmə vərdişləri formalaşdırılmalıdır.

Nizami əsərlərində təlimin təşkili formalarından bəhs edərkən fərdi və sinif-dərs modelini təsvir edib. Professor Ş. Mikayılovun qeyd etdiyi kimi, "Nizaminin ədəbi qəhrəmanlarının bəziləri (Xosrov, Bəhram) fərdi təhsil alır, lakin "Leyli və Məcnun", "İsgəndərnamə" əsərlərində, sözün həqiqi mənasında, məktəbdən, sinif-dərs sistemindən danışılır: Məsələn, "İsgəndərnamə" poemasında Ərəstunun təlim vermək üçün bir "ev düzəltdiyi" və burada "yüz nəfər şagirdə dərs öyrətdiyi" göstərilir (Mikayılov, 1984).

"Leyli və Məcnun" poemasında Qeysin "bir bölük" uşaqla dərs oxuması faktı bu fikri bir daha təsdiq edir (Gəncəvi, 2004).

Bildiyimiz kimi, təlimin təşkilinin sinif-dərs forması Avropada ilk dəfə XVII əsrdə tətbiq olunub. Lakin Nizaminin əsərlərində hələ XII əsrdə təlimin təşkilində sinif-dərs formasının elementlərinə toxunulması faktı onun yaradıcılığının sadəcə bədii deyil, həm də elmi cəhətdən yüksək əhəmiyyət kəsb etdiyini göstərir. Şairin "İsgəndərnamə" əsərinin "Şərəfnamə"sində "İsgəndərin təlim alması" səhnəsində qarşılıqlı təlim prinsipinə rast gəlirik. İsgəndərin atası Feyləqus onun təlim-tərbiyəsini "biliklə dolu" olan "alim" Niqumaşa tapşırır. Niqumaş İsgəndərə dərin biliklər, "şahanə tərbiyə, hünər, nəzakət" verməklə yanaşı, onun təlim-tərbiyəsini, eyni zamanda öz oğlu "alim Ərəstu"ya tapşırmışdı:

*Həmdərsi Ərəstu, bir qardaş deyə,*
*Ürəkdən bağlıydı bu şahzadəyə.*
*Ərəstu aldıqca bilik atadan,*
*Ona öyrədirdi hər an, hər zaman*
(Gəncəvi, 1982).

Əsərin bu hissəsində müəllim-şagird əməkdaşlığı prinsipinin mövcudluğunun şahidi oluruq. Nizami təlim-tərbiyə işində, xüsusilə, şəxsiyyətin formalaşması prosesində müəllimin rolunu yüksək qiymətləndirib. Bu səbəbdən də şair "Xəmsə"də Büzürgümüd ("Xosrov və Şirin"), Mənzər ("Yeddi gözəl"), Niqumaş, Aristotel ("İsgəndərnamə") və s. kimi ensiklopedik biliyi, yüksək mənəvi keyfiyyətləri ilə diqqəti cəlb edən müəllim obrazları yaradıb, müəllim-şagird münasibətlərinə dair bu gün də öz aktuallığını və pedaqoji dəyərini itirməyən fikirlər söyləyib. Həm təlim, həm də tərbiyə işində müəllimin müstəsna rolunu çox yüksək qiymətləndirən şair, demək olar ki, bütün poemalarında bu

məsələyə xüsusi toxunub. Belə ki, Xosrovun ("Xosrov və Şirin"), Qeysin ("Leyli və Məcnun"), Bəhramın ("Yeddi gözəl"), həm də İsgəndərin, Qibtli Mariyənin və Arşimidesin ("İsgəndərnamə") müəllimləri yüksək savadı, zəngin mənəviyyatı ilə fərqlənən "alim" müəllimlər, "ustad" tərbiyəçilərdir. Professor Y.Talıbovun qeyd etdiyi kimi: "Nizamiyə görə, müəllim özünün dərin biliyi, yüksək mənəviyyatı, əxlaqı ilə seçilməlidir. Onun təsvir etdiyi müəllimlər yüksək ağıl, kamal sahibi, gözəl mənəviyyat timsalıdırlar, ensiklopedik bilikləri ilə zəmanəsinin adamlarını heyran qoyublar. Onlar dövrünün bütün elmlərini, habelə hərb elmlərini, sənətlərini dərindən bilir, Yerlə göyün qovuşmasından, nücum (astronomiya) elminin gələcəkdən xəbər verməsindən bəhs edirdilər" (Talıbov, Sadıqov, Quliyev, 2000).

"Xosrov və Şirin" poemasının baş qəhrəmanı Xosrovun müəllimindən bəhs etdiyi məqamda, şairin bu müqəddəs peşə sahiblərinə olan yüksək diqqət və sevgisinin şahidi oluruq. Belə ki, Nizami ensiklopedik biliyə sahib olan müəllim obrazlarını, o cümlədən yüksək ağıl və istedad sahibi olan Büzürgümüdü əsərlərində məqsədli şəkildə canlandırıb (Gəncəvi, 2004).

"Yeddi gözəl" poemasının baş qəhrəmanı Bəhram Gurun müəllimi Münzir də hərtərəfli biliyi, ərəb, fars, yunan dillərini yaxşı bilməsi, həmçinin "Ulduzlar elmində kəskin məharət"i, həndəsə elminə dərindən bələdliyi və ölçmə işlərində yüksək bacarığı ilə fərqlənir (Gəncəvi, 1983).

"İsgəndərnamə" poemasında şairin təsvir etdiyi "alim Ərəstu" poemada o həm İsgəndərin, həm Arşimidesin, həm də Qibtli Mariyənin müəllimi kimi təqdim olunur, həm ensiklopedik zəka sahibi kimi, həm də "pak" əxlaqı ilə diqqəti cəlb edir (Gəncəvi, 1982).

Bu nümunələrdən göründüyü kimi, təlim-tərbiyə sistemində müəllimin əsas sima olduğunu Nizami Gəncəvi hələ XII əsrdə bilib, onları kamil insanın formalaşması işində mühüm rol oynayan intellektual qüvvə kimi təqdim edib.

Müəllim-şagird əməkdaşlığına "İsgəndərnamə" poemasında İsgəndərin öz müəllimi Niqumaşa olan səmimi münasibətinin və ehtiramının təsvirini nümunə göstərə bilərik. Poemanın "İqbalnamə" hissəsində isə "alim Ərəstu" ilə onun şagirdi Arşimidesin qarşılıqlı hörmət və səmimiyyətini görürük. Ərəstu Arşimidesin xətrini o dərəcədə çox istəyirdi ki, o, dərsə gəlməyəndə (qalan doxsan doqquz şagird gəlsə də) bərk narahat olur, digər şagirdlərə dərs keçmək istəmirdi. Çünki Arşimides həm çox savadlı və bacarıqlı, həm də müəlliminə böyük həvəslə, diqqətlə qulaq asan, məsuliyyətli bir şagird idi. Ona görə də Arsimides dərsə tək gələndə, digər şagirdlər gəlməsə belə, Ərəstu ona çox böyük həvəslə dərs keçirdi. Bu hissədə təlim prosesində şagirdlərin fərdi xüsusiyyətlərinin nəzərə alınmasının şahidi oluruq. Məlum olduğu kimi şagirdlərin fərdi xüsusiyyətlərinin nəzərə alınması müasir elmi pedaqogikada həm təlimin, həm də tərbiyənin əsas prinsiplərindən biri hesab olunur.

"İsgəndərnamə" poemasında "Qibtli Mariyənin hekayəsi və onun kimyagərliyi" fəslində "Alimi Ərəstu"dan "elmin sirlərini" dərindən öyrənən Mariyə doğma yurduna qayıdıb onu azad edir və hakimiyyət başına keçir. Şair bununla demək istəyib ki, təkcə hərb gücü ilə deyil, elm gücü ilə də düşmənə qalib gəlmək mümkündür. Bu hissədə əqli tərbiyənin nümunəsini görürük:

*Gördü ki, ağıllı, kamallı vəzir,*
*Əyləşib bir dəstə gəncə dərs verir...*
*Gördü ki, dava bir cəncəlli işdi,*
*Həvəslə, səy ilə elmə girişdi...*
*Təkcə təlim oldu fikri, məqsədi,*
*Məqsədə biliklə çatmaq istədi*
(Gəncəvi, 1982).

## NƏTİCƏ

"Xəmsə"nin hər bir məsnəvisi bir bədii-fəlsəfi sənət abidəsidir. Onların hər biri bədii-estetik baxımdan mükəmməl yaradıcılıq nümunəsidir. Yəni Nizami istər birinci məsnəvisi olan "Sirlər xəzinəsi"ndə, istərsə də ondan çox

illər sonra, ömrünün sonlarına doğru yazdığı "İskəndərnamə"də eyni dərəcədə yüksək şairlik istedadı nümayiş etdirib.

Tədqiqatçıların müşahidələrinə görə, Nizaminin yaradıcılığında bədii-fəlsəfi baxımdan vahid bir ideya-təkamül xətti vardır: insanın mənəvi, əxlaqi cəhətdən kamilləşməsi. Bu ideya xəttinin əsas mahiyyətində insanın mənən, ruhən tərbiyə olunması dayanır.

Deyilənlərdən belə nəticəyə gələ bilərik ki, Nizami yaradıcılığının məzmun və ideya xəttini təşkil edən əxlaqi-tərbiyəvi məzmunlu nümunələr, humanizm ideyalarını, milli və bəşəri ideyaları təbliğ edən əsərlər bilavasitə tərbiyənin formalaşmasında mühüm rol oynayır. Nizami yaradıcılığının mayasını təşkil edən humanist dəyərlərə malik kamil insan ucalığına insan öz ağlı, zəkası, yüksək əxlaqi keyfiyyətləri ilə yüksələ bilər. Bütün bu sadalanan keyfiyyətlərə nail olmaqdan ötrü düzgün təlim və tərbiyə üsullarından istifadə olunmalıdır.

**İstifadə edilmiş ədəbiyyat**


1 Cəfər, M. (2003). Nizami yaradıcılığında humanizm // Cəfər M. Seçilmiş əsərləri. I cild. Bakı: Çinar-çap, s. 62-69.

2 Gəncəvi, N. (1982). İsgəndərnamə. Şərəfnamə / Fars dilindən tərcümə edən Abdulla Şaiq. Elmi redaktoru və ön sözün müəllifi prof. Q. Əliyev İqbalnamə. Fars dilindən tərc. ed. M. Rzaquluzadə. İzahlar Ə. Cəfərindir. Baki: Yazıçı, 688 s.

3 Gəncəvi, N. (1983). Leyli və Məcnun / Tərcümə edən S. Vurğun. İzahların müəllifi M. Əlizadə. Bakı: Yazıçı, 303 s.

4 Gəncəvi, N. (1983). Yeddi gözəl / Tərcümə edəni M. Rahim. Ön sözün, izahların müəllifi və elmi redaktoru R. Əliyev. Bakı: Yazıçı, 355 s.

5 Gəncəvi, N. (2004). Xosrov və Şirin / Tərcümə edən Rəsul Rza. İzahların müəllifi Məmmədağa Sultanov. Bakı: Lider nəşriyyatı, 391 s.

6 Gəncəvi, N. (2004). Sirlər xəzinəsi / Farscadan tərcümə edən və izahların müəllifi X.R.Ulutürk. Bakı: Lider nəşriyyatı, 262 s.

7 Mikayılov, Ş. (1984). Nizami Gəncəvinin pedaqoji görüşlərinə dair // Azərbaycan məktəbi, № 9, s.47-52.

8 Talıbov, Y., Sadıqov, F., Quliyev, S. (2000). Azərbaycanda məktəb və pedaqoji fikir tarixi. Bakı: Ünsiyyət, 516 s.

# AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ŞUŞA FİLİALI (1989-1992-ci illər)

**FƏRRUX RÜSTƏMOV**
Pedaqoji elmlər doktoru, professor, ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, Əməkdar elm xadimi. E-mail: farrukhrustamov@gmail.com
https://orcid.org./0000-0003-2033-1678

**Məqaləyə istinad:**
Rüstəmov F. (2022). Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şuşa filialı (1989-1992-ci illər). *Azərbaycan məktəbi.* № 1 (702), səh. 119–125

**Məqalə tarixçəsi**
Göndərilib: 19.10.2022
Qəbul edilib: 14.11.2022

**ANNOTASİYA**

28 noyabr 1973-cü ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Xankəndi filialı əsasında müstəqil Xankəndi Pedaqoji İnstitutu təşkil edilib. Filialın təşkilində əsas məqsəd Azərbaycanın qədim və əzəli torpağı olan Qarabağ bölgəsindəki Azərbaycan və erməni məktəblərini yüksəkixtisaslı müəllim kadrları ilə təmin etmək idi. 28 noyabr 1973-cü ildə filialın bazasında müstəqil Xankəndi Pedaqoji İnstitutu təşkil edildi. 1988-ci ildə Qarabağda baş verən erməni qiyamının ilk zərbəsi Xankəndi Pedaqoji İnstitutunun Azərbaycan şöbəsinin pedaqoji kollektivinə dəydi. İnstitutun Azərbaycan şöbəsinin ölüm təhlükəsi ilə üzbəüz qalan müəllim və tələbələri 1988-ci il mayın 16-da erməni silahlıları tərəfindən Xankəndindən qovuldu. 1 noyabr 1989-cu ildə Şuşada Azərbaycan Pedaqoji İnstitutunun Şuşa fakültəsi yaradıldı. 26 yanvar 1991-ci ildə Şuşa fakültəsinin əsasında ADPİ-nin Şuşa filialı təşkil edildi. 1992-ci il martın 25-də filialın kollektivi Ağcabədi şəhərinə köçürüldü. Məqalədə Şuşa filialının keçdiyi çətin və mürəkkəb inkişaf yolu araşdırılıb.

**Açar sözlər:** Şuşa şəhəri, Xankəndi filialı, Şuşa fakültəsi, filial, mədəniyyətimizin paytaxtı.

# SHUSHA BRANCH OF AZERBAIJAN STATE PEDAGOGICAL UNIVERSITY (1989-1992 years)

**FARRUKH RUSTAMOV**
Doctor of pedagogical sciences, professor, Dean of the Faculty of Primary Education of ADPU. E-mail: farrukhrustamov@gmail.com
https://orcid.org./0000-0003-2033-1678

**To cite this article:**
Rustamov F. (2022). Shusha Branch of Azerbaijan State Pedagogical University (1989-1992 years). *Azerbaijan Journal of Educational Studies.* Vol. 702, Issue I, pp. 119–125

**Article history**
Received: 19.10.2022
Accepted: 14.11.2022

**ABSTRACT**

On November 28, 1973, on the basis of the Khankendi branch of Azerbaijan State Pedagogical Institute, an independent Khankendi Pedagogical Institute was established. The main goal of the organization of the branch was to provide Azerbaijani and Armenian schools of Karabakh region, which is the ancient land of Azerbaijan, with highly qualified teaching staff. On November 28, 1973, an independent Khankendi Pedagogical University was established on the basis of the branch. The first Armenian uprising in Karabakh in 1988 effected the teaching staff of the Azerbaijani branch of Khankendi Pedagogical University. On May 16, 1988, the teachers and students of the Azerbaijani branch of the University were expelled from Khankendi under the threat of death by the Armenian armed forces. On November 1, 1989, the Shusha Faculty of Azerbaijan State Pedagogical University was established in Shusha. On January 26, 1991, the Shusha branch of Azerbaijan State Pedagogical University was established on the basis of the Shusha Faculty. On March 25, 1992, the staff of the branch was transferred to the city of Agjabedi. The difficulty and complicated way of development of the Shusha branch is discussed in the article.

**Keywords:** Shusha, Khankendi, Shusha faculty, branch, capital of our culture.

## GİRİŞ

1992-ci ildə Ermənistan Respublikasının silahlı dəstələri Şuşa şəhərini işğal etməklə Azərbaycan xalqının maddi-mənəvi, mədəni irsinə, illərlə formalaşmış təhsil infrastrukturuna ağır zərbə vurdular. Dağıntıya məruz qalan təhsil ocaqlarından biri də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şuşa filialı oldu. Şuşa filialı Xankəndi Pedaqoji İnstitutunun Azərbaycan şöbəsi əsasında yaranıb. Bəs Xankəndi Pedaqoji İnstitutu özü necə və hansı məqsədlə yaradılmışdı?

## PEDAQOJİ İNSTİTUTUN XANKƏNDİ FİLİALI

Xankəndi Pedaqoji İnstitutu ADPİ-nin 1968/69-cu tədris ilindən fəaliyyətə başlayan Xankəndi filialı əsasında təşkil olunub (Rüstəmov, 2021). Filialın təşkilində əsas məqsəd Azərbaycanın qədim və əzəli torpağı olan Qarabağ bölgəsindəki Azərbaycan və erməni məktəblərini yüksək-ixtisaslı müəllim kadrları ilə təmin etmək idi. İlk vaxtlar filologiya, tarix və fizika-riyaziyyat fakültələrində 8 ixtisas (Azərbaycan dili və ədəbiyyatı, erməni dili və ədəbiyyatı, riyaziyyat, riyaziyyat-əlavə fizika, fizika, tarix, ümumi texniki fənlər və əlavə fizika) ixtisasları üzrə kadr hazırlanırdı. İlk tədris ilində filiala 245 tələbə qəbul olundu. Təlim Azərbaycan və erməni dillərində aparılırdı. 1972-ci ildə 4 fakültədə, 30 qrupda 720 nəfər tələbə təhsil alırdı. Onların təhsil-tərbiyəsi ilə 50-yə yaxın müəllim məşğul olurdu (Rüstəmov, 2021). Pedaqoji İnstitutun professor-müəllim heyəti müntəzəm olaraq Xankəndi filialına tələbə qəbulu aparmağa, mühazirə oxumağa, dövlət imtahanlarında iştirak etməyə ezam olunurdu. Filialın müəllim və tələbələri Pedaqoji İnstitutla sıx əlaqə saxlayır, müxtəlif konfranslarda və tədbirlərdə iştirak edirdilər.

Pedaqoji İnstitutun yarıməsrlik yubileyi münasibəti ilə 5-7 aprel 1972-ci ildə institutun əsas binasında (indiki Sahil körpüsü) Xankəndi filialı günləri keçirilib. Tədbirdə institutun rektoru professor Həşim Ağayev, institut partiya komitəsinin katibi İ.Süleymanov, filologiya fakültəsinin dekanı, professor Afad Qurbanov, institut komsomol komitəsinin katibi Rəcəb Əliyev çıxış edərək institutun 50 ildə qazandığı tədris və elmi uğurlarından bəhs ediblər.

## XANKƏNDİ PEDAQOJİ İNSTİTUTU

28 noyabr 1973-cü ildə filialın bazasında müstəqil Xankəndi Pedaqoji İnstitutu təşkil edildi. İnstitutda Azərbaycan, erməni və rus məktəbləri üçün müəllim kadrları hazırlığı həyata keçirilirdi. 1973-1988-ci illərdə Xankəndi Pedaqoji İnstitutunda 3 minə yaxın müəllim hazırlanıb. 1974-1988-ci illərdə professor Nəcəf Quliyev institutun prorektoru vəzifəsində çalışıb. 1988-ci ildə Xankəndi Pedaqoji İnstitutunda 10 kafedrada 102 nəfər müəllim çalışırdı ki, onlardan da 4 nəfəri elmlər doktoru, professor, 36 nəfəri elmlər namizədi, dosent idi. Aspirantura hazırlığı keçən 17 nəfər gənc tədqiqatçı dissertasiya müdafiəsi ərəfəsində idi.

## QARABAĞDA ERMƏNİ QİYAMI

1988-ci ildə Qarabağda baş verən erməni qiyamının ilk zərbəsi Xankəndi Pedaqoji İnstitutunun Azərbaycan şöbəsinin pedaqoji kollektivinə dəydi. Azərbaycan torpağı olan Qarabağın dağlıq hissəsində yaşayan ermənilərin ərazi iddiaları ilə çıxış etmələri Xankəndi Pedaqoji İnstitutunda tədris prosesinin pozulması ilə nəticələndi. Xankəndi Pedaqoji İnstitutunun azərbaycanlı professor-müəllim və tələbə kollektivi erməni millətçilərinin əməllərinin, məkrli planlarının həyata keçirilməsinə maneçilik törətdiyindən onlara ciddi fiziki və mənəvi təzyiq göstərilirdi. İnstitutun Azərbaycan şöbəsinin ölüm təhlükəsi ilə üzbəüz qalan müəllim və tələbələri 1988-ci il mayın 16-da erməni silahlıları tərəfindən Xankəndindən qovuldu. Pedaqoji kollektiv Şuşa Mədəni-Maarif Texnikumunun tədris binası və yataqxanasında yerləşdirildi. 26 iyun 1998-ci ildə texnikumun binasında Şuşa ictimaiyyəti ilə görüşən Xüsusi İdarəetmə Komissiyasının sədri A.Volski növbəti tədris ilində tələbələrin Xankəndi Pedaqoji İnstitutuna qaytarılacağı haqqında söz verdi.

## ERMƏNİ İDDİALARININ GENİŞLƏNMƏSİ

Erməni iddialarının getdikcə genişlənməsi problemin tezliklə həllinə şübhə yaradırdı. Azərbaycanlı tələbələrin yenidən Xankəndi Pedaqoji İnstitutuna qayıdaraq ermənilərlə birlikdə təhsil alması qeyri-mümkün idi. 14 oktyabr 1988-ci ildə SSRİ Nazirlər Sovetinin sədri N.Rıjkov Xankəndi Pedaqoji İnstitutunun fəaliyyətinin müvəqqəti dayandırılması haqqında qərar verdi. Bununla əlaqədar olaraq SSRİ Xalq Təhsili Komitəsinin sədr müavini Q.F.Qusev 17 oktyabr 1988-ci il tarixində 6 maddədən ibarət 382 nömrəli qərar verdi”[1]. Xankəndi Pedaqoji İnstitutunun 2 il müddətinə müvəqqəti olaraq bağlanması qərara alındı. Bununla əlaqədar olaraq institutun tələbələrinin həmin il noyabrın 1-nə kimi Azərbaycanın Gəncə, Ermənistanın Yerevan, Leninakan və Kirovakan pedaqoji institutlarına köçürülməsi planlaşdırıldı. Erməni şöbəsi qərara etinasız yanaşaraq öz fəaliyyətini Sovet Azərbaycanının 60 illiyi adına Xankəndi Pedaqoji İnstitutunda davam etdirdi. Azərbaycan xalq təhsili naziri Müslüm Məmmədov Azərbaycan şöbəsi tələbələrinin bir hissəsinin Gəncə, digər hissəsinin isə Naxçıvan pedaqoji institutlarına köçürülməsi qərarına gəldi. İki yerə bölünmə ilə bağlı kollektivin (kollektivə müvəqqəti olaraq Raqub Kərimov rəhbərlik edirdi) ciddi etirazından sonra 100 nəfərlik professor-müəllim kollektivi və 1200 nəfər tələbə Gəncə Pedaqoji İnstitutuna köçürüldü. Müəllim və tələbələrin Gəncə Pedaqoji İnstitutuna köçürülməsi ilə bağlı Azərbaycan xalq təhsili naziri Müslüm Məmmədov 18 oktyabr 1988-ci ildə 6 maddədən ibarət 121 nömrəli qərar verdi və müvafiq komissiya (14 nəfərdən ibarət) yaratdı. Komissiyanın sədri nazir müavini Y.İ.Korotkov, müavin isə B.A.Xankişiyev idi.

## TƏLƏBƏLƏRİN GƏNCƏ PEDAQOJİ İNSTİTUTUNA KÖÇÜRÜLMƏSİ

Həmin dövrdə Gəncə Pedaqoji İnstitutuna Qurban Qurbanov rəhbərlik edirdi. O, Şuşadan gələn tələbələrin instituta yerləşdirilməsi ilə bağlı 22 oktyabr 1988-ci il tarixli 5/199 nömrəli əmr imzaladı. Tələbələr həmin il noyabrın 25-də Gəncədə tədrisə başladılar. Bir ilə yaxın Gəncədə fəaliyyət göstərən pedaqoji kollektivin təkidli tələbi ilə şöbənin Şuşaya köçürülməsi qərara alındı. 1989-cu il oktyabrın 25-də pedaqoji kollektiv Şuşaya köçürüldü. Bir gün sonra dərslər başlandı. Müəllim və tələbələrin Şuşaya köçürülməsində dosent Raqub Kərimovun, dosent Ənvər Əhmədin, dosent Mayıl Alıcanovun, dosent Zəfər Hüseynovun, dosent Mirələm Vəliyevin, dosent Süleyman Zeynalovun mühüm xidmətləri oldu.

## ADPU-NUN ŞUŞA FAKÜLTƏSİ

Azərbaycan SSR xalq təhsili naziri Rafiq Feyzullayevin 1 noyabr 1989-cu il tarixli 1160 nömrəli əmrinə əsasən Şuşada Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Şuşa fakültəsi yaradıldı və internat məktəbinin bazasında yerləşdirildi. Bu məqsədlə Şuşa rayon Partiya Komitəsi 160 min rubl vəsait ayırdı. Xankəndi Pedaqoji İnstitutunun ləğvindən sonra Gəncəyə və digər ali pedaqoji məktəbə gedən tələbələr öz fakültələrinə qayıtdı. 15 noyabr 1989-cu ildə ADPİ-nin rektoru, professor Səlvər Aslanovun əmri ilə tarix elmləri namizədi, dosent Mayıl Alıcanov fakültənin dekanı, dosent Zəfər Hüseynov dekan müavini təyin edildi. Professor Nəcəf Quliyev, professor Nazim Axundov, professor Kamil Quliyev, dosent Süleyman Zeynalov, dosent Ənvər Əhməd, dosent Mirələm Vəliyev, dosent Yusif Ağayev, dosent Zabil Bayramov, dosent Şahlar Kərimov, dosent Yusif Fərzəliyev, dosent İnqilab Quliyev, dosent Kazım Mirzəyev, dosent İslam Həşimov, dosent Raqub Kərimov, dosent Nəsib Şəfiyev, dosent Məhəmməd Hüseynov və b. Şuşa fakültəsində öz fəaliyyətlərini davam etdirməyə başladılar.

Xalq Təhsili Nazirliyinin icazəsi ilə fakültədə riyaziyyat, Azərbaycan dili və ədəbiyyatı, tarix, ibtidai təhsilin pedaqogikası və metodikası

[1] Şuşa fakültəsinin filiala çevrilməsi haqqında filialın ilk direktoru, dosent M.Alıcanovun təqdim etdiyi sənədlər.

ixtisasları üzrə pedaqoji kadr hazırlığı davam etdirildi. Nazir Rafiq Feyzullayevin əmri ilə fakültənin strukturunun və ştat cədvəlinin müəyyənləşdirilməsi və əmrə nəzarət Plan-İqtisad idarəsinin rəisi Bəybala Xankişiyevə və Ali təhsil idarəsinin rəisi Misir Mərdanova, fakültənin Əsasnaməsinin hazırlanması ADPİ-nin rektoru professor Səlvər Aslanova həvalə edildi.

## ADPU-NUN ŞUŞA FAKÜLTƏSİNİN FİLİALA ÇEVRİLMƏSİ

Az sonra Şuşa Rayon Partiya Komitəsinin birinci katibi, SSRİ Ali Sovetinin üzvü Vaqif Cəfərov ADPİ-nin Şuşa fakültəsinin filiala çevrilməsi ilə bağlı Azərbaycan SSR Nazirlər Sovetinin sədri Həsən Həsənova məktubla müraciət etdi. Məktubda Şuşa fakültəsinin təşkili üçün zəruri olan tədbirlərin həyata keçirildiyi bildirilir və Şuşa fakültəsinin ADPİ-nin filialına çevrilməsinə kömək göstərilməsi xahiş olunurdu. Məktubda yazılırdı: Qarabağa Xalq Yardımı Komitəsinin vəsaiti ilə 7 mərtəbəli yataqxananın və əlavə tədris korpusunun tikintisi planlaşdırılır. Şuşa fakültəsində riyaziyyat, Azərbaycan dili və ədəbiyyatı, tarix, ibtidai təhsilin pedaqogikası və metodikası ixtisaslarında 600-dən artıq tələbə təhsil alır. Fakültədə bir neçə tədris laboratoriyası təşkil olunub və müasir avadanlıqlarla təchiz edilib. Yeni fənn kabinetləri yaradılıb. Rektorluq fakültəyə hesablama maşınları verib. 20 min nüsxədən artıq dərslik və dərs vəsaiti alınıb. Fakültədə 7 kafedra var. Kafedralarda 36 professor-müəllim fəaliyyət göstərir ki, onlardan da 3-ü elmlər doktoru, professor, 23-ü elmlər namizədi, dosentdir.

Xalq Təhsili Nazirliyinin 26 aprel 1990-cı il tarixli 48004-1939 16 nömrəli əmri ilə qəbul imtahanlarının Şuşa şəhərində keçirilməsinə icazə verilib. Bu məqsədlə APİ-dən fakültəyə ezam olunan 2 elmlər doktoru, professorun və 5 elmlər namizədi, dosentin iştirakı ilə qəbul komissiyası yaradılıb. 1990/91-ci tədris ilində Şuşa fakültəsinin əyani və qiyabi şöbələrinə Azərbaycan dili və ədəbiyyatı, tarix əlavə sovet hüququ, riyaziyyat, informatika və hesablama texnikasının əsasları, ÜTF və fizika, ibtidai təlim pedaqogikası və metodikası, pedaqogika və psixologiya (məktəbəqədər tərbiyə) ixtisasları üzrə 250 tələbə qəbul olunub.

ADPİ-nin rektorluğunun Şuşa fakültəsinin filiala çevrilməsi ilə bağlı 13-03/265 nömrəli 17 mart 1990-cı il tarixli məktubuna Xalq Təhsili Nazirliyi də müsbət rəy verib.

## PEDAQOJİ İNSTİTUTUN ŞUŞA FİLİALININ TƏŞKİLİ

Edilən müraciətdən 14 ay sonra Nazirlər Sovetinin sədri Həsən Həsənov Şuşa rayon Xalq Deputatları Soveti İcraiyyə Komitəsi və Xalq Təhsili Nazirliyinin təkliflərini nəzərə alaraq Şuşa fakültəsinin əsasında ADPİ-nin Şuşa filialının təşkili haqqında 26 yanvar 1991-ci ildə 4 maddədən ibarət sərəncam imzaladı. Nazirlər Soveti Sədrinin sərəncamına uyğun olaraq 22 fevral 1991-ci ildə Xalq Təhsili Nazirliyi 22 maddədən ibarət 116 nömrəli əmr, 25 mart 1991-ci ildə ADPU-nun rektoru, professor Səlvər Aslanov 3/93 nömrəli əmr imzaladı. İnstitut üzrə verilən əmrə nəzarət tədris işləri üzrə prorektor professor Eldar Abbaszadəyə, qiyabi və axşam şöbələri üzrə prorektor Məlikməmməd Cəbrayılova həvalə edildi.

Xalq təhsili naziri professor Rafiq Feyzullayevin imzaladığı həmin əmrlə Şuşa filialının 14 maddəlik Əsasnaməsi təsdiq olundu. Şuşa fakültəsinin dekanı dosent Mail Alıcanov filialın direktoru vəzifəsinə təyin edildi. Azərbaycan Dövlət Pedaqoji İnstitutunun[2] rektorunun əmri ilə dosent Zəfər Hüseynov tədris və elmi işlər üzrə, Səyyar Əliyev isə inzibati-təsərrüfat işləri üzrə direktor müavinləri təyin edildilər.

1 aprel 1991-ci ildə ADPU-nun rektoru, professor Səlvər Aslanovun imzaladığı 1/183 nömrəli əmrlə filialın strukturu aşağıdakı kimi təsdiq edildi:

[2] 1 aprel 1991-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutu universitetə çevrilib.

Filialda 3 fakültə: ***Tarix-filologiya*** (dekan – dosent Raqub Kərimov); ***Pedaqoji*** (dekan – dosent İslam Həşimov); ***Fizika-riyaziyyat*** (dekan – dosent Nəsib Şəfiyev) yaradıldı.

Filialda aşağıdakı kafedralar fəaliyyət göstərirdi:

1. Ədəbiyyat və onun tədrisi metodikası kafedrası (müdir – professor Kamil Quliyev);
2. Dilçilik və onun tədrisi metodikası kafedrası (müdir – dosent İlhami Cəfərsoylu);
3. Ümumi tarix kafedrası (müdir – dosent Kazım Mirzəyev);
4. SSRİ tarixi kafedrası (müdir – dosent Yusif Fərzəliyev);
5. Ümumi riyaziyyat kafedrası (müdir – dosent Cəfər Zeynalov);
6. Fizika və ÜTF kafedrası (müdir – professor Əbülfət Rüstəmov);
7. Sosial-siyasi elmlər kafedrası (müdir – dosent Yusif Ağayev);
8. Pedaqogika və psixologiya kafedrası (müdir – dosent Mirələm Vəliyev);
9. Bədən tərbiyəsi kafedrası (müdir – b/m İsa Qasımov).

Həmin əmrlə 44 nəfər (30 müəllim, 14 tədris-köməkçi heyət) işə qəbul edildi ki, onlardan da 21-nin elmi dərəcəsi var idi. Filialın inkişafına, tələbə və müəllimlərin sayının artmasına, maddi-texniki bazanın möhkəmlənməsinə, yeni laboratoriya və kabinetlərin yaradılmasına, onların avadanlıqlarla təchiz edilməsinə həm Xalq Təhsili Nazirliyi, həm də ADPU-nun rektorluğu qayğı ilə yanaşırdı.

1991-ci ildə ADPU-nun Şuşa filialına daxil olmaq üçün ərizə verənlərin sayı çox olduğundan 30 nəfər müvəffəq qiymət alsalar da, müsabiqədən keçə bilməyib. 12 avqust 1991-ci il tarixində Azərbaycan KP Şuşa Rayon Komitəsinin birinci katibi, SSRİ Ali Sovetinin üzvü V.Cəfərov xalq təhsili naziri, Sov.İKP Nəzarət-təftiş komissiyasının üzvü, professor R.Feyzullayevə məktubla müraciət edərək müsabiqədən keçməyən həmin tələbələrin tələbə heyətinə daxil edilməsi üçün sərəncam verməyi xahiş etdi. Nazirlik bütün imtahanlardan müvəffəq qiymət alaraq müsabiqədən keçməyən 30 nəfərin (“Pedaqogika və psixologiya” – 6 nəfər, “İbtidai təlim pedaqogikası və metodikası” – 14 nəfər, “Tarix, əlavə sovet hüququ” – 8, “Azərbaycan dili və ədəbiyyatı” – 1, “ÜTF, əlavə fizika” – 1) tələbələr sırasına daxil edilməsinə icazə verdi.

Çətin dövrlər olmasına baxmayaraq kollektiv tədrisin keyfiyyətinin aşağı düşməməsinə çalışırdı. Ermənilərin tez-tez yolu bağlaması, avtobusların düşmən hücumlarına məruz qalması professor-müəllim və tələbə kollektivini ruhdan salmırdı. Əsas çətinlik ondan ibarət idi ki, Bakıdan filial üçün ayrılan avadanlıqlar maşınla Ağdama aparılır, oradan Şuşaya vertolyotla daşınırdı. Müəllimlərin əksəriyyəti günlərlə Ağdam aeroportunda qalmalı olurdu.

## ŞUŞA FİLİALININ İLK ŞƏHİDLƏRİ

Erməni təxribatı, demək olar ki, hər gün genişlənirdi. Erməni qəsbkarlarının açdığı atəş nəticəsində filialın iki müəllimi Böyük Vətən Müharibəsi veteranı Mürşüd Dünyamalıyev və gənc alman dili müəllimi Sara Əliyeva, filialın iki tələbəsi Elsevər və İldırım şəhid oldular. Xeyli tələbə müxtəlif dərəcəli xəsarət aldı. Şuşa filialının fizika-riyaziyyat fakültəsinin qiyabi şöbəsinin Kosalar və Cəmilli kəndlərinin müdafiəsində əsl fədakarlıq və qəhrəmanlıq göstərən tələbəsi Şakir Salahova 8 oktyabr 1992-ci ildə (ölümündən sonra) “Azərbaycanın Milli Qəhrəmanı” adı verildi.

Xocalı faciəsi erməniləri daha da azğınlaşdırmışdı. Növbəti hədəf Qarabağın tacı olan Şuşa şəhəri idi. Şuşa şəhəri Topxana tərəfdən “Alazan” tipli raketlərlə atəşə tutulurdu. Filialın yerləşdiyi bina düşmənin əsas hədəflərindən biri idi.

ADPU-nun Şuşa filialının fəaliyyəti uzun sürmədi. O dövrdə erməni silahlıları azərbaycanlılar yaşayan kəndlərə tez-tez hücum edirdilər. Bir neçə Azərbaycan kəndi ermənilər tərəfindən işğal olunmuşdu. Tələbələrin və müəllimlərin həyatı üçün ciddi təhlükə yaranmışdı. Bütün bunlara baxmayaraq, ADPU-nun Şuşa filialı öz fəaliyyətini davam etdirirdi. Filialın fəaliyyətini genişləndirmək, əlavə olaraq, Şuşada Azərbaycan Neft-Kimya İnstitutunun və Azərbaycan Tibb

Universitetinin filiallarını açmaq nəzərdə tutulsa da, bunları reallaşdırmaq mümkün olmadı. Əksinə, Şuşa filialı şəhərdən çıxarılandan az sonra onun tarixi binası ermənilər tərəfindən yandırıldı. 1992-ci il martın 25-də filialın kollektivi Ağcabədi şəhərindəki 1 nömrəli məktəbin binasına köçürüldü, daha sonra isə 114 nömrəli Texniki Peşə Məktəbinin binasında yerləşdirildi. Respublikada tələbə qəbulunun test üsulu ilə aparılması Şuşa filialının tələbə kontingentinin ildən-ilə azalmasına səbəb oldu.

1994-cü il iyunun 28-də Şuşa filialının rəhbərliyində kadr dəyişikliyi aparıldı. Dosent Ənvər Əhməd filialın direktoru təyin edildi. Filialda üç fakültədə 6 ixtisas üzrə pedaqoji kadr hazırlığı aparılırdı. Tarix-filologiya fakültəsinə dosent Raqub Kərimov, pedaqoji fakültəyə dosent İslam Həşimov, riyaziyyat fakültəsinə 1996-cı ildən baş müəllim Ənvər Quliyev rəhbərlik edirdi. Filialda tədris işləri ilə yanaşı elmi-tədqiqat işlərinə də ciddi fikir verilirdi. Əvvəlki strukturdan fərqli olaraq burada xarici dillər kafedrası təşkil edilmişdi. ADPU-nun rektoru, professor Bəhlul Ağayevin təşəbbüsü ilə ildə iki dəfə ADPU-nun Elmi Əsərlərinə əlavə olaraq filialın əməkdaşlarının əsərlərindən ibarət məqalələr məcmuəsinin nəşri qərara alınmışdı. Filialda tədrisin və elmi işlərin yüksək səviyyədə aparılmasına həm ADPU-nun, həm də digər ali təhsil müəssisələrinin və elmi-tədqiqat institutlarının əməkdaşları cəlb olunmuşdu.

Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin 2000-ci il 13 iyun tarixli 349 nömrəli Fərmanı ilə filialın bazasında Azərbaycan Müəllimlər İnstitutunun Ağcabədi filialı təşkil edildi. Ağcabədi filialı 2015-ci ildən ADPU-nun Ağcabədi filialına çevrilib.

## MƏDƏNİYYƏTİMİZİN PAYTAXTI: ŞUŞA ŞƏHƏRİ

Şuşa şəhəri 1992-ci il mayın 8-dən etibarən düşmən tapdağı altında qalsa da, sahibini gözlədi. Nəhayət, Müzəffər Ali Baş Komandan İlham Əliyevin qətiyyətli iradəsi və Azərbaycan ordusunun qəhrəmanlığı sayəsində işğaldan azad edildi. ***"İyirmi səkkiz il yarım işğal altında olan Şuşa azad edildi! Şuşa indi azaddır! Biz Şuşaya qayıtmışıq! Biz bu tarixi Qələbəni döyüş meydanında qazandıq. 2020-ci il noyabrın 8-i Azərbaycan tarixində əbədi qalacaqdır. Bu tarix əbədi yaşayacaq. Bu, bizim şanlı Qələbəmizin, Zəfərimizin günüdür..."*** [3].

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev Şuşanı Azərbaycan dövlətinin mədəniyyət paytaxtı elan etməklə onun dünyanın ən gözəl şəhərlərindən birinə çevriləcəyini bildirib. Bu gün Şuşa şəhəri beynəlxalq və respublika əhəmiyyətli tədbirlərə ev sahibliyi edir, yenidən qurulur, bərpa edilir.

### İstifadə edilmiş ədəbiyyat


1. İnstitutda Xankəndi günləri // "Gənc müəllimi" qəzeti, 12 aprel 1972.
2. Mərdanov, M. (2011). Azərbaycan təhsil tarixi. II cild. Bakı: Təhsli.
3. Nəcəfov, Ə. (2000). Xankəndi Pedaqoji İnstitutu. Bakı.
4. Prezident İlham Əliyev: 2020-ci il noyabrın 8-i Azərbaycan tarixində əbədi qalacaqdır //https://azertag.az/xeber/Prezident_Ilham_Aliyev_2020_ci_il_noyabrin_8_i_Azerbaycan_tarixinde_ebedi_qalacaqdir.
5. Rüstəmov, F.A. (2021). Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorları Bakı: ADPU.
6. Rüstəmov, F.A. (2021). Azərbaycan Dövlət Pedaqoji Universitetinin professorları. Bakı: ADPU.
7. Rüstəmov, F.A. (2021). Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi (1921-2021-ci illər). I hissə Bakı: ADPU.
8. Şuşa fakültəsinin filiala çevrilməsi haqqında filialın ilk direktoru dosent M.Alıcanovun təqdim etdiyi sənədlər.


[3] https://azertag.az/xeber/Prezident_Ilham_Aliyev_2020_ci_il_noyabrin_8_i_Azerbaycan_tarixinde_ebedi_qalacaqdir

## MƏQALƏ MÜƏLLİFLƏRİ ÜÇÜN TƏLİMAT

▪ Təqdim edilən məqalə orijinal olmalı, əvvəllər hansısa nəşrdə yayımlanmamalıdır.
▪ Məqalənin məzmunu və quruluşu aşağıdakı hissələrdən ibarət olmalıdır:
— problemin qoyuluşu (məqalədə həlli axtarılan məsələ);
— məsələnin həlli üçün mövcud metodoloji yanaşmaların təhlili;
— tədqiqat hissəsi;
— dəlillər sistemi və elmi əsaslandırma;
— tədqiqatın nəticələri;
— istifadə edilmiş ədəbiyyat.
▪ Məqalənin həcmi 40 min simvoldan (və ya 8 min sözdən) artıq olmamalıdır.
▪ Məqalənin birinci səhifəsində (Azərbaycan və İngilis dillərində) aşağıdakı məlumatlar yer alır:
— müəllifin adı, soyadı;
— müəllif haqqında qısa məlumat (elmi dərəcə, vəzifə, iş yeri, e-mail ünvanı, tel. nömrəsi);
— məqalənin adı;
— məqalənin xülasəsi (maksimum 200 söz);
— açar sözlər (5-7 söz).
▪ Məqalənin sonunda istifadə edilmiş ədəbiyyat siyahısı əlifba sırası ilə (əvvəl Azərbaycan dilində, sonra xarici dildə), *APA Citation* formatında aşağıdakı nümunələrə əsasən verilir:
a) Kitablara istinad:
Əliyev, F. Ə., Ağayev, Ş. S. (2011). *Azərbaycanda elmin problemləri və inkişaf perspektivləri.* Bakı, Elm nəşriyyatı, 151 s.
b) Jurnallara istinad:
Mikayılova, Ü. (2019). Azərbaycanda inklüziv təhsil islahatları. *Azərbaycan məktəbi.* №3, səh. 37-48.
c) İnternet səhifələri:
UNESCO (2013). *World Heritage* list. http://whc.unesco.org/en/list
▪ Əlyazmalar Microsoft Word formatında qəbul olunur.
**E-mail:** editor@as-journal.edu.az; info@as-journal.edu.az

---

## INSTRUCTIONS FOR AUTHORS

▪ The submitted manuscripts must be original work that has not been previously published and is not under consideration elsewhere.
▪ All manuscripts must contain the required sections:
— Title, Author information (position, rank, highest academic degree obtained, and contact information);
— Abstract (maximum 200 words);
— Keywords (5-7 words);
— Introduction, Materials and Methods, Results, Discussion, Conclusions;
— References.
▪ A typical paper for this journal should be no more than 8000 words.
▪ References should be prepared according to APA Citation Format.
▪ Accepted file format is: Microsoft Word
**E-mail:** editor@as-journal.edu.az; info@as-journal.edu.az

